**ADİLƏ NƏZƏROVA**

# FƏLSƏFƏ TERMİNLƏRİNİN İZAHLI LÜĞƏTİ

**"Elm və təhsil"**
**Bakı – 2014**

**Azərbaycan Respublikası Nazirlər Kabineti yanında Terminologiya Komissiyasının 27 dekabr 2013-cü il tarixli N:T/7 qərarı ilə nəşr olunur.**

Redaktorlar: *fil.e.d., prof.* **S.A.Sadıqova**
*f.e.d., prof.* **İ.R.Məmmədzadə**

Rəyçilər: *f.e.d.* **F.M.Qurbanov**
*f.e.d., prof.* **İ.B.Kazımov**
*f.ü.f.d.,* **Y.M.Əliyev**

**Nəzərova A.H. Fəlsəfə terminlərinin izahlı lüğəti. Bakı, "Elm və təhsil", 2014, 224 səh.**

Lüğətdə Azərbaycan dilində işlənən fəlsəfi termin və termin-söz birləşmələrinin geniş şəkildə izahı verilmişdir. Lüğət tələbələrin, müəllimlərin, tədqiqatçıların tərcüməçilərin və fəlsəfə ilə maraqlanan oxucu kütləsinin istifadəsi üçün nəzərdə tutulmuşdur.

$\frac{4602000000}{N098-2014}$ qrifli nəşr

# GİRİŞ

Elmin bütün sahələrində çalışan tədqiqatçıların qarşılaşdıqları çətinlikləri aradan qaldırmaq, zəruri ehtiyaclarını təmin etmək məq-sədilə elmi bazanı (termin, məfhum anlayışları əhatə edən) özündə əks etdirə bilən lüğətlərin ana dilində işlənib hazırlanması zərurəti yaranmışdır. Bu nəzərə alınaraq tərtib olunan "Fəlsəfə terminlərinin izahlı lüğətin"də fəlsəfədə istifadə olunan terminlər toplanmış və onların ana dilində izahı verilmişdir. Lüğətə fəlsəfə ilə bağlı 2000 termin və termin-söz birləşməsı daxil edilmiş, terminlər, termin söz birləşmələri lüğətçilik işində müəyyənləşdirilmiş meyar və prinsiplər əsasında verilmiş və aşağıdakı qanunauyğunluqlar gözlənilmişdir:

1. Terminlərin Azərbaycan dilində dəqiq, konkret izahı verilmişdir;
2. Terminlər beynəlmiləl mahiyyətlidirsə elə həmin terminin özü də saxlanılmış və izahı verilmişdir;
3. Dublet terminlərdən yalnız anlayışın məzmununu daha dəqiq ifadə edənlər seçilmiş və izah edilmişdir.

Lüğətdən aydın olur ki, Azərbaycan dilində fəlsəfə ilə bağlı ter-minoloji sistem formalaşmışdır. Bu nəzərə alınaraq yeni anlayışla-rın ifadəsi üçün alınma sözlərdən çox sözseçmə prinsipinə – dilin lüğət tərkibində işlənən, onların qarşılığını dəqiq ifadə edən termin-lərə üstünlük verilmişdir. Müsbət haldır ki, lüğətdə terminlərin geniş, dəqiq izahı verilmişdir. Terminlərin

izahı elə qurulmuşdur ki, təsnifat nəticəsində onlar arasında yaranmış əlaqə itməsin. Elmin sistemli şəkildə araşdırılması bu sahə ilə bağlı terminologiyanın inkişafına da təkan vermişdir. Bu inkişafla bağlı mütəxəssislər və elmi-tədqiqatla məşğul olan tədqiqatçıların araşdırmaları dil bazasının genişlən-məsinə, yeni terminlərin, anlayışların yaranmasına səbəb olur. Fəlsəfə elminin geniş tədqiqi ilə bağlı (ədəbiyyatlarda hə-min sahədəki vəziyyəti əks etdirən) yeni terminlər və sözlər dinamik inkişafdadır. Lüğətə bu sahədə müasir biliklər əsasında forma-laşmış terminlər daxil edilmişdir. Uzun çalışmalardan sonra araya-ərsəyə gələn bu lüğətin özündən əvvəlkilərdən əsaslı fərqi ondan ibarətdir ki, terminlərin mənası və mahiyyəti açıqlanmaqla yanaşı, dildəki inkişaf formaları və dəyişiklikləri, eləcə də hansı dilə məxsus olmaları və digər dillərdəki ekvivalentləri də qeyd edilmiş və ətraflı izah edilmişdir. Lüğətdə qeyd olunan ərəb və fars terminlərinin ətraflı izahı həm də ali məktəb tələbələrinin, müəllimlərin, mətbuat işçilərinin də qabaqkı dövrlərə məxsus mənzum parça, yaxud mətnləri oxuyarkən də köməyinə gələ bilər. Belə ki, müasir dövrdə M.Füzulinin “Hədiqətu-s Süəada” əsə-rinin dilini başa düşmək heç də asan deyil. Yaxud Bəhmənyarın hər hansı bir əsərindən dilimizə tərcümə etmək müəyyən çətinliklər doğurur. Çünki lüğətlərdə onların fəlsəfi anlamları deyil, daha çox işlək müasir mənaları verilir. Bir örnəyə nəzər salaq; “Furqan” sözünə lüğətdən anlam tapmaq istəsək, “ayırıcı, fərqləndirici” sözlərini taparıq. Halbuki “furqan” dini – fəlsəfi ədəbiyyatda Quran-i Kərimin adıdır.

İlkin fəlsəfi dünyagörüşü səciyyələndirən anlayışların yaranması müasir türk dillərinin əsasında dayanan qədim oğuz dilidir. Belə ki, bu dövrdə yazılı ədəbi dilin inkişafına qədərki həyatın müxtəlif sahələri ilə əlaqədar yeni yaranan sözlərin şifahi olaraq əmələ gəlməsi prosesi başladı. Bu dövrdəki fəlsəfi terminləri qədim türk yazılı abidələrinin dillərində keçən və dünyagörüşü və ətraf mühiti ehtiva edən sözlər təşkil edirdi. Orta əsrlərdən etibarən isə dil ərəb mənşəli sözlərin böyük təsirinə məruz qalmağa başladı. Bu dövr Azərbaycan dilinin inkişaf tarixində uzun bir prosesi əhatə edir.

Təbii ki, müxtəlif sahələrdə terminlərin formalaşması və inkişafı xalqın həyat tərzi, ictimai-siyasi mühitlə bilavasitə əlaqədardır. Azər-baycanı rus işğalı dövrü ərzində ictimai həyatın demək olar ki, bütün sahələrində işlətdiyimiz dil üslublarına rus və avropa mənşəli sözlərin böyük axını başladı. Ərəb dilindəki fəlsəfi terminologiyanın böyük bir qisminin yerini artıq məhz bu dildəki ifadələr alırdı. Lüğətdən ixtisasçılar, tələbə və müəllimlər, doktorantlar, tərcüməçi-lər, eləcə də fəlsəfə ilə məşğul olan və ya maraqlanan şəxslər istifadə edə bilərlər.

Sizə təqdim olunan bu lüğət günümüzün aktuallığından qaynaqlanaraq bilavasitə bu sahədə mövcud olan terminləri toplayıb izahını verməklə ixtisas sahibi olan mütəxəssislərin o cümlədən fəlsəfi əsərləri oxuyarkən ortaya çıxan çətinlikləri mümkün qədər qarşısını almaq məqsədi daşıyır.

**Terminologiya Komissiyasının sədr müavini,**
**filologiya elmləri doktoru, professor Sayalı Sadıqova**

## QISALTMALAR VƏ İŞARƏLƏRİN ŞƏRHİ

? – sözün altından çəkilən xətt onun normal səslənməsindən iki dəfə artıq uzun tələffüz ediləcəyini bildirmək üçündür. "Ayna" və "arif" sözlərində birinci a hərfinin tələffüzü kimi.

Pref. – prefiks, sözlərin əvvəlinə artırılan şəkilçilərdir.

Suf. – sözlərin sonuna artırılan şəkilçilərdir.

Alm. – alman dili

Ing. – ingilis dili

Ru. – rus dili

Az. – azərbaycan dili

əs.tr. – əski türkcə, bəzi hallarda Azərbaycanda mövcud olan əski əlifba ilə eyni olur.

Os.tr. – osmanlı türkcəsi

ər. – ərəb dili

far. – fars dili

Fr. – fransız dili

Yun. – yunan dili

Ru. – rus dili

Müən. – müənnəs, ərəb dilində qadın cinsinə aid olan sözlər. Ərəb dilində qadın cinsinə aid olan sözləri kişi cinsinə aid olanlardan fərqləndirmək üçün sözlərin sonuna "ətun" şəkilçisi artırılırdı. Misal üçün "cəmiun", "cəmiatun. Yalnız bir çox halda kişi cinsində olan sözə müənnəslik bildirən şəkilçi artırdıqda sözün mənası da dəyişir.

Müz. - ərəb dilində kişi cinsinə aid sözlər. Bu səzlərin sonu adətən təmərbutə (ətun) hissəciyi ilə qurtarmır.

## A

**ABSURD** [alm. = ing. Absurd; fr. Absurde; osm. tr. abes; ər. عبس] – avropa mənşəli bu kəlmə dilimzə bizim gündəlik həyatımızda vərdiş etdiyimiz və düzgün təfəkkür tərzinin əsasını təşkil edən məntiqin qaydalarının əksinə çıxan, onlara əhəmiyyət verməyən, aralarında məntiqi əlaqənin pozulması kimi tərcümə edilir. Absurd və absurdluq təfəkkürdə və reallıqda mövcuddur. İnsan bəzən real həyatda müşahidə etdiyi hər hansı bir hadisəni, yaxud şeyi məntiqi cəhətdən izah etməkdə çətinlik çəkir və bu ona absurd – qeyri məntiqi kimi görünür. Lakin insana bəzən absurd təzhürü bağışlayan, onun məntiqi analizindən kənarda qalan şey, hal və ya hadisələrə qeyri – həqiqi anlamı yükləmək olmaz. Kəlmə dilimizdə özünün orijinal orfoepik formasını qorumuşdur.

**ABA** – dilimizin daha qədim kəlmələrindəndir. Bəzi türk dillərində hələ də işlənməkdədir. “Hörmətəlayiq adam” deməkdir. Aba kəlməsi qədim türk dillərində çox işlənir və müxtəlif mənaları ifadə edirdi. “Ana”, “abla” və “baba” mənasında da işlədilmişdir..

**ABİ -** əski türk dillərində “can, ruh” mənasını ifadə edərdi, bundan başqa məcazi mənada “soyuqluq” mənasına da gəlirdi. Farscadaki *ab+i* sözü ilə eyniləşdirmək olmaz. Müasir türkcədə isə abi sözü ağabəy sözünün qısaldılmış formasında böyük qardaşa və özündən böyüklərə xitabən işlədilir.

**ABIZ** - əski türkcədə ruhlarla bağlı işlənirdi, “mənəvi, ruhi” mənalarını ifadə edir.

**ABSTRAKSİYA** – [ing. Abstraction; ru. Абстрактный; lat. Abstractio – ayırma, təcridetmə; ər. تجريد] – mücərrədlik. Elmi tədqiqat metodudur. Obyektiv aləmi dərk etməyə istiqamətlənmişdir.

**ABSTRAKT** [lat. Abstractio – mücərrəd; ər. مجرد] tamın bir tərəfi, birtərəfli, sadə, inkişaf etməmiş olan hissəsi. Dilimizdə işlək ifadə kimi, ərəbcədən keçmə mücərrəd ifadəsi də mövcuddur.

**AÇIĞ** – oğuz mənşəlidir. İntiqam, kin, qərəz, istirab, ələm və s. mənaları vardır. Bəzi yerlərdə “acıh” yaxud “açuv” kimi də keçmişdir. Əski türkcədə ələm, əziyyət anlamlarında keçər. Misal üçün Orhon Yenisey yazılı abidələrində “iltin kantın açığ bolur” – ifadəsi mövcuddur.

**AÇIQLAMA** – [fr. ing. explication; lat. explicatio]. Müasir dilimizdə çox işlənir, türkcə kəlmədir. Məna olaraq izah, şərh, yaxud hər hansı bir hadisəni, bir halı vəziyyəti həll etdikdən sonra onun detalları ilə olan bağı və əlaqələri ortaya çıxarmaq şərtilə deyilən fikirlər, yaxud aydınlatmağa deyilir. Bir şeyin mahiyyətinin dəlilini aşkar edib ortaya çıxarmaqdır. Bəzən anlaşılmaz bir vəziyyətin səbəb və şəraitini izah etmək üçün açıqlamalara ehtiyac duyulur.

**ACİVİKA** – kəlmə etibarı ilə hind mənşəlidir. Ruhun yaşadığını irəli sürən qeyri-ortodoksal qədim hind təlimlərindəndir.

**ACUN** – əski türkcədə çox işlənənən kəlmələrdəndir. “Dünya”, “yer üzü” mənalarına gəlir. *Acun* sözünün daha müasiri

"kürrey-i ərz" sözü də işlənirdi. Bu söz acun sözünə ekvivalentdir və ərəbcədən keçən birləşmədir.

**AD [**ing. Name; ər. إسم] – əski türkcədən gəlmədir, hal-hazırda çox işlənən və müxtəlif mənalara gələn sözlərdən biridir. Dilimizdə adlar əşyalara məxsus ən böyük xarakterik xüsusiyyət olub, bilavasitə onun mahiyyətini tərif edir. Adlar vasitəsilə biz canlı və cansız təbiətdə və kainatda olan hər var olanı tanıyır, bilirik. Adlar və sifətlər bütün var olanların ən mühüm xüsusyyətlərini təşkil edir. Doğulduğu zaman adama verilən şəxsi isim. Ad və soyad. Ad qoymaq. Adın nədir? Adını söyləmək və s.

**ADAPTASİYA** – [ing. Adaption; tr. adaptasyon] insanların yeni etnik mühitə uyğunlaşmasına deyilir. Ümumi mənada fəlsəfədə uyğunlaşma, həmahəng olmağa deyilir. Adaptasiya və ya akkomodasiya ən çox biologiyada işlədilir, misal üçün növlərin adaptasiyası.

**ADƏT** [ing. Habit; ər. آدة]– müəyyən etnik birlik daxilində qəbul edilmiş davranış qaydalarıdır. Adətlər və ənənələr hər hansı bir xalqa, topluma, hətta kiçik topluma da aid ola bilər. Adətlər bu sosial birliklərin yüz, hətta min illərdən süzülüb gələn köklərə malikdir.

**ADDİTİV və Qeyri-Additiv** [lat. Additivus – budaq əlavə; hərfən toplama yolu ilə alınan] – tam və onu təşkil edən hissələr [hissə və tam] arasındakı nisbətin tiplərini əks etdirən anlayışlar.

**ADEKVAT** [adäquat; fr. Adèquat; ing. Adequat; lat. Adaequatus; osm. tr. mutabık; ər. مطابق] – bir-birinə uyan, uyğun gələn, həmahəng olan deməkdir. Latın dilindən avropa dillərinə keçən və dilimizdə də çox rastlanan bu kəlməyə bərabər bölün-

müş, bir-birinə uyğun gələn müəyyən şeyləri yaxud məziyyətləri ifadə etmək üçün işlədilir. Misal üçün adekvat tədbirlər, adekvat fikirlər və s. Adekvatlıq [lat. Adaeguatus – bərabərləşdirilmiş – uyğunluq, bərabərlik ekvivalentlik] mahiyyət etibarı ilə digər qarşılığını tam mənası ilə qarşılayan, ehtiva edən düşüncə tərzidir.

**AĞIL** [alm. Vernunuft; fr. Raison; ing. Rèason; lat. Ratio; osm. tr. akıl; tr. Us; ər. ألعقل] [intellekt] [lat. Intellectus – anlama, başa düşmə, dərrakə] – hissiyyatın qarşılığı olaraq düşünmə, anlamaq, dərk etmək qabiliyyəti arasında məcburi əlaqələr qurmaq qabiliyyəti. Ağıl insanın ən yüksək təfəkkür qabiliyyəti hesab edilir və insanın məhz insan olma xüsusiyyətini özündə təcəssüm etdirir, onu digər canlılardan fərqləndirir. Ağıl kəlməsi bəzən ərəb dilindən keçmə əql sözü ilə eyniləşdirilir ki, bu da əslində doğrudur, lakin orta əslər Şərq peripatetizmində əqllər ülvi varlıqlar kimi xarakterizə olunrudu. Fəlsəfədə isə yüksək inkişaf etmiş və mürəkkəb differensiya edilmiş beynə malik orqanizmlərin psxi fəalliyyətlərinin xüsusi funksiyası Əql sözü ərəb dilində ə`qələ [عقل] felinin I bab məsdəridir. Bu feldən aqil, məqul və s. kimi sözlər də əmələ gəlmişdir. Ərəb dilindən Azərbaycan türkcəsinə tərcümədə anlamaq, başa düşmək, haqqında fikir yürütmək və s.mənalarla tərcümə edilir..

**AĞRUK** [ağruk] – mənaları çoxdur. Oğuzca kəlmədir. Əşya, şey, yük, ağırlıq anlamları vardır. Aarık – avruk – ağruk – ağurluq – ağırlıq.

**AFFEKT** [alm. Affekt, affektion; fr. = ing. Affection; osm. tr. teessür] – insanın əhvaldan və ehtirasdan (hissdən) fərqli olaraq güclü, coşqun baş verən və nisbətən qısamüddətli olan emosional

həyəcanı, qəzəbi, dəhşəti və s. Affekt kəskin ifadəli hərəkətlərlə (spesifik mimika və əl hərəkətləri) və səs reaksiyaları (ağlama, qışqırıq) ilə müşayiət olunur. Bəzən də, əksinə həyəcandan donub qalma baş verir. Affektin zahiri, xarici ifadə formaları, eləcə də dərinliyi çox cəhətdən insanın fərdi xüsusiyyətlərindən, xüsusilə onun iradəsinin tərbiyə olunmasından, ali sinir fəaliyyətinin tipoloji xüsusiyyətlərindən xeyli dərəcədə asılıdır. Affekt vəziyyətində insan o şeydən mütəəssir olur ki, o, onda həyəcan əmələ gətirir ("şüurun daralması"), nəticədə insanda intellektual proseslərin gedişi pozulur və onun öz davranışı üzərində nəzarəti zəifləyir. Affektin aradan qaldırılması xeyli dərəcədə iradə gücü tələb edir və onun başlanğıc mərhələsində yüngül keçir.

**AKKULTURASİYA** [ing. acculturation]– mədəniyyətlərin qarşılıqlı nüfuzu deməkdir. Bu halda müstəqil mədəniyyətlərin öz əvvəlki modelləri dəyişikliyə məruz qalır.

**AKSİDENSİYA** [lat. Accidens; ər. تصادف ; os. tr. tesadüf] - əşyanın mühümdən, substansional olandan [substansiya] fərqli müvəqqəti, keçici, qeyri mühüm xassəsi. Aksidenisya termini əvəzinə dilimizdə daha çox tarixən ***ərəz*** termini işlənilirdi. Bu anlamda aksidensiya nisbətən, yeni, modern bir termindir və avropa mənşəli hesab olunur.

**AKSİOLOGİYA** – [yun. Axia – dəyər və logos – təlim, söz] – dəyərlər mahiyyətinin fəlsəfi tədqiqi. Aksiologiya termini mədəniyyətşünaslığın və fəlsəfənin ortaq termini kimi götürülməlidir, çünki hər iki elm sahəsi mümkün imkanlarından istifadə edərək bu vəya digər dərəcədə insani dəyərlər sistemini və onun cəmiyyətdəki yerini öyrənir. Məhz bu tədqiqlərin sayəsində

insana, onun gündəlik həyatında var olan yaxud olmayan faydalı, zəruri, yaxud zərərli və qeyri-zəruri olan dəyərlər sistemi öyrənilib, üzə çıxarılmaqdadır.

**AKSİOM** [alm. Axiom; ing. Axiome; yun. Axioma; osm. tr. mütearife; ər. متعارفة – qəbul edilmiş müddəa] – dəlilə, sübuta ehtiyacı olmayan deməkdir. Aksiomlar elə nəzəri ifadələrdir ki, onların doğruluğuna, düzgünlüyünə etibar etməmək mümkün deyil. Fəlsəfədə də hər hansı bir müddəaya və tərifə ehtiyacı olmayan, özlüyündən açıq-aydın olan və digər təsbitlərə dəlil mahiyyəti daşıyan, müəyyən elmi nəzəriyyənin deduktiv quruluşunda isbata ehtiyacı olmayan, lakin həmin nəzəriyyənin digər müddəalarının isbatının əsası kimi qəbul olunan nəzəri təklif.

**AKSİYA** [alm. Aktion, Handlung; fr. Action; ing. Action, activity; ər. فعل] – hərəkət, fəaliyyət. Aksiya elə bir hərəkətdir ki, insanın hər hansı bir xarici səbəblə deyil, birbaşa istəkdən qaynaqlanır. Aksiyaların arxasında müstəqil iradə dayanır. Aksiya kəlməsi müasir sosioloji anlam kimi daha geniş mənalarda işlənməkdədir. İnsanların toplaşaraq hər hansı bir məkanda planlayaraq keçirdikləri kütləvi etiraz nümayişləri ilə eyni mənada da işlədilir.

**AKT** [alm. Akt; fr. Acte; ing. Act; lat. Actus; yun. Energia; ər. عمل osm. tr. fiil, amel]  Hərəkət, iş. Sxolastik fəlsəfədə Aristotelin anergia = reallaşdırma, aktlaşdırma, həyata keçirmə mənaları ilə üst-üstə düşür

**AKTİVİZM** [alm. Aktivismus; fr. Activisme; ing. Activism; ər. فعلية ]- fəallıq, yaxud qətiyyət. İnsanın həyatının və fikirlərinin

əsas reallığının təsirdən, iş və fəaliyyətlərdən ibarət olduğunu önə sürən nəzəriyyə yaxud dünyagörüşü tərzidir. Aktivizm kəlməsinin kökü act-dir. İzm prefiksi sufiksi isə nəzəriyyələrin və müddəaların sonuna artırılan şəkilçidir.

**AKTUAL** [alm. Aktuell; fr. Actual; osm. tr. bilfiil; tr. Güncel; ər. فعليٌّ] - içərisində olduğumuz zaman kəsiyi üçün bir mənası, əhəmiyyəti olan, danışılan anda ortaya çıxan, yaxud da var olan deməkdir. Sözün kökünə hərəkətin tərzini bildir – al şəkilçisi artırılmışdır. Aktual sözü dilimizdə müxtəlif anlamlarda işlənməkdədir. Belə ki, hər hansı bir hal və hərəkətin, yaxud şeyin lazımlılıq, vaciblik dərəcəsini bildirmək üçün işlədilir. Yaxud da həqiqi olan, təsirli olan və ya ola bilən vəziyyətdə olmaq deməkdir.

**AKTUALLAŞDIRMA** [alm. Aktualiserung; fr. Actualisation; ing. Actualizing; lat. Actualis – fəal, təsirli] – anlam olaraq varlığın dəyişkənliyini bildirən məfhumdur. Bu dəyişkənlik əsasən var olan şeyin zərurətini üzə çıxartmaqdan ötrü istifadə edilir.

**AQNOZİA** [alm = fr. Agnosie; ing. Agnosia; osm. tr. fıkdan-i marifet-i hissiyye; ər. فقدان معرفة حسية] – hiss orqanlarında hər hansı bir pozğunluq, yaxud, əksiklik olmamasına rəğmən idrakın olmaması, pozulması. Kəlmə yunan dilindən digər dillərə keçmişdir. Hərfi mənada bilinməyən, məlum olmayan deməkdir. Sokrata görə aqnozia fəlsəfədə sualları cavablamaq üçün əsas istinadgahın olmaması, yaxud hardan başlayacağını bilməməyə deyilir. Söz mənşəcə yunan sözüdür. Bizim dilimizə isə rus – avropa kanalı vasitəsilə transfer edilmişdir.

**AQNOSTİSİZM** [alm. Agnostizismus; fr. Agnosticisme; ing. Agnosticism; yun. A-gnoein = bilməmək; a gnostos – bilinməyən; osm. tr. la-edriyye; ər. لاَ أدري; a - inkar və gnosis – bilik] – dünyanın dərk olunması imkanını tamamilə və ya qismən inkar edən təlim.

**ALGU** əski türkcədən tərcümədə bütün, hamı, yaxud cəmiyyət kimi çevirmək mümkündür.

**ALP** sözü bəzi müsbət keyfiyyətləri ehtiva edir. Əski türkcədə çox işlək bir ifadə olmuşdur. Ariflik, cəsarət, igidlik, fədakarlıq, qəhrəmanlıq və s. kimi mənalara gəlir. Qədim türklər toplum, cəmiyyət içərisində öz müsbət keyfiyyətləri ilə fərqlənən insanlara alp deyərdilər. Tarixi mənbələrdən məlum olduğu kimi, Atillanın bir digər adı da Alp ər Tonqa idi. Kitabi Dədə Qorqud datsanlarında da belə bir ifadə mövcud idi: "Hanı dediyim Alp ərənlər, dünya mənim deyənlər".

**ALTERNATİV** [alm.=ing. Alternative; fr. Alternatif; lat. Alter – ikidən biri, osm. tr. şık, terdi; ər. ترديت] – seçimdə müqayisə, iki şey arasında qeyri-könüllü seçim aparmaq. Fəlsəfədə hər hansı biri qəbul olunduğu təqdirdə digəri kənarda qalan, keçərsiz hesab edilən prinsiplərdir. Bir-birini qarşılıqlı istisna edən iki ya daha çox imkandan birini seçmək zərurəti.

**ALQORİTM** [lat. Algoritme – Orta Asiya riaziyyatçısı Məhəmməd əl-Xarəzminin adından götürülmüdür] – eyni tipdən olan bütün məsələlərin həllinə doğru aparan əməliyyatların, bir sıra sistemin müəyyən qaydada yerinə yetirilməsi haqqında dəqiq göstərişdir.

**ALLAH** [ər. آللّٰه; ing. God; ] – dini təsəvvürlərə görə dünyanı yaradan və idarə edən fövqəltəbii qüvvə, hər şeyin səbəbi. Allah adının, kökünün hardan qaynaqlandığı barədə müxtəlif iddialar mövcuddur. Qurana əsaslanan, ərəb dilçilərinə görə Allah adı ilk dəfə müəqəddəs kitabda Allahın özünün məhz özü haqqında işlətdiyi addır. Bundan başqa Allah adının əl-ilah müəyyənlik artiklı və ilah sözünün birləşməsindən əmələ gəldiyini də iddia edənlər vardır. Lakin digər dillərdə bu ad tamam başqa deyimlərdə mövcud olmuşdur. Belə ki, türk dillərində Tenqri sözü türk xalqlarının islam dinini qəbul etməzdən əvvəl işlətdikləri xüsusi ad idi. Rus ilində Бог sözü,  ingilis dilində God sözləri Allah mənasını verməkdədir. Allaha müxtəlif xalqlarda Tanrı, Xuda, Pərvərdigar, Xaliq, Yaradan, Xudavənd, Rəbb və s. kimi adlar aid edilmişdir. İslam dinində Allahı anmaq üçün 99 addan istifadə olunur. Dilçi alimlər bu sözün İlah (əl-ilah və ya əl-laha) kökündən törədiyini güman edirlər. Ərəb dili ilə qohum olan digər dillərdə "Allah" kəlməsi belə səslənir: ibrani dilində "Eloah", arami dilində "Elaha", süryani dilində "Ələhə".

**ALOGİZM** [yun. A-inkar və logos-zəka] – məntiqi təfəkkürün rolunun həqiqətə çatmağın vasitəsi olmasının inkar edilməsi, yaxud kiçildilməsinə alogizm deyilir. Alogizm insan təfəkkürünə, əqli imkanlarına neqativ münasibətin formalaşmasıdır. A yunancada inkar hissəcəyi kimi işlənir. Loqos isə ağıl, zəka deməkdir. Bu bağlamda ortaya çıxan alogizm terminin hərfi mənası əqli, zəkanı inkar edən təfəkkür tərzi deməkdir.

**ALTRUİZM** [lat. Alter - başqa] başqa adamlara təmənnasız xidmət göstərilməsindən, onların xoşbəxtliyi naminə öz şəxsi

mənafeyini qurban verməkdən ibarət əxlaqi prinsip. Başqa sözlə desək, alturizm bir insanın öz həyatını bir digərinə qurban verməsidir. Bəzən insan öz daxili mənliyində belə bir hissə qapılır ki, mənə özümdən heç bir fayda və xeyir olmayacaq, qoy başqaları üçün yaşayım ki, onlara bir faydam, xeyrim toxunsun. Alturistlərə görə insan gərək daxili təlatümünü içində boğsun və başqaları üçün fədakarlıq etsin.

**AMİL** [ər. **عامل**] - Obyektiv və subyektiv şərtlərdən asılı olaraq həlledici ünsür, yaxud hər hansı bir şərtləndirici. Ərəbcədə mövcud olan amələ [**عمل**] felindən əmələ gəlmişdir. Hərfi anlamda amil işi görən, məmul isə görülən iş mənasındadır. Əməli yerinə yetirən, işi görən deməkdir. Amillər müxtəlif ortamlarda işlənir; coğrafi amil, iqtisadi amil və s.

**AMORALİZM** [yun. A-inkar və lat. Moralis – əxlaqi, və ya immoralizm] – əxlaqsızlıq, əxlaqdan kənar davranış tərzi deməkdir. Fəlsəfi anlamda isə hər cür əxlaqın inkarı, əxlaq qanunlarından imtina, “xeyir və şərin fövqündə durmağa cəhd” olunmasıdır.

**ANTİNOMİYA** [alm.=fr. Antinomie; ing. Antinomy; yun. Antinomia; es.tr. tesavi-i nakizeyn; tr. çatışkı; ər. ناقضين تثاو] – İki qanun və ya qayda arasındakı təzad, qanunların, qaydaların, prinsiplərin bir-birinə tərs düşməsi. Yunan mənşəli kəlmədir. Kantda 4 növ antinomiya var idi: 1. Kainat və qalaktika zaman baxımından əbədi deyil, antitez – əbədidir. 2. Hər şeyin özlüyündən ibarət olduğu son, saf hissələr mövcuddur, antitez – yoxdur. 3. Kainatda müstəqil olaraq bir özbaşınalıq mövcuddur, yox-

dur – hər şey təbiətin qanunları daxilində hərəkət edər. 4. Kainatın səbəbi olan vacib bir varlıq vardır, belə bir varlıq yoxdur.

**ANALİZ və SİNTEZ** [alm.=fr. Analyse; ing. Analysis; osm. tr. tahlil; yun. Analysis – synthesis; ər. تحليل] Analiz elə bir prosesin məcmusudur ki, tamı hissələrinə bölüb ayırma, yəni ən ümumi mənada bütövün fikrən, yaxud faktik olarak tərkib hissələrinə bölünməsi və bütövün tərkib hissələrinin birləşib bütövü əmələ gətirməsi prosesləri. Yunan mənşəlidir. Yunancada fəlsəfi aspektdə analiz parçalama, ayırma, sintez isə birləşdirmə, bütövləşdirmə deməkdir. Sintez isə [yun. synthesis – birləşmə] həm birşeyi və ya hadisəni küll halında, onu təşkiledən hissələri arasındakı qarşılıqlı əlaqə vəvəhdəti daxilində tədqiq etmə üsulu ya da bəsit maddə və ya elementləri birləşdirmə yolu ilə mürək-kəb kimyəvi birləşmələr alma.

**ANALİTİK** [alm. Analityk, fr. Analytique. Ing. Analytic. Yun. analytike]- 1. Aristoteldə formal məntiqlə eyni mənada işlədilir. // birinci analitiklər, ikinci analitiklər və s. XX əsr fəlsəfəsində cərəyandır, mahiyyət etibarı ilə fəlsəfənin ənənəvi qrupları, istiqamətləri, həmçinin problemlərin məzmununun aydınlaşdırılmasını dilin təhlilində görən ayrı-ayrı filosofları birləşdirir. Müasir dönəmdə analitik informasiya termini daha çox işlədilir. Analitik informasiya daha ətraflı, izahlı xəbər deməkdir.

**ANALOQ** [alm. Analog; fr. Analogue; ing. Analogus; yun. Analogos – uyğunluq, oxşarlıq, loqosa uyğun olan; osm. tr. mümasil; مماسل] – idrak nəzəriyyəsi terminidir. Hərfi mənada bənzəyən, oxşar olan deməkdir. Yunan dilindən alınmışdır. Aristotelə görə müxtəlif şeylərə uyğunlaşa bilib eyni mənada

onun əvəzinə də keçərli olan termindir. Misal üçün yaxşı hava yaxud yaxşı əşya və s. Digər mənada isə bir terminin bir başqasına olan nisbətinin, bir üçüncünün dördüncüyə olan nisbəti ilə eyni əlaqədə olmasına deyilir. Aralarında, xüsusilə də təsirlərində oxşarlıq olan [az və ya çox] iki mənalı sözlər.

**ANALOGİYA** [Alm., fr. Analogie; ing. Analogy; yun. Analogia – uyğunluq; osm. tr. temsil; ər. **تمثيل**] – eyniyyət təşkil etməyən obyektlərin bəzi cəhətlərdən keyfiyyətcə, münasibətcə oxşarlığı deməkdir. Hərfi mənada bənzərlik mənasını verir.

**ANARXİZM** [yun. Anarchia – rəhbərsizlik, hakimiyyətsizlik] – hərc-mərclik, başıpozuqluq, kütlənin nəzarətindən kənar, demokratizm prinsiplərinə uymayan hərəkətlər. Hər cür hakimiyyətə və dövlətə düşməncəsinə yanaşan, xırda xüsusi mülkiyyətin mənafeyini və xırda kəndli təsərrüfatını cəmiyyətin iri istehsala əsaslanan tərəqqisinə qarşı xırda burjua ictimai-siyasi cərəyanıdır. Anarxiya hər hansı bir kiçik sosial cəmiyyətdə də ola bilər.

**ANİMİZM** [alm. Aimismus; fr. Animismè; ing. Animism; lat. Animismus = anima – ruh; osm. tr. ervahiye; tr. Canlıcılık; ər. **أرواحية**] – ruhlardan qaynaqlanan hal və ya hərəkətlərin varlığını önə sürən dünyagörüşü. Şamanist dini təlimlərdə mövcuddur. Olan hadisələrin, baş verənlərin ruhlar aləminə bağlı olan qüdrətdən qaynaqlandığını, bilavasitə ruhlarla əlaqələndirldiyi dini təsəvvür. Yaxud da tək və eyni ruhun təfəkkür və təbii həyatımızın qaynağı olduğunu irəli sürən görüş. Animizm bəzən uşaqlarda maddi və cansız əşyaları canlı göstərə bilmək

bacarığına da deyilir. Guya ruhlar insanların, heyvanların həyatına, ətraf aləmin predmetinə və hadisələrinə təsir göstərir.

**ANLAM** [türk. Alm. Bedeutung, sinn; fr. Sens, signification; ər. **معنى** , osm. tr. mana] – məna, sözün mənası. Bir sözün, kəlmənin, təyin etdiyi, düşündürdüyü şeydir. Yaxud gerçəkliyin mənimsənilməsini şüura xas olan və predmetin mənaca məzmununun açılmasını və yenidən canlandırılmasını ifadə edən forması. Türkcədir, dilimizdə daha çox bu terminin ərəbcə versiyası olan məna sözündən istifadə edirik.

**ANLAMA** [alm. Verstehen; fr. Verstehen; os. tr. idrak; ər. درك] **-** Anlayış idrakın, dilin tətbiqi ilə bağlı pilləsində aləmin iniaks formalarından biri, predmet və hadisələri ümumiləşdirməyin forması. Anlama və anlamlardan çıxarılan mənalar həm məcazi, həm də həqiqi ola bilər. Dilçilər bəzən anlamanın tərifini belər verirlər: "Ağlımıza gələn ilk mənadır". Anlamanın vasitəçiliyi sadəcə sözlərlə olmur, hiss üzvləri ilə, əqli qabiliyyətlə də mümkündür.

**ANTAQONİST** [ru. Антогонист; yun. Antagonistes – düşmən] ictimai inkişaf ziddiyyətlərinin keyfiyyətcə müxtəlif tipləri**. Antoqonizm** isə bir-birinə tam ziddiyət deməkdir. Məsələn, fəhlə sinifi ilə burjuaziyanın münasibəti, ya da liberalizm ilə totalitarizmin münasibəti.

**ANTROPOMORFİZM** [alm. Anthropomorprhismus; fr. Anthropomorphisme; ing. Anthropomorphism; yun. Anthropos – insan, morphe – forma; osm. tr. müşebbihe; ər. **مشبهة**] – insane xüsusiyətləri başqa bir varlığa, xüusilə də Tanrıya aid edilməsi.

**ANTROPOLOGİYA** [alm. Anthropologie; fr. Anthropogie; ing. Anthropology; yun. Anthropos – insan, logos – elm; osm. tr. beşeriyet; ər. إنسأنية] – canlı varlıq olaraq insanı və onun tarixin müxtəlif ictimai iqtisadi formasiyalarında inkişaf tarixini araşdıran təbiət elmidir. Fəlsəfədə mövzusu sırf insan olan elmdir. Konkret həyatı və həqiqətdəki yeri baxımından insanın özü və özünün quruluşu haqqında fəlsəfi elmi təlimdir.

**ANTİK** e.ə. VII əsrin sonundan qədim yunan quldarlıq cəmiyyətində, e. ə. II əsrdən başlayaraq eramızın VI əsrinin əvvəllərinədək Qədim Roma quldarlıq cəmiyyətində inkişaf etdirilmiş fəlsəfi təlimlərin məcmusu. "Antik fəlsəfə" anlayışı altında Qədim Yunanıstanda və Qədim Romada yaranan fəlsəfə nəzərdə tutulur, bu səbəbdən bu ölkələrin fəlsəfəsi aid olduqları bölgələrinin adı ilə deyil məhz bu terminlə ifadə edilirdi. Fəlsəfədə antik dövr təxmini olaraq er.əv. VII və b.er. VI əsrlərini əhatə edir. Termin olaraq isə yunancaya məxsusdur, lakin avropada isə adətə bu söz *ancient* olaraq məlumdur.

**ANTİLOGİZM** [yun. Anti - əksinə, logos – zəka] məntiqin düsturu olub qəti sillogizmin mühakimələrinin onun nəticəsinin inkarı ilə bir araya gəlməməsini ifadə edir. ***Anti*** şəkilçisi dilimizdə mövcud olan ön çəkilçilərdən hesab olunur. Azərbaycan dilində ***na, bi, la, anti, a*** və s. Kəliçilər mövcuddur ki, bunlar da əsasən ya ərəb-fars mənşəli, yaxud da Avropalı mənşəli şəkilçilər olaraq məlumdur. ***Anti*** şəkilçisi sözlərin qarşısında gəldikdə sözə adətən əks anlam verir.

**ANTİNOMİYA** [yun. Antinomia – qanunda ziddiyyət] – mühakimənin gedişində bir-birinə zidd, lakin eyni dərəcədə əsas-

landırılmış hökmün meydana gəlməsi. Misal üçün, Semantik antinomiyalar. Antinomiya anlayışı antik dövrdə meydana gəlmişdir.

**ANTİSİPASİYA** [lat. Anticipo – qabaqcadan duyuram, ürəyimə damır] – qabaqgörənlik, bir şey haqqında qabaqcadan yaranmış təsəvvür. Hadisənin gedişatını qabaqcadan xəbər vermək.

**ANTİTEZİS** [yun.] fəlsəfi məntiqdə inkişaf prosesində əsas müddəanın inkarı; tezisə qarşı qoyulan müddəa. Antitezis Hegel triadasının ünsürlərindən biridir. Bax: triada – tezis, antitezis, sintez. Tezis irəli sürülən müddəadırsa, antitezis bu iddianın qarşısına irəli sürülən fikir, iddiadır.

**ANTROPOGENEZ** [yun. Anthoropos] – insanın ictimai varlıq kimi meydana gəlməsi və inkişafı prosesinə deyilir. Yunancada anthoropos – insan və genesis – mənşə mənalarını ifadə edir.

**ANTROPOLOGIZM** [ing. Antropologism; yun. Anthoropos – insan logos – təlim, söz] materializmdə insanın təbiətin ən yüksək və kamil məhsulu olması haqqında dünyagörüşü forması; bu dünyagörüşünə görə insanı yaxından dərk edib qavraya bilsək elə təbiətdə mövcud olan sirli – soraqlı məsələləri də açıb ortaya qoya bilər, onlardan agah ola bilərik, çünki insanın cismani fəaliyyətinin üzvi vəhdətində təbiətin bütün məhsuldar qüvvələri iştirak edir.

**ANTROPOMORFİZM** [yun. Anthropos – insan, morphe – forma] – insana xas olan xassə və xususiyyətlərin xarici təbiət qüvvələrinə köçürülməsi və bunların uydurma əfsanəvi varlıqlara [allahlara, ruhlara və s.] aid edilməsi. Termin olaraq **antroporfizmə** uyğundur. Ən əski dinlərdən müasir səmavi dinlərə qədər gəlib çatmışdır.

**ANTROPOSOSİOLOGİYA –** antropologiya elminin məlumatlarını təhrif edərək ayrı-ayrı adamların və onların qruplarının sosial vəziyyətlərinin insanın anatomik-fizioloji əlamətləri ilə bilavasitə əlaqəsini müəyyən edən və bu əsasda da ictimai hadisələri nəzərdən keçirən sosioloji nəzəriyyə.

**ANTROPOSOFİYA** [yun. Anthoropos – insan, sophia – müdriklik] – mistik dekadentçilik təlimi, teosofiyanın formalarından biri.

**APORİA** [alm**.** **=** fr**.** Aporie; ing. Aporia; yun. Aporia; a = sız, poros = yol, körpü, çıxış; ər. غير قابل حأل مسألة]. Bir məsələdə ortaya çıxan problemin həllinin tapıla bilməməsi vəziyyəti, çıxış yolunun olmaması. Ümumiyyətlə natiqin mövzunun hansı istiqamətindən getməsi lazım gəldiyini, mövzuya haradan başlanıb harada qurtaracağı, nə deyiləcəyi haqqında yolunu itirdiyi vəziyyətin adı olaraq ya da natiqin nə söyləyəcəyini yaxud nə düşünəcəyini bilmədiyi bir vəziyyətdə müraciət etdiyi, ümumiyyətlə ediləsi şübhə ifadəsi olaraq təyin olunar.

**APATİYA** [yun. Apatheia] – laqeydlik vəziyyəti, müəyyən hərəkətlərə meylin, istəyin olmaması. Çox vaxt ali sinir fəaliyyətinin pozulması nəticəsində olur. Yunan dilindən tərcümədə ehtirasızlıq, hissizlik kimi tərcümə olunur. Apatiya şəxsdə hər hansı bir hadisə nəticəsində ortaya çıxa bilər, yaxud bu duyğusuzluq vəziyyəti onda fitrətən mövcud ola bilər. Psixologiyada çox işlənən bir termin kimi apatiya adətən sinir fəaliyyətinin pozulması olaraq xarakterizə edilir. Stoiklərdə çox rast gələn bir hal olaraq, Şərq dini fəlsəfi baxışları, xüsusilə mütləq sükunətin

insan ruhunun yüksək halı olan nirvana haqqında buddizm və caynizm təlimləri təsir göstərmişdir.

**APEYRON** [yun.apeyron] – əbədi hərəkətdə olan, sonsuz, qeyri-müəyyən, keyfiyyətsiz materiyanı ifadə etmək üçün Anaksimandrın tətbiq etdiyi anlayış. Yunan dilindən Avropa dillərinə keçmişdir, hərfi mənada sonsuz, hüdudsuz deməkdir.

**APODEYTİKA** [yun. Apodeiktikos] – qəti sübut olunan şey, mütləq səhih biliyi ifadə etmək üçün anlayış. Yunan dilindən dilimizə hərfi tərcümədə inandırıcı mənasına uyğun gəlir.

**APOLOGETİKA** [yun. Apologetikos - *ἀπολογία* – müdafiə edən] – teologiyanın bir sahəsi. Termin öz başlanğıcını qədim yunancadan götürmüşdür. Lakin daha sonralar apologetiklər xristianlıqda da mövcud olmuşlar və indi bu termin daha çox xristianlıqda müdafiə mövqeyindən çıxış edənlər kimi bir anlam qazanmışdır.

**APORİYA** [ing. Apory; yun. Aporia] çətin vəziyyət. Yunancadan avropa dillərinə keçmişdir. Çətin həll olunan problemi ifadə etmək üçün qədim yunan fəlsəfəsində işlədilən anlayış anlamını verir.

**APOSTERİORİ** [lat. a posteriori] aprioridən fərqli olaraq, təcrübədən alınmış biliyi ifadə edən termin. "Sonradan gələn" mənasındakı latın dilindən keçmə fəlsəfi anlayış. Tez-tez "sonradan gələn" məlumat mənasında istifadə edilər və təcrübə, hisslərlə əldə edilən məlumatı ifadə edər. Klassik alman filosofu Kantdan sonra məlumat fəlsəfəsindəki təməl anlayışlardan birini meydana gətirır.

**APPERSEPSİYA** [lat. ad-doğru, perseptio qavrayış] – hər bir yeni qavrayışın insanın əvvəlki həyat təcrübəsindən və qavrayış anında onun psixi vəziyyətindən asılılığı.

**APRİORİ** [alm.=fr.=ing. A priori; lat. A priori - əvvəldən, əvvəlcədən olan; osm. tr. kabli] – Təcrübədən asılı olmayan, amma təcrübəylə canlandırılabilən, şüuruna varıla bilən bilik. Apriori bilik təcrübəsindən kənarda qalan biliyin doğru qəbul edilməsidir. Hər cürə təcrübədən əvvəl, yalnız ağıla əsaslanaraq qəbul olunan, əvvəlcədən mənimsənilən, qanunlardan çıxarılan sırf teorik anlamda qəbul edilə bilən. İdealist fəlsəfədə termin, aposterioridən fərqli olaraq təcrübədən əvvəl və təcrübədən asılı olmadan əldə edilən və başlanğıc şüura xas biliyi ifadə edir.

**APROBASİYA** – nəzəri olaraq qurulmuş metodların, hesablamaların, xüsusilədə iqtisadi olaraq proqnozlaşdırılmış modellərin təcrübədə, həqiqi həyatda sınaqdan keçirilməsi. Aprobativ etika [lat. approbatio – bəyənilmə] – əxlaq haqqında idealist nəzəriyyədir.

**ARREQASİYA** – siyasi qərarları qəbul edənlərin qarşılıqlı bərabərliyinin qorunması.

**ARXETİP** [alm. Archetyp; fr. Archètype; ing. Archetyp; yun. Arkhè-typos; osm. tr. enmuzec-i evvel] – hər şeyin ona görə həyata keçirildiyi düşünülən əsas ideya. Mundus archetypus: həqiqət dünyasında hər şeyin onlara görə həyata keçirildiyi ideyalar, ilk prinsiplər dünyası.

**ARI** [Arık] 1- Saf, arı, arınmış 2- irmaq, dərə. Tarix boyu bəzi millətlər və xalqlar öz millətinin saflığı, təmizliyi və qarışıqsızlığı

ideyasını əllərində bayraq tutaraq irqin ariliyi nəzəriyyəsindən mənfəətlərinə uyğun faydalanmışlar.

**ARPA** - əski türkcədə sehr, tilsim, şamanist ənənələrdə qamların oxuduğu dua deməkdir.

**ARVİŞ –** sehr, tilsimli, sirli hal və xüsusiyyətlər, türkcədir.

**ARQUMENT** [alm.=fr.=ing. Argument; lat. Argumentum; osm. tr. delil; ər. دليل; tr. Kanıt] – gətirilən dəlilin əsası. Nəyinsə tərifinin sübutunun əsasında dayanan şey. Hər hansı bir tərifin əsaslandığı yaxud onun doğru və yaxud yalnış olduğunu ortaya qoyan prinsip. Əsası latıncadan götürülmüşdür. Arguere – göstərmək, tanıtmaq, açıqlamaq mənalarını verir. Dilimizdə daha çox ərəbcədən keçmə dəlil ifadəsi işlənir. Misal üçün; Məsələni aydınlaşdırmaq üçün daha əsaslı bir arqument gətir. Yaxud; gətirdiyiniz arqumentlər kifayət etmir, daha açıq bir dəlilə ehtiyac var.

**ASSİMİLASİYA** (ing. assimliation) – qarşılıqlı mənəvi nüfuzetmə. Assimliyasiya müxtəlif elm sahələrində mövcuddur. Belə ki, istər dilçilikdə, istər biologiyada, istərsə də sosiologiyada assimliyasiya aid olduğu elmin xarakterik xüsusiyyətlərinə və tədqiqi metodologiyasına tabe olaraq özünəməxsus anlamlar ifadə edir.

**ASKETİZM** [alm. Askese, asketik; fr. Ascetisme; ing. Ascetism; osm. tr. zühdiyye; yun. Askein den – məşq edirəm] 1. Ümumi olaraq ənənəvi, ayinlərdə təbii fəaliyyətləri, hissi-yyatları imkan olduğu qədər azaltmağa çalışmaq şərtilə özünün və nəfsinin öhdəsindən gəlmə vərdişlərinin aşılanmsı. Asketizmi bəzən dünyəvi olanlardan uzaqlaşmaq kimi də xarakterizə edirlər. Asketik həyat formasını sufizmlə eyniləşdirənlər də vardır.

**ASSOSİASİYA** [ing. Assosiation; lat.associatio – birləşmə; osm. tr. ittifak; ər. إتفاق] – birləşmə, əlaqələnmə və s. Tamın hissələri arasında olan bağllılıq, əlaqələnmə, birləşmə və s. Müasir anlamda assosiasiyalar qruplaşmış birliklər, ittifaqlar, təşkilatlar mənasında işlədilir.

**ASTRONOMİYA** [ing. Astronomy; fr. Astronomi; yun. Astron+nomos;آلنجوم علم] – göy cisimləri, onların sistemləri və kosmik materiyanın başqa formalarının vəziyyəti, hərəkəti, quruluşu və inkişafı haqqında elm. Yunancada astron ulduz, nomos isə qanun, qayda deməkdir. Astronomiya elmi Şərqdə özünəməxsus adla nücum elmi adlandırılmışdır. Nücum hərfi mənada ulduzlar deməkdir. Bu elm qədimdən bəzi xalqlarda tayfalarda mövcud olmuşdur.

**ATARAKSİYA** [alm. Ataraxie; fr. Ataraxie; ing. Ataraxia; yun. Ataraksia; osm. tr. itminan – i nefs; yun. Atarakia – təmkinlilik] – ruhi rahatlıq və sakitlik vəziyyəti, bəzi qədim yunan filosoflarının fikrincə ataraktiv hala mütəfəkkir, dühalar, sufilər nail ola bilir. Xüsusilə də, Stoa fəlsəfəsində insanın davranışları ilə psixoloji təlimin məqsədi, ideyası olaraq ortaya çıxan və mütləq yaxşı olaraq xarakterizə edilən ruhi hüzur, sakinlik, dərdlərdən arınmış olma halı. Ataraktiv vəziyyət günümüzdə daha çox sufilərin asketik hallarına bənzəyir. Belə ki, bütün bu hal və məziyyətlər əslində insan ruhunun maddi olanlardan arınaraq onlardan üstün olan, onların fövqündə dayanan ruhi halları kəsb etmədir. Yalnız bu formada insan özünün daxili məninə təskinlik verir və maddi gərginliklərdən və sıxıntılardan xilas olur. Bu və ya bu qəbildən olan təcrübə halları, psixoloji təlimlər həm islam-

da, həm digər səmavi dinlərdə, eləcə də qeyri-səmavi dinlərdə də müxtəlif dövrlərdə fərqli formalarda təzahür etmişdir.

**ATEİZM** [alm. Atheismus; fr. Ethèisme; ing. Atheism; yun. A-theos; tr. Tanrıtanımazçılık; ər. إلهاد] – Tanrını rədd etmək, təbiətdə və kainatda Tanrının rolunu danmaq. Sovet hakimiyyəti dövründə Sovet İttifaqına daxil olan ölkələrdə və kommunizmin hakim olduğu dövlətlərdə Marksizm – Leninizm fəlsəfəsi əsasında elmi ateizm geniş tədris edilirdi. Elmi ateizm Tanrının varlığının təhrif edilməsi ideyasını elmi dəlillər və arqumentlərə dayanaraq əsaslandırırdı. Ərəbcədə isə daha çox ilhad termini işlədilir. Ateizm a – teos – yəni hərfi anlamda Tanrının inkarı deməkdir. Bu cür baxışlar sistemi sadəcə islamdan, xristinalıqdan və yəhudilikdən bizə məlum olan Tanrı anlayışını deyil, hər növ dini iman və etiqadi sistemlərdə Tanrı və Tanrı adına olan hər varlığı inkar edir.

**ATƏŞGAH** – atəşpərəst məbədi, ibadətgah. Sözün sonuna artırılan atəş+gah şəkilçisi fasrcada yer və məkan bildirir. Misal üçün xanəgah, ibadətgah və s. Atəşgah sözünün özündən də göründüyü kimi bu məbəddə əsas olan od, alov olmuşdur. İndi də dünyanın fərqli yerlərində mövcud olan atəşgahlarda insanlar toplaşaraq oda, alova sitayiş edirdilər. Azərbaycanda da zərdüştlərin qədim sitayiş yerləri olan atəşgahlar tarixi abidələr kimi qorunub saxlanılır.

**ATOM** [alm. Atom; fr. Atome, ing. Yun. A-tomos; osm. tr. cüz-i fərt; ər.ذرّة] – bölünməyən, parçalanmayan. Qədim dövrdən bəri mütəfəkkirləri, filosofları düşündürən əsas məsələlərdən biri də təbiətin ən kiçik bölünməyən parçası, hissəsi olmuşdur. Antik

yunan filosofları bunlara a-tomos [bölünməyən, parçalanmayan] deyirdilər. Daha sonraları atomlar maddənin ən kiçik bölünməz zərrəcikləri kimi xarakterizə edilirdi. Bu ideyanın əsasını qoyan filosof alim isə Jon Dalton olmuşdur. Bu təlim elmdə **atomistika** [alm. Atomismus; fr. Atomisme; ing. Atomism. osm. tr. cüz-i fərdiyyə. ər. جزء فردية] kimi məşhur idi.

**ATRİBUT** [alm.=fr. Attribut; ing. Attribute; osm. tr. sıfat, sıfat-i zatiye; lat. attribuo; ər. صفة زآتية; tr. öznitelik] – qalıcı, əsas xüsusiyyətlər, sifətlər. Söz latın mənşəlidir, hərfi mənada verirəm, bəxş edirəm deməkdir. Müasir anlamda çox işlənir. Misal üçün, dövlətin atributları, təşkilatın atributları və s. Azərbaycan dövlətinin himninin atributlarını onun sözləri və musiqisi təşkil edir. Atributlar elə şeylərdir ki, onlarsız həmin varlıq, şey yaxud predmet nə düşüncədə nə də reallıqda mövcud ola bilməz.

**ATA** – ata, ulu əcdad, bilgə. Əski bir kəlmə olub, qədim oğuz dilindən bu yana işlədilməkdədir. Valideyn mənasında çox işlənir. Lakin fərqli anlamlarda da daşıyır. Misal üçün; ulu, hörmətə layiq insan, dədə, baba mənasında, ad və soyadın bağlandığı əcdad yaxud da bilgə, mütəfəkkir mənalarını verir.

**ATAHAN** – qurucu, böyük. Ata+han sözlərinin kombinasiyasından yaranmışdır. Əski türklərdə atahan deyimi əsasən dövlətin ilk qurucusuna deyilirdi, çünki bəzən dövlət onun adı ilə adlandırılırdı. Misal üçün; Osmanlı dövləti – Osman; Teymurilər Dövləti – Əmir Teymur və s.

**ATALAY**- məşhur olan adam. Bəzi qədim türkcəni araşdıran tədqiqatlarda bu sözün əslində Atillanın adından atilay şəklində törədiyini iddia edənlər var. Hərfi anlamda isə məşhur olmuş,

ortaya çıxmış, öz cəsarəti və şücaətinə görə fərqlənmiş şəxslərə şamil edilirdi.

**ATASAGUN** – ulu həkim. Ata+saqun sözlərinin kombinasiyasından əmələ gəlmişdir. Saqun şamanist təlimlərdə ən yaxşı özünü göstərən fərqlənən qamlar üçün işlədilirdi. Hərfi anlamda ən yaxşı müalicə edən, dərdə dərman edən adam deməkdir.

**AVERROİZM** – Orta əsrlərdə Qərbdə ortaya çıxmış fəlsəfi təlim. Sözün kökündə dayanan Averroes müsəlman aləmində İbn Rüşd kimi tanınır. Orta əsr fəlsəfəsində İbn Rüşdün ideyalarını tədris edən və yayanlara averroistlər adını verirdilər. Qərbin ənənəvi kilsə fəlsəfəsi Orta əsrlər Avropa Universitetlərinə nüfuz edən və tədris edilən averroizmin qarşısını alır, bu təlimin ardıcılını isə lənətləyib yandırırdılar.

**AVESTA** – Zərdüştiliyin müqəddəs kitablar külliyyatı. Bəzi tədqiqatlara görə bu kitab Makedoniyalı İsgəndərin səfəri əsnasında onun tərəfindən yararlı hesab edilməmiş və yandırılmışdır. Tarixçilər Avestanın inək dərilərinə yazıldığını iddia edirlər. Lakin sonrada onun vedalar adlanan müxtəlif parçaları bərpa edilmişdir.

**AVROPASENTRİZM** (ing. Europecentrism; ru. Европасент-ризм) – avropasayağılıq. Sözün kökündən də göründüyü kimi, bu dünyagörüşü formasında Avropa elmi-mədəni məkan olaraq önə çəkilir. Tarixi etibarı ilə daha müasir olan bu təlimdə cəmiyyətdə mövcud olan bütün yaxşı dəyərlərin, elmin, incəsənətin, fəlsəfənin, ədəbiyyatın və s. Avropadan qaynaqlandığı və ya oradan təsirləndiyi qeyd olunur.

**AVTOXTONLUQ (**yun. Autochthon; ru – местный – коренной) – yaxud aborigenlik; bir xalqın, yaxud millətin hər hansı bir yerə, bölgəyə, regiona aid olması, yerli əhali hesab edilməsi.

**AVTONOMİYA** [yun. auto – öz və nomos] – yunancadan digər Avropa dillərinə keçən bu terminin hərfi mənası özünü idarə etmə deməkdir. Termnin ingiliscədən dilimizə bir mənası da *autonomous* - muxtariyyət anlamındadır.

**AVTORİTARIİZM** – Latın dilində təşəbbüscü, müəllif bani yaradıcı və s.mənaları verən avtoritarlıq qeyri-demokratik rejimləri və onlara uyğun olan siyasi şüur formalarını ifadə etmək üçün işlədilir.Avtoritarizm nəzəriyyəsi XIX əsrin başlanğıcında J.de Mentr və L.de Bonald kimi ulturamühafizəkar nəzəriyyəçilər tərəfindən işlənib hazırlanmışdır. (Fransa inqilabına və sosialist hərakatına cavab olaraq ).

**AVTORİTET** [ lat. Autoritas – ləyaqət, qüvvə, hakimiyyət] termin olaraq nüfuz, etibar, səlahiyyət və s. Anlamlar ifadə edir. Misal üçün, *Avtoritet qazanmaq. Avtoritetdən düşmək.* Nüfuzlu adam.

**AZADLIQ** [alm. Freiheit; fr. Libertè; ing. Liberty, freedom; lat. Libertas; osm. tr. hürriyet; ər. حرّيّة] – bağlı olmamaq, kiminsə təsiri altında qalmamaq, məcbur edilməmək, hər növ xarici istəkdən arınmış olmaq. Fəlsəfi anlayış; insanların idrak və zərurətə yiyələnməsi vasitəsi ilə nail olduğu real sərbəstlik. Azadlıq anarxiya və hərcmərclikdən ciddi şəkildə fərqlənir. Azadlığın əsasında demokratizm və humanizm dayanmırsa azadlıq başıpozuqluğa və hərcmərcliyə çevrilir. Dilimizdə azadlıqla

yanaşı hürriyyət terminindən də istifadə edilirdi. Misal üçün; hürr insan = azad insan.

**AVVAM** [اوم] – kütlə, insan təbəqəsi, avamlar. Ərəbcədə avvam adlandırılan bu insan təbəqəsi guya Haqdan xüsusi bilik, işarə, yaxud zəka almamışlar. Bu səbəbdən onlar sözlərin daxilinə nüfuz edə bilmir, onlar ancaq hərfi anlamda qəbul edirlər.

**AYƏ** [آية] – ayə. ərəbcədən hərfi mənası "işarə", "əlamət" deməkdir. Qurani Kərimin surələri təşkil edən cümlələrə ayə deyilir. Allahın varlığını və peyğəmbərlərin peyğəmbərliyini təsdiq etmək üçün göstərilən möcüzələrə də ayə deyilir.

**ARXETİP** [ing. Archetype; yun. Archetupos] – ideya yaxud ilkin başlanğıc. Antik fəlsəfənin sonlarında timsal, ideya. Yunancada arche – başlanğıc, əvvəl, tupos – forma, nümunə demək idi.

**AFFEKT** [ing. Affect; lat. affectus] – ruhi həyəcan. İnsanın hallardan və ehtirasdan [hissdən] fərqli olaraq güclü, gərgin olaraq baş verən və nisbətən qısa müddətli olan emosional həyəcanı, qəzəbi, dəhşəti və s. Affekt kəskin ifadəli hərəkətlərlə [spesifik mimika və əl hərəkətləri] və səs reaksiyaları [ağlama, qışqırıq] ilə də müşayiət olunur.

**AYAN-**ı s**abitə** [أعْيان ثابتة] – sabit olan varlıqlar. Əyan sözünün kökündə dayanan eyn [عين] kəlməsinin hərfi mənaları göz, nəzər, bulaq, mənbə və s. dir. Müsəlman Şərqi fəlsəfəsində zatı mümkün olan varlıqların Allahın elmindəki həqiqətləri əyani sabitələrdir.

**AFFITSİRLƏŞMƏ** [lat. Afficere; es. Tr. Sebebiyet; ər. سببية] – səbəbi olma. Qərb filosofu Kant tərəfindən ortaya çıxarılan və

onun fəlsəfəsində işlək bir söz olan bu termin məna olaraq predmetin hiss üzvlərinə təsir etmə qabiliyyətini ifadə edir.

**AKÇORA** – Yaxşılıq mələyi. Ak və çora sözlərinin birləşməsindən əmələ gəlmişdir. Şamanizmdə daha çox təsadüf olunur. Şamanist adət ənələrdə akçora xeyir gətirən mələk kimi xarakterizə edilirdi.

**AKSİOM** [alm. Axiom; fr. Axiome; ing. Axiom; yun. Axiama. osm. tr. mütearife; ər. ] dəlilə ehtiyac olmadan qəbul edilən müddəadır. Aksiomlar irəli sürülən elə təkliflərdir ki, onların düzgünlüyü, dəqiqliyi müzakirə mövzusu deyil. Aksiomlar adətən məlum həqiqətlər olur. Adətən riyaziyyata hər hansı bir yeni bölmə və ya anlayış daxil edildikdə bu yeni bölmə bir sıra qəbul edilmiş mülahizələr əsasında qurulur. Belə mülahizələr sistem daxilində aksiom adlanır.

**AVAR** – Heybətlilik, inadkarlıq. Əski türkcədə abar şəklində işlənilirdi. Bu sözdən törəyən abartmaq, abartı ifadəsi də mövcuddur. Abartmaq – nəyisə şişirtmək. Mübaliğə etmək deməkdir. Avar adında xalq da mövcuddur.

**AYIRD –** Fərq, müxtəliflik. Dilimizdə hazırda ayırd etmək ifadəsi mövcuddur.

## B

**BACARIQ** [alm. Vernögen; fr. Facultè; ing. Faculty; lat. Facultas; osm. tr. meleke; ər. قابليّة] – insanda var olan bir şeyi edə bilmə gücü, qabiliyyəti. Bacarıq əski türkcədəki beceri sözündən qaynaqlanır.

**BAĞIMSIZ** – Müstəqil. Türk mənşəli qədim sözdür. Bağlı olmayan, özgür, müstəqil deməkdir. Bağı, əlaqəsi olmayan, bağlarından xilas olmuş anlamına gəlir.

**BARIŞ –** Sülh, sükunət və s. anlamlara gəlir. Türk mənşəli qədim sözdür. Varış, gediş, gedişat; Sukunət, sülh; Sərvət, xəzinə mənalarını da verir.

**BAY** – varlıq, zənginlik. Türk mənşəli qədim sözdür. Varlıq, zənginlik, ərlik, üstünlük, bolluq sözlərinin mahiyyətini ifadə edir. Türk adlarının vacib birləşmələrindən başqa sözlərlə istifadə oluna bilən, işlədilən kəlməni tamamlayıb, gücləndirən, həm əvvəlinə, həm də sonuna əlavə olunan ad.

**BƏY –** Əski türkçdə beğ işlədilirdi. Bəy, ərlik, güc, idarəedici yığıcılıq, liderlik, nəcabətlik və s. mənaları verir.

**BENGI**: Türk mənşəli qədim sözdür. Bengü, mengü – sonsuz, sonsuzluq, əbədiyyət, əbədi.

**BİLGƏ**: Türk mənşəli qədim sözdür. Bilgili, filosof, alim, bilgin, ulu kişi deməkdir. Sözün kökü bil-dir. Bilgin isə türk. Elm adamı, filosof, mürdik insan deməkdir.

**BİRLİK** [alm. Einheit; fr. Unitè; ing. Unity; lat. Unitas = unus – bir; osm. tr. vahdet; ər. وحدة]. Çoxluğun birliyi [buna bəzən

kəsrət də deyilir] yaxud da birlik halında olan çoxluq. Özündə çoxluğu və bölünməzliyi də əhatə edən sırf bütün. Birlik müxtəlif formalarda və müxtəlif anlamlarda təzahür edə bilər. Məsələn, məntiqi birlik, fikir birliyi, kateqorial anlamda birlik – vəhdət, transandent-spekulyativ birlik və s. Kəlmə olaraq türk dilinə məxsusdur və müasir Azərbaycan dilində də həm fəlsəfi anlamda, həm də çox işlək söz kimi ittifaq mənasında geniş işlənir. Birlik terminini vəhdət mənasında filosoflar çox işlətmişlər. Varlığının birliyi, yaxud, vəhdəti mənasında İslam mədəni bölgəsi fəlsəfəsində, Plotində hər növ müxtəlifliyi əhatə edən mənasında və Spinozada bütünlük mənasında işlənmişdir.

**BİOLOGİZM** [alm. Biologismus; fr. biologisme]. Həqiqəti tək tərəfli olaraq ancaq bioloji baxımdan tədqiq edən təbii, dialektik həyatın anlamlarını digər real sahələrə də tətbiq edən dünyagörüş.

**BİTİM** – Türk mənşəli qədim sözdür. Qayə, hədəf, ideya deməkdir.

**BOYDA**[ğ] – Türk mənşəli qədim sözdür. Mücərrəd, absurd mənalarını verir.

**BÜYÜ** – Türk mənşəli qədim sözdür. Sehir, gizlinlərdən, qeybi olanlardan xəbərdar olmağa, agah olmağa deyilir.

**BABUVİZM** – XVIII əsrdə Fransada "Bərabərlik Respublikası" – vahid mərkəzdən idarə edilən, vahid, ümummilli kommuna uğrunda aparılan inqilabi hərəkat.

**BAĞ** [Alm. Relation, Beziehung, fr. , ing. Relation; lat. Relatio; ər. علاقة] – bağ, əlaqə. əski türkçədir. Hər hansı bir düşüncə çərçivəsində arxa-arxaya sıralanaraq gələn iki və ya daha

artıq şey arasında var olan birlik, vəhdət, əlaqə, və s.şeylər. Aristotel bağı on kateqoriyadan biri hesab edirdi. Filosofa görə bir başqa şeylə əlaqədə qavranılan şeydir.

**BAZİS və ustqurum –** Hər bir ictimai-iqtisadi formasiyanın struktur ünsürlərini səciyyələndirən kateqoriyalar. Marksizm – Leninizm nəzəriyyəsində geniş şəkildə öz əksini tapmışdır. Marksizmdə siyasi-iqtisadi sistemin əsas elementləridir. Bazis ingiliscədəki basic – əsas, qaynaq sözündən törəmədir.

**BƏRABƏRLİK** [alm. Gleischeit; fr. Ègalitè; fr. Equality; lat. Aequalitas; ər. **مساوات** ; tr. eşitlik] – Eyni zaman kəsiyində eyni xüsusiyyətlərə malik olma. Cəmiyyətdə insanların bərabər vəziyyətdə olduqlarını ifadə edən anlayış, lakin müxtəlif tarixi dövrlərdə və müxtəlif siniflərdə ayrı-ayrı məzmuna malik olur. Buna ictimai bərabərlik deyilir. Bundan başqa siyasi bərabərlik də mövcuddur. Ölkənin idarəsində iştirak etməyə hamının eyni siyasi hüquqa malik olmasına deyilir. İmkan bərabərliyi isə fərdlərə mümkün mərtəbədə özlərini inkişaf etdirmələri yaxud istək və planlarını həyata keçirə bilmələri üçün eyni imkanların təmin edilməsidir.

**BƏRTƏRƏFLİLİK** [alm. Athebuag – ləğv etmə, kənar etmə, qoruyub saxlama]. – kənarlaşdırma, uzaqlaşdırma, aradan götürmək. Hegel fəlsəfəsində geniş işlədilən termindir. Dilimizdə nadirən işlədilən bir kəlmə olaraq daha çox uzaqlaşdırma anlamında işlənir.

**BƏHANƏ** - digər hadisələrin baş verməsi üçün sövqedici təkan kimi çıxış edən xarici, çox vaxt təsadüfi hadisə, vəziyyət.

Fars dilindən keçmə sözü olub dilimizdə geniş işlədilməkdədir. Misal üçün; bəhanə gətirmək və s.

**BƏŞƏRİYYƏT** (ing. Humanity; os. Tr. beşeriyet; tr. insanlık; ər. بشريّة) – insanlıq. Ərəbcədən keçə söz olan bəşəriyyətin həm yer üzündə yaşayan insanların məcmusu mənasında, həm də insanların dünyanın müxtəlif ölkələri, xalqları arasında iqtisadi və digər əlaqələrin ümumiliyinin formalaşması gedişində təşəkkül tapan tarixi birliyi mənasında çıxış edir.

**BİHEVİORİZM** [ing. Behaviour+ism] – düzgün davranış. Müasir psixologiyada geniş yayılmış cərəyanlardan biri. Əxlaqdan qaynaqlanan və əxlaqi davranışları önə çəkən fəlsəfi təlimdir.

**BİLİK** [alm. Erkenntnis; fr. Connaissance; ing. Knowledge, cognition; lat. Cognitio; osm. tr. Marifet, malumat; ər. معرفة, معلومات] – bilinən, məlum olan şey, bilmək fəaliyyətinin yaxud prosesinin nəticəsi. Fəlsəfədə nəyinsə bir şey olaraq qavranılmasıdır və müxtəlif formalarda özünü göstərir. Filosoflar əsrlərdən bəri biliyin – qavranılan şeyin rasional yaxud irrasional olması barəsində iki fərqli görüş üzərində dayanırlar. Rasional şüurla varılan, məntiqi nəticədə hasil olan və maddi cəhətdən sübut edilləndirsə, irrasional isə daha çox insanlarda ruhi-mənəvi hadisələrin nəticəsi olaraq ortaya çıxan məfhumdur. Bilik yaxud məlumat əlaqəsi bilinənlə bilən arasında təzahür edən əlaqəyə, bağa deyirlər. Biliyin meydana gəlməsi isə bilinənin biləndə bilmə fəaliyyətinin ortaya çıxmasından qabaqkı ilk fel, ilkin təsəvvürün, fikrin ortaya çıxmasıdır. Bilik məhsulu isə əldə edilən məlumat – informasiyanın başqasına müxtəlif vasitələrlə ötürülməsidir. Dilimizdə bilik mənasında əvvəllər daha çox mərifət sözü işlənir-

di. Əslində mərifət sözü biılik sözünün ərəf dilindəki ekvivalentidir və *ərəfə* felindən [عرف] törəmişdir. Mərifət sözü onun məsdəridir. Sufi terminologiyasında mərifət əhli birləşməsi də işlənilir. Bundan başqa bilik nəzəriyyəsi [*alm. Erkenntnistheorie; fr. Theorie de la connaissance, gnoseologie, ing. Theory of knowledge, epistemology; osm. tr. marifet nazeriyesi;* نظرية معرفة] ifadəsi də mövcuddur. Bilik problemi [*Alm. Erkenntnisproblem; ər.* المعرفة مشكلة] – bilmənin mahiyyəti, ortaya çıxması və olması ehtimalına aid olan bütün problemlər bütününə deyilir. Bu problem siyasi, ictimai, maddi və ya mənəvi ola bilər. Biliyin qaynağına yaxud da nəticəsinə uyğun olan hər şeyi əhatə edir.

**BUDDİZM** – Etiqad edənlərin sayına görə dünya ən böyük-qeyri-ilahi mənşəli dinlərindən biridir; istəklərdən imtina etmək yolu ilə iztirablardan azad olmağı və “nicat”a – nirvanaya çatmağı təbliğ edən din. Buddizmdə digər səmavi dinlərdə olan xüsusi ayinlərə, rutuellərə bənzəyən müəyyən xüsusiyyətlər mövcuddur. Sözün kökündə dayanan Budda kəlməsi sözü gedən dinlərdə Tanrı rolunu oynayan məbuda verilən addır. Dində inanc sisteminin əsasını Budda təşkil etdiyi üçün din bu cür adlandırılmışdır.

**BURJUAZİYA** [fr. Bourgeoisie – son. Lat. burgus] Bəşəriyyətin inkişaf mərhələlərindən biri olan kapitalizm – ictimai, iqtisadi formasiyalarının əsas siniflərindən biridir. Burjuaziya istehsal vasitələri üzərində mülkiyyətə malik olan təbəqədir. Marksizm – Leninizm fəlsəfəsində burjuaziya və fəhlə sinfi haqqında geniş məlumat verilməkdədir. Latın dilində *burgus* möhkəmləndirilmiş şəhər anlamına gəlir. Sözün kökü buradan əmələ gəlmişdir, və dilimizdə avropa dillərinə uyğun biçimdə səslənməkdədir.

**BÜROKRATİYA** [fr. Bureau, idarə və yun.kratos – hakimiyyət] – bürokratiya, hakim təbəqə. Fransızcada *büro* kəlməsi ilə latıncadakı *kratos* – hakimiyyət, cəmiyyətin təşkilinin elə bir formasıdır ki, onun üçün hakimiyyət orqanlarının kütlələrdən ayrılması, təşkilatın özünün fəaliyyətinin qayda və vəzifələrinin onun rəhbər vəsiləsinin mövqelərinin saxlanılması və möhkəmləndirilməsi məqsədlərinə tabe edilməsi səciyyəvidir.

**BÜTPƏRƏSTLİK** təbiətin cisim və əşyalarını ilahləşdirən, ibtidai dinlərin [animizm, fetişizm, totemizm, şamanizm və s.] zəminində yaranmış dini etiqad. Farscadan dilimizə keçmişdir. Bütə artırılan pərəsət şəkilçisi nəyəsə olan aludəçiliyi bildirir.

## C

**CAİZ** [جائز] – icra edilməsində dini hökmlərə əks olmayan, günah olmayan şeylər**.** Hər hansı bir şeyin, yaxud hərəkətin caiz olması islam dinində ilk növbədə Quranla, sonra hədislərlə, sonra isə müsəlman fəqihlərinin rəylərinə əsasən müəyyən olunur. Caiz sözü dilimizdə daha çox islam fəlsəfəsi mətnlərində işlədilir. Kəlmənin kökündə olan *c<u>ə</u>zə* [جاز] felindən dilimizdə geniş yayılan icazə sözü də əmələ gəlmişdir. Ərəb dilində icazə sözünün feli IV babda *əc<u>ə</u>zə* felidir. İcazə sözü onun məsdəridir. Ərəbcədə müənnəs qadın cinsini bildirən *-ətun* şəkilçisi dilimizə qısa *ə* olaraq keçmişdir [Müqayisə et: ər. icazətun – az. Icazə; ər. idarətun – az. İdarə; ər. işarətun – az. İşarə və s.].

**ÇAĞ** – Əski türkcədir, müxtəlif mənaları vardır. 1-zaman, vaxt; 2- dövr, dövran; 3- su səsi, şırıltı.

**ÇAĞIMDA** – Yaradıcı, xaliq. Qədim oğuz dilindədir.

**ÇAVUŞ** – Bilgi verən, bilgi götürən, bilgi dağıdan [Çav...kökünden], hazırda hərbi rütbə mənasını da bildirmək üçün işlədilir.

**CAĞATAY** – Fövqəlzaman. Çağ+atay. Qədim oğuz dillərində öz çağından, zəmanəsindən üstün olan uzaqgörənə deyilir.

**CƏDƏL elmi** [جدل] – İslam mədəni bölgəsi fəlsəfəsində müsəlman filosoflarının dialektikaya verdiyi addır. Daha ətraflı məlumat üçün bax: **Dilektika**. Dilimizdə cədəl sözü fəlsəfi termindən izafə mabühisə, müzakirə kimi də başa düşülür. Daha çox orta əslərdə bu anlam *cəng-ü cədəl, yaxud cəng-ü cidal* olaraq işlənirdi.

**CƏVVAD [جواد]** – əli açıqlıq etməyi, sədəqə verməyi sevən kəs. Comərdlik, cəsarət və ərdəmlik kimi məziyyətləri özündə ehtiva edir. Dilimizdə bu termindən törəyən bir v ilə yazılan cavad sözü əslində ərəbcədə təşdidlə [hərflərin ikiləşməsi – misal üçün də<u>bb</u>ə, bə<u>ss</u>ə, qa<u>ll</u>ə, mə<u>rr</u>a və s. ] yazılan v hərfinin Azərbaycanda daha əvvəllər mövcud olan əski əlifbalı sistemdə bir ***v*** ilə oxunuşu formasında ortaya çıxmışdır.

**CİLMAYA** – at adı. Əski oğuz dilindədir. Türk mifologiyasına görə əfsanəvi qanadlı atdır.

**CİNS** [alm. Gattung; fr. Genre; ing. Genus; yun. Genos; osm. tr. cins; ər. جنس] – bir – birinə yaxın növlərin əhatə olunduğu birlik. Bəzən isə öz içində növləri olan hər növ, o növlər üçün cinsə çevrilir. Lakin pilləvari nərdivanda ən sonda gələn növ cins ola bilməz. Orqanizmin doğub törəmə prosesilə bilavasitə bağlı olan və orqanizmlərin çoxunda kişi, və ya qadın fərdlərini ayırd etməyə imkan verən əlamətlərin məcmusu, habelə canlı vücudların iki kateqoriyasından (kişi və qadın, erkək və dişi) biri. Kişi cinsi. Qadın cinsi.

**CİHAD** [جهاد]– din uğrunda döyüş səfərbərliyi, fərqli mənalarda işlədilir. Bəzən insanın öz nəfsi ilə mübarizə aparmasına, nəfsin istək və arzularına boyun əyməməsinə də cihad deyilir. Ərəb dilli fəlsəfədə çox işlək bir ifadədir. İslam dininə aid olan bir termin kimi cihadı bəzən terror sözü ilə eyniləşdirirlər, lakin cihad terror deyil, insanları zülmdən qurtarmaqdır. Qanunsuz, silahlı birləşmələr bu ad altında cinayətlər törədərək, dünyada İslam barədə mənfi rəy formalaşdırır.

**CİSİM** [alm. Körper; fr. Corps; ing. Body; lat. Corpus; ər. جسم] - 1. şüur xaricində özbaşına müstəqil olaraq kainatda yer tutan hər hansı bir şey. 2. Fiziki baxımından götürdükdə isə bölünə bilən və yer tutma qabiliyyəti olan maddə. Cisim sözündən törəyən. Cismani isə maddi olan, cismə yaxud bədənə aid olan deməkdir. Dilimizdə işlətdiyimiz cism sözü ərəbcədən bizə keçmədir. جَسَم. felinin [cəsəmə] məsdəridir. Bu feldən törəmə V babda təcəssəmə [تَجَسّمَ] felinin məsdəri olan təcəssüm sözü də işlənir.  Fəzanın müəyyən bir qismini dolduran maddə, materiya, şey; fəzada ayrıca şey. Bərk cisimlər. Maye cisimlər. Cisimlərin düşmə qanunu. Göy cisimləri (planetlər, ulduzlar).

**CÖVHƏR** [alm. Substanz; fr.=ing. Substance; yun. Hypotasis, hypokeimenon – altda var olan; osm. tr. cevher; ər. **جوهرٌ**] – yunan dilində *ausia* – öz mənasında istifadə olunur. Cövhər – dəyişən əşyada əbədi olan, hadisələr və sifətlər özünə yüklənən, bir başqa şeydə və ya bir başqa şeylə deyil də öz-özünə yer alan şeydir. Əsas mahiyyət, Kantın təlimində "özündə şeylər" anlamına uyğun gəlir. Misal üçün *stul* bir formadır, lakin onun əsası *taxtadır*. Formalar və rənglər dəyişə bilər, lakin onun mahiyyəti olan taxta olması faktı əsla dəyişməz. Dəyişkən hallar və xüsusiyyətlərlə müqayisədə qalıcı olan, bir başqa şeylə yaxud da bir başqa şeydə deyil, öz-özülə var olan (fəlsəfi terminologiyaya aiddir). Cövhər kəlməsi ərəb mənşəlidir. Bu söz daha müasir variantda Qərb fəlsəfəsinə istinadla "substansiya" termini ilə ifadə olunur. Şeyin mahiyyəti, onun əsası demək olan cövhər bütün xarakter və xüsusiyyətlərdən uzaq təsəvvür olunur. Ona əlavə olunan forma, tip, xüsusiyyətlər onun təbiətinə bilavasitə aid olmadıqlarına görə

onlara *ərəz* deyilir. Misal üçün taxta şeyin mahiyyəti kimi cövhər, sonradan ona əlavə olunan forma, rəng və s. isə ərəzdir. Digər bir mənada da hər hansı bir üzvi maddənin distillə və s.kimyəvi üsulla ayrılan yığcam məhlulu, şirəsinə də *cövhər* deyilir. Daha ətraflı bax: **Substansiya**.

**CÜZ** [جذ]– parça, hissə. Çoxluğun hissələrindən biri cüzdür. Küll halında olan bir şeyin hissələrindən biri; hissə, qisim, parça. Ümumi mənada isə çoxluğun tərkib hissələrindən biri, yaxud onu təşkil edənlərdən biri deməkdir. Quran-i Kərimin bölünmüş surələrinə də cüz deyilir. Quran otuz cüzdən ibarətdir.

**CÜZİ** [alm. Partikular; fr. Particulier; ing. Particular; lat. Particularis; osm. tr. cüzi; ər. **جذيّ**] – məntiqdə bir növün bütün fərdlərinə az miqdarda olan, çoxluqla müqayisədə az olan, yaxud çoxluğun tamamına deyil, ancaq bir hissəsinə aid olan deməkdir. Cüz sözünün sonuna artırılan -i şəkilçisi ərəbcədən keçmədir. Bu şəkilçisi orijinal versiyasında əslində - iyyun formasındadır. Lakin bu dilimizə uzun səslənən i kimi transfer etmişdir. Bu ərəbcənin orfoepik qaydalarına uyğundur. [müqayisə et: mülki, cüzi, dövri, sətri, hissi və s.]. *Cüzi iradə* [alm. Willensfreiheit; fr. Libre arbitre; ing. Free will; lat. Liberum arbitrium; osm. tr. irade-i cüziye; tr.özgür istenç; ər. جزء إرأدة] – insana məxsus azad iradə. İstəyin azad olması, nədənsə asılı olmaması insanın istək və qərar verə bilmək müstəqilliyi. Din fəlsəfəsində isə Tanrı istəyi [iradeyi külliyyə] qarşısında insanın istəyinin ortaya qoyur. Fəlsəfədə azadlıq kateqoriyası ilə eyni mənaya uyğun gəlir.

**CAYNİZM** Hind fəlsəfəsi və dininin e.ə. təqr. VI əsrdə meydana gəlmiş qeyri-ortodoksal sistemlərindən biri. Caynistlər

Hindistanda xüsusi dini qrup təşkil edirdilər. Adın kökü Hindistandan gəlmədir. Hindistanda ən çox yaşadıqları ərazilər Uttar, Pradeş və Madhyadır. Hazırda caynistlərin sayı təqribən 3 milyona çatır. Caynizm "qalib" mənasında olan Cina və ya "böyük qəhrəman" mənasında olan Mahavira ləqəbli bir şahzadə olan Vardhamana Jinata tərəfindən qurulan dini bir hərəkatdır. Caynizm doktrinası əsasən Tirtankara deyilən keçid edən, keçid tapan və yol göstərən olaraq Mahaviraya sitayişdir. Mahaviranın Nirvanaya çatması caynist təqviminin başlanğıcı olmuşdur. Onun Budda ilə eyni dövrdə yaşadığı üçün inancları və əsərləri arasında oxşarlıqlar vardır.

**CAN** insanı var edən. Əski türkcədən gəlmədir. Ərəb dilli fəlsəfədə bu sözün qarşılığı olaraq hayy yaxud da ruh sözləri işlənir. Bəzən psixika termininin sinonimi kimi işlədilən termin. Fəlsəfə tarixində bu anlayışla insanın idealizmdə xüsusi qeyri-maddi substansiya ilə eyniləşdirilən daxili aləminə baxış ifadə olunmuşdur. Can insanı varlı tutan, diri saxlayandır.

**CƏBƏRİLİK** dini-fəlsəfi təlim. Qurana münasibətdə sifatilərə zidd mövqe tuturdu. Cəbəriliyin tərəfdarları iddia edirdilər ki, Allahın heç bir qədim atributu yoxdur, Quran isə sonradan yaradılmışdır. Cəbəri sözü hərfi anlamda məcburi deməkdir. Cəbərilik dini təlimi Allahı tanıdığı və onu qəbul etdiyi halda, onun atributlarını tanımır. Onlar Quranın vəhy vasitəsi ilə Məhəmməd peyğəmbərə endiyini qəbul etdiyi halda onun Məhəmməd (s.a.s) əsəri olduğunu təsdiq edirlər. Hədisləri isə sonralar yardılmış böyük vəlilərin və övliyaların əsəri hesab edirlər.

**CƏMİYYƏT** [alm. Gesselschaft; fr. Sociètè; ing. Society; lat. Societas; osm. tr. cemiyet; ər. جمعيّة] – şüurlu fərdlərdən və xüsusilə aralarında təşkilatlanma əlaqələri və qarşılıqlı əməllər olan insanlardan ibarət topluluq. Ərəb dilindən keçmişdir, kökü cəmə`a [جمع] felidir, toplaşmaq, cəm olmaq, yığışmaq deməkdir. İnsanların birgə fəaliyyətinin tarixən qərarlaşmış formalarının məcmusu. Dar mənada ümumi, xüsusi və təkcə əlamətlərinin vəhdəti halında götürülmüş konkret cəmiyyət kimi və ayrıca region, ölkə kimi nəzərdən keçirilə bilər. Tarixən müəyyənləşmiş iqtisadi quruluş və ona uyğun üstqurum. İbtidai cəmiyyət. Sosializm cəmiyyəti. Kapitalizm cəmiyyəti. Bir yerə yığışan insanlara və dini terminologiyada məscidə namaz qılmaq üçün bir yerə yığışan insanlara da camaat [جماعة] – deyilir.

**ÇEVRİLMƏ** [alm. Genesis; fr. Devenir, genèse; ing. Becoming, genesis; lat. Fieri; in fiere – var olma; yun. Genesis; osm. tr. sayruret; tekevvün; tr. Oluş; ər. صيرورة] – dəyişmə, dönüşmə prosesi, belə vəziyyətdə bir haldan digər bir hala keçmə, yaxud imkandan reallığa keçid. Daimi olaraq dəyişmə prosesinə də çevrilmə deyilir.

## D

**DAOİZM** ( Taosizm), Çin dilindən: pinyin: Daojia iki ayrı sözün Türkcədəki qarşılığı olaraq istifadə edilməkdədir. Daojiao Çin mədəniyyətində bir dinə işarə edərkən, Daojia isə bir fəlsəfə, düşüncə məktəbini izah edir. Daonun qurduğu təlimə Daosizm deyilirdi. Daoriszm dao və yaxud "yollar" haqqında təlim; e.ə. VI -V əsrlərdə Çində meydana gəlmişdir. Ancaq ikisi də qaynağını Laozinin əsəri Tao Te Chingdən götürmüşdür. Düşüncə məktəbi olaraq Taoizmin qurucusu Laozinin ardından Zhuangzi də bu axının ən əhəmiyyətli nümayəndəsidir. DAO – Çin klassik fəlsəfəsində mühüm kateqoriyalarından biridir onunda mənası yol deməkdir.

**DALAY** - [Talay] Genişlik, ululuq, sonsuzluq məcaz edən, əsl mənası , böyük dəniz, okean. Əski türkcədir.

**DAVAMİYYƏT** [alm. Kontinutiöt; fr. Continuitè; ing. Continuity; lat. Continuitas; osm. tr. temadi; ər. **تمآدي**] – davamlı olaraq sürüb getmək. Daimi olmaq, sürüb getmək. Ayrı-ayrı elementlərdən mütəşəkkil olmayan bir reallıq qurma. Davam sözünə artırılan *iyyət* şəkilçisi ərəbcədə mövcud olan nisbi sifət şəkilçisinin qadın cinsində olan formasıdır. Bu şəkilçi ərəbcədən dilimizə transfer olunan xeyli sözdə mövcuddur [Müqayisə et: *mədəniyyət, bəşəriyyət, qalibiyyət, məğlubiyyət* və s.].

**DAVRANIŞ** [alm. Verhalten; fr. Comportement; ing. Behaviour] – xaricdən müşahidə olunacaq bütün hərəkətlərin cəminə deyilir. Mənşəcə türkcədir.

**DAHİ** [ing. Genius; fr. Génie; far. داهي] – mütəfəkkir, mürdik. Farscadan gəlmədir, xariqülادə ağıl və zəkaya malik olan şəxs. Böyük şəxsiyyətlərə, mürdik və uzaqgörən insanlara, əngin zəkaya malik adamlara verilən addır. Dilimizdə dahicə olan fikir və ideya da *dahiyanə* adlandırılır.

**DAYANQAN** – etibarlı, mətin. Qədim oğuz dillərində, dözümlü, dirənişli, səbatlı şəxslərə verilən addır.

**DEDUKSİYA** [ing. Deduction; lat. deuctio] - əldə etmə, hasil etmə, çıxarma. Latın mənşəlidir. Əsas mühakimə [əqli nəticə] üsullarından və tədqiqat metodlarından biri. Deduksiya öz metodoloji üslubuna görə induksiyadan fərqlənir. İnduksiyanın əksidir, mühakimə prosesində ümumi müddəalardan xüsusi nəticə çıxarmaq, hər hansı bir ümumi fikirdən məntiqi yola çıxmaq, prinsip yaxud təklif ortaya qoymaq.

**DEMİURQ** [yun.demiurgos; osm. tr. San-i Kainat] – hərfən usta, sənətkar, məcazi mənada isə yaradıcı, xaliq. Platonun idealist fəlsəfəsində və neoplatonçuların təlimində dünyanın yaradıcısı, kainatın xaliqi; Allahın sifətlərindən biri.

**DEMOQRAFİYA** demos – xalq, qrafiya – çəkirəm deməkdir. İnsanların təkrar istehsalının qanunauyğunluqlarını öyrənir.

**DEMOKRATİYA** [alm. Demokratie; ing. Democracy; osm. tr. hükümet-i amme; ər. حكومة عامّة; yun. Demos – xalq və kratos – qüvvə, hakimiyyət] – xalqın özü-özünü idarə etməsi, yaxud da onu idarə etməsi üçün xalqın bir nəfəri seçməsi. hakimiyyət

formalarından biri; vətəndaşların azadlıq və hüquq bərabərliyinin tanınması ilə səciyyələnir. **Demokratiya** – yüksək səviyyədə inkişafı təmin etmək nöqteyi-nəzərindən, ən mürəkkəb və effektiv siyasi rejimdir və planetimizdə gündən günə geniş yayılmaqdadır. Məşhur amerikan politoloqu Samuel Xayzinqton qeyd edir ki, XIX əsrin əvvəlində başlamış demokratikləşmənin birinci uzun dalğası 1920-ci ildə demokratiyanın 30 ölkədə qələbəsi ilə nəticələn-mişdir. Sonraki dövrdə avtoritarizmin və faşizmin yaranması 1942-ci ildə demokratik ölkələrin sayının 10-a qədər azalmasına səbəb olmuşdur.

**DEİZM** [alm. Deismus; fr. Dèisme; ing. Deism; lat. Deus – Tanrı;] - Yunan dilindən əmələ gəlmişdir, yunancada Deus – Tanrı; izm isə fəlsəfi təlimlərdə müşahidə olunan son şəkilçidir. Tanrıya inanmaqla birlikdə, müəyyən bir dinin doqmalarını və ideyalarını mənimsəməyən. Tanrının kainatı yaratdıqdan sonra onu öz qaydasına görə işləmək üzrə öz başına buraxdığını önə sürən təlim. Vəhyi ve vəhyin bildirdiyi Allahı ve dini inkar edərək, tək ağıl ile idrak edilən bir Tanrının varlığını qəbul eden fəlsəfi bir görüşdür. Deizm ilk səbəb kimi Allahın mövcudluğunu qəbul edən təlimdir. Deizmə görə bütün varlıqlara həyat verən Tanrıdır. Lakin Tanrı ilkin xəlq edəndir, sonradan yaratdıqlarının işinə qarışmır.

**DEONTOLOGİYA** [yun. deon – borc logos – təlim, söz] – etik nəzəriyyənin bir sahəsi. Deontologiya, bir peşəni tətbiq edilməsi lazım olan əxlaqi dəyər və etik qaydaları araşdıran elm sahəsidir. İnsanın müəyyən tapşırıqları olduğunu fərz edən əxlaq

təlimlərini əsas götürür və bu təlimlərdən qaynaqlanan vəzifə və qaydaların müxtəlif peşələrdəki konkret izlərini araşdırar.

**DETERMİNİZM** [alm. Determinismus. Fr. Determinisme. Ing. Determinism. lat. determinare – müəyyən etmək tr. Belirtlenimcilik; ər. ألتعين] – Hər hadisənin maddi və ya mənəvi bəzi səbəblərin zəruri nəticəsi olduğunu irəli sürən fəlsəfi görüşdür. Determinizm kainatda bütün olub-bitənlərin səbəbiyyət əlaqəsi ilə müəyyənləşdiyini iddia edən nəzəriyyə. Səbəbiyyətin yeri və rolu məsələsində bir-birinə əks olan fəlsəfi konsepsiyalar. Bu nəzəriyyənin əksini iddia edən görüş isə indeterminizm. Ərəbcə səbəbiyyət demək olan determinizm , bir-birini şərtləndirən anlamına gəlir.

**DEFİNİSİYA** [lat. difinito – tərif; ing. Definition; ər.تعريف ; fr. définition] – predmetin mühüm fərqləndirici əlamətlərini və yaxud anlayışların mənasını, onun məzmununu və hüdudlarını müəyyən edən qısa məntiqi tərif. Dilimizdə daha çox ərəbcədən keçmə tərif sözündən istifadə olunur. Tərif sözü də ərəbcədəki ərəfədən [**عرف**] törəmişdir.

**DEGENERASİYA** [alm. Entartung, degenartion; fr. Dègènèrescence; ing. Degeneration; lat. Degeneration; osm. tr. tereddi] – bir növün, daha az yetişkin bir vəziyyətə gəlməyə, pozulmağa, dağılmağa yol açacaq formada dəyişməsi. Həyat tərzi və fəaliyyətlərində geriləmək və durğunluq. Təbii artım funksiyasının itirilməsi yaxud bir orqanizmin ya da orqanın, nəslin təbii inkişafına təsir edəcək formada pozulması.

**DEONTOLOGİYA** [alm. Deontologiya; fr. Deontologie; fr. Deontology; osm. tr. ilmi vezaif; **علم وظائف**] – Deontologiya

etikanı çalışma elmi olaraq təyin etmək şərtilə işlədilən termin. Deontologiya əxlaqi çalışmaları bu və ya mənəvi vəziyyətə görə, təcrübə yolu ilə çalışmanı dilə gətirir.

**DEYİŞ** – söyləm, deyilən. Ifadə edilən söz, poetik deyim.

**DOQMATIZM** [alm. Dogmatismus; fr. Dogmatisme; ing. Dogmatism; osm. tr. nassiye; ər. نصية; dogmatisme] – Doqmatizm - ehkamlara, dəyişməz anlayışlara, dəqiq şərtləri nəzərə almayan düsturlara söykənən, həqiqətin konkretlilik prinsipini rədd edən idrak metodudur.Doqmatizm hansısa düşüncə başlanğıclarını aksioma kimi danılmaz edib sonra, tutalım, dinlə, fəlsəfə ilə bağlı bütün doğruların yalnız onların üstündə durmasına inanmaqdır. Doqmalara (ehkamlara) əsaslanan qeyri-tənqidi təfəkkür; ehkamçılıq. *Doqma* [alm. Dogma; fr. Dogme; yun. Dogma; osm. tr. nass; ər. نص; yun.dogma – fikir, təlim, qərar] - ehkam, bir fəlsəfə məktəbində mənimsənilən, doğru ehtimalı ilə irəli sürülən ideya. Doğruluğu sınanmadan mənimsənilən təlim isə doqmatizm [yaxud ehkamçılıq] deyirlər.

**DÖVLƏT** – siyasi birlik olmaq etibarı ilə müəyyən struktura malik olan, siyasi hakimiyyətin müəyyən təşkili ilə səciyyələnən və müəyyən ərazidə sosial proseslərin tənzimlənməsini təmin edən xususi təsisatdır. Dövlət xüsusi siyasi təsisat olmaqla cəmiyyətin siyasi sisteminin özəyini təşkil edir.

**DUALİZM** [alm. Dualismus; fr. Dualisme; ing. Dualism; lat. Dualis ten; osm. tr. süaniye; yun. dualisme] – bir-birindən müstəqil, bir-birilə əlaqəsi çıxmayan yaxud da qarşısında olan iki ideyanın varlığını qəbul edən görüş. Duo – iki deməkdir. Həm dini inanc sistemində [Xeyir və şər kimi], həm də fəlsəfi dünya-

görüşdə [iki başlanğıc – aləmi Allahın yaratdığı görüş və aləmin təsadüfi yaranması görüşü] dualizm mövcuddur. Dualizm metafizikada varlıq və biliyin, ideya və təzahürün, bədən və ruhun, mən və mən olmayanın İkicilik-Seneviyye: Təbiətdə və ya hər hansı bir sistemin təməlində mütləq olaraq birbirinə icra olunmayan iki prinsipin olduğunu qəbul eden görüştür. Dualizm monizmin əksinə maddi və ruhi substansiyaları bərabər hüquqlu başlanğıclar hesab edən fəlsəfi təlim kimi də xarakterizə edilir. Dualizmin əsas motivi çox vaxt materializmi və idealizmi barışdırmaq cəhdidir. Son nəticədə şüuru materiyadan dualistcəsinə ayırmaq idealizmə gətirib çıxardır. Dualizm daha artıq dərəcədə Dekartın və Kantın fəlsəfəsi üçün səciyyəvidir.

**DƏQIQ ELMLƏR** [alm. Exakte Wissenschaften; fr. Sciences exactes; ing. Exact sciences; osm. tr. ulum-i sahiha] – müşahidə edilə bilən ölçü və hesablara əsaslanan elmlər. Əsasən riyaziyyat, fizika və digərləri. Elmlərin təsnifatında humanitar elmlər və dəqiq elmlər deyə ikiyə ayrılır.

**DƏYƏR** [alm. Wert; fr.valeur; ing. Value, worth; osm. tr. kıymet; tr. Değer; ər. ثمن] – İnsanın, istəyən, varlığına ehtiyacı olan, qiymət verən bir varlıq olaraq, obyekt ilə əlaqəsində ortaya çıxaran bir şey. Dəyər əxlaqı isə mövzusu dəyərlər olan əxlaq fəlsəfəsi, yaxud əxlaq fəlsəfəsinin bir fəsli olaraq ənənəvi dəyərlər sistemidir. Dəyər fəlsəfəsi [alm. wertphilosophie] dəyərləri fəlsəfənin əsas mövzusu olaraq görən fəlsəfə anlayışı yaxud fəlsəfənin dəyərlərini araşdıran sahəsinə də deyilir.

**DƏLİL** [ər. دليل]– Hər hansı bir hökmün və yaxud hökmlər sisteminin həqiqiliyini sübut etmək üçün gətirilən hökm və yaxud

hökmlər sistemi; sübut, tutarlı dəlil gətirmək. Dəlil ərəb mənşəlidir. Son iki samiti təkrar olunan d+l+l şəddəli fellər qrupuna aiddir. İctihadi dəlil gerçək hökmə dəlalət edən dəlilə deyilir. Bu dəlil gerçək hökm barəsində zənnə səbəb olduğundan, ona "ictihadi dəlil" deyilir.

**DİAMAT** – Qərbdə, xüsusilədə Rusiyada dialektik materializmin qısaldılmış edilmiş adı. Keçmiş Sovetlər İttifaqında dialektik materializm geniş tədris edilirdi və qısaca *diamat* adlandırılırdı.

**DİDAKTİKA** [alm. Didaktik; fr. Didactique; ing. Didactics; lat. Didactica; yun. Didaskein – öyrənmək; osm. tr. fenn-i talim ü tedris] – öyrətmə sənti, təlim elmi. Tərbiyənin təlim ilə bağlı olan fəsli.

**DİL FƏLSƏFƏSI** [alm. Sprachphilosophie; ər. فلسفة لغويّة] – dilin adı, kökü, yaranma və formalaşması barədə ortaya çıxan məsələləri problem halında tədqiq edən fəlsəfənin bir sahəsidir. Dil fəlsəfəsini bir fəlsəfə sahəsi kimi ortaya çıxaran və əsaslandıran Haman, Herder və Humboldt olmuşdur. Dil ilə fəlsəfə arasındakı əlaqə təməldə filosofların dildən istifadə edərək fəlsəfəni tədqiq etmələrindən qaynaqlanır. Dil fəlsəfəsi başlığı altında isə dilin özü, mənası, mənşəyi və quruluşu fəlsəfi baxımdan tədqiq edilir.

**DİN FƏLSƏFƏSİ** [Religionsphilosophie; fr. Philosophie de la religion; osm. tr. felsefeyi diniyye]. Dinin ideyalarının özünü və mənasını əsaslandırmağı və açıb ortaya çıxarmağı qarşısına məqsəd qoyan fəlsəfə sahəsi. Fəlsəfənin maraqlandığı sahələrdən biri də dindir. Çünki din faktı insanlıq üçün tarix boyunca əhəmiyyətli olmuşdur. Sadəcə din fəlsəfəsi, dinşünasların, din ilə

məşğul olanların din haqqında müzakirələr aparması demək deyil, bu eləcədə filosoflara aiddir. Din fəlsəfəsi ilə məşğul olanlar, insanın digər məlumatları ilə dini məlumatı arasındakı əlaqələri, inancın quruluşunu, dinin nə olduğunu anlamağa çalışar.

**DİALEKTİKA** [alm. Dialektik; fr. Dialectique; ər.علم آلجدل osm. tr. fenn-i münazara, cedel, ilmi cedel, ilm-i hitaf-ü cedel; yun. dialektike – düşünümək, söhbətləşmək] – təbiət, cəmiyyət və təfəkkürün inkişafının ən ümumi qanunları haqqında elm. Alman idealizmində əqlin inkişaf qanunu kimi xarakterizə edilirdi. Marksın dialektik materializmində iqtisadiyyatın inkişaf qanunları özünü doğruldur. İslam bölgəsi ərəb dilli xalqların fəlsəfəsində qarşılıqlı danışma sürətiylə istidlal etmə sənətinə cədəl elmi deyirdilər [yəni dialektika]. Dialektikanın özünəməxsus tarixi vardır. Qədim Yunanıstanda dialektika dedikdə (yunanca mübahisə aparmaq sənəti, mühakimə yürütmək deməkdir) elmi müsahibə, mübahisə etmək sənətini başa düşürdülər. Qərb fəlsəfəsində və elm məktəbində daha çox sübut nəzəriyyəsi kimi başa düşülür. Dialektika ideyaları fəlsəfənin bütün tarixlərində inkişaf etmişdir. Hegelin dialektikası *idealist dialektika* olmaqla dialektikanın ikinci mühüm tarixi formasını təşkil edir. K.Marks və F.Engels tərəfindən yaradılan dialektika dialektikanın üçüncü tarixi formasını təşkil edir. Bununla belə dialektikanın müxtəlif variantları da ola bilər. Məsələn, neqativ dialektika, antinomik dialektika, paradoksal dialektika vardır. Dialektika nəzəriyyə və metodun üzvi vəhdətindən təşkil olunmuşdur. Dialektikanın kateqoriyaları zaman, məkan, təsadüf, zərurət və s. Və qanunları mövcuddur.

**DİQQƏT** [ing. Attention; ru. Внимание; fr. Attention; ər. دقة] – insanın idraki və praktiki fəaliyyətinin müəyyən bir obyekt və yaxud hərəkət üzərinə yönəldilməsini və cəmləşdirilməsini təmin edən psixi vəziyyəti.

**DİZYUNKSİYA** [lat. disjunctio – ayırmaq] – "və ya" məntiq bağlayıcısının köməyi ilə iki fikrin birləşməsindən mürəkkəb bir fikir əmələ gətirən məntiqi əməliyyat.

**DİKTATURA** [lat. Dictatura; fr. Dictature; ru. Диктаторство; ing.dictatorship] – Latıncada dictatura sözü qeyri-məhdud hakimiyyətə deyilirdi. Müasir anlamda da dövlətdə hakimiyyəti həyata keçirmə sistemini xarakterizə edən anlayış. İngilis dilində sözün sonuna artırılan -ship sufiksi, dilimizə -lıq[4] kimi ifadə edilir.

**DİN** [ing. Religious; fr. Religion; ru. Религия; ər. **دين**]– ictimai şüurun formalarından biri; bir və ya bir neçə Allahın "müqəddəslərin" – yəni fövqəltəbiiliyin bu və ya digər növünün reallığına inamı əsas götürən dünyagörüşü, davranış və spesifik fəaliyyət.

**DİLEMMA** [alm. Dilemma; fr. Dilemme; ing. Dilemma; osm. tr. kiyas-i mukasın; tr. Iklem; yun. Di [s] – iki dəfə, lemma – ehtimal] – əqli nəticənin elə bir növüdür ki, onun müqəddimələrinin sırasına iki: şərti hökm və təqsimi hökm daxil olur; həm də dizyunksiya şəkilndə formulə edilir.

**DİL AİLƏSİ** - Linqvistikadan etnoqrafiyaya dil ailəsi termini keçmişdir. Dillərin qohumluğu onların mənşəyinə görə öyrənilir. Etnoqrafiyada avtoxton anlayışından da istifadə olunur. Avtoxton (yunan sözü olub "autos"-özü, "xtones"-torpaq) mənşə etibarilə

yerli olan deməkdir. Yunan avtoxtonuna qədim Roma termini olan aborigen termini uyğun gəlir ki, bu da “müəyyən bir ölkənin yerli əhalisi" deməkdir.

**DİNAMİZM** – [alm. Dynamismus; fr. Dynamisme; ing. Dynamism; osm. tr. kuviye; ər. قوية]. Materiyanın güc ya da qüvvətin bir təzahür forması olduğunu önə sürən fəlsəfə təlimi. Şeylərin mahiyyətinin qeyri-maddi “qüvvələrdən” ibarət, materiyanı isə şeylərin hərəkətinin təzahürü olan həmin “qüvvələrdən” törəmə hesab edən fəlsəfi təlimlər.

**DİRƏNC** – inad etmək, dirənmək, üzə durmaq. Qədim oğuz dillərindən gəlməkdədir.

**DİSKRETLİK** bax. Fasiləlik və fasiləsizlik.

**DİSKURSİV** [alm. Diskursiv; ər. إستدلآل fr. Discursif; ing. Discursive; es.tr. istidlal; tr. Gidimli; lat. discursivus – mühakimə] hissi, bilavasitə, intuitiv olandan fərqli olaraq mücərrəd, vasitəli, məntiqi və əyani olan, həqiqətlərin bilavasitə [intuitiv] və vasitəli [sübut əsasında qəbul edilən] həqiqətlərə bölünməsi hələ Platonda və Aristoteldə təsadüf edilir.

**DİSTİNKSİYA** [lat. distinctio – fərqləndirmə] – şüur aktı; predmetlər arasında və yaxud şüurun özünün ünsürləri arasında [duyğular, anlayışlar arasında və s.] olan objektiv fərqi əks etdirir.

**DOĞRU** – düzgün, doğru, dürüst, düz. Dilimizdə çox işlək bir sözdür. Kökü əski türkcəyə dayanır.

**DOKTRİNA** [ing. Doctrine; lat. doctrina – [ər. تعليم]] – nəzəri və siyasi prinsipləri əldə rəhbər tutan təlim, elmi yaxud fəlsəfi nəzəriyyə, siyasi sistem [məs., hərbi doktrina].

**DOLUN** – tam, bütün. Qədim oğuz dillərinə aiddir. Əski Yakutiya türklərində bərəkəti simvolizə edən müqəddəs ruhdur.

**DRAMATİZM** [yun. Drama] – estetik kateqoriya; Yunan dilində drama – hərəkət deməkdir. İnsan həyatının ziddiyyətlərini və münaqişələrini, insanın onu əhatə edən ictimai və təbii mühitlə qarşılıqlı münasibətini əks etdirir və ümumiləşdirir.

**DUYĞU** [alm. Gefühl; fr. Sentiment; ing. Feeling, sentiment; osm. tr. his; ər. حسٌ]. Ani və istəklə bərabər duyğu hissi, həzz və ağrını hiss edə bilmə kimi ortaya çıxaran üçüncü əsas orqana verilən addır. Digər bir deyimlə duyğular maddi və mənəvi ola bilir. Misal üçün vəziyyətə görə ortaya çıxan duyğular, xoşbəxtlik, yaxud bədbəxtlik və s. kimi; Nəyəsə istiqamətlənmiş, xüsusilədə estetik, ruhi – fikri [çaşma, heyranlıq] və əxlaqi – ictimai duyğular [tapşırıq duyğusu, hörmət və s.].

**DUHA** – yaradıcılıq istedadının ən yüksək dərəcəsi; bu cür istedad yalnız insana xasdır.

**DÜŞÜNCƏ** [ru. Рассудок; alm. Gedanke; fr. pensêe; ing. Thought; osm. tr. fikir; ər. فكر] – Düşünmə qabiliyətinin özü, yaxud düşünmənin məhsulu, düşünülən şey. Bəzən ideya və prinsiplərə də deyilir. Əski türkcədir. Dilimizdə ərəbcədən qarşılığı olan fikir, yaxud təfəkkür kəlmələri də işlənir. **Düşünmə forması** [alm. Denkform; fr. Libertè dè pensèe; osm. tr. tefekkür hürriyyeti; ər. **حرية آتفكٌر**] – Düşünmənin xarici təzyiq və hər hansı bir qayda ilə məhdudlaşdırılmaması və bunların təzyiqindən müstəqil və sadəcə özündən məsul olması. **Düşünürəm demək ki, varam** [Lat. Cogito ergo sum] – Maddənin özünüdərkində öz şüuruna varıb öz varlığını vasitəsiz formada qavramasını dilə

gətirən əsas prinsip. Əslində bu prinsip varlığın deyil, "mən"in təkan verdiyi yeni bir düşüncə formasının ortaya çıxmasına səbəb olmuşdur.

**DÜNYA** [alm. Welt; fr. Monde; ing. World; lat. Mundus; ər. ألدنيا]. 1. Bir-biri ilə qanuni əlaqəsi olan, bir sistemlə müəyyənləşmiş tək-tək şeylərin və hadisələrin hamısı. Yaxud eyni qaydalara və qanunlara bağlı olan şeylərin, varlıqların təşkil etdiyi bütün. Üzərində yaşadığımız Yer üzü planeti. Şüurun xaricində qalan hər şeydən ibarət olan obyekt dünyası. ***Dünyagörüşü*** [alm.Weltahschaung; ing. outlook] – Kainatın mənasını, prinsipini, dəyərini, insan varlığını və davranışlarını tamamilə qavramağa çalışan ümumi düşüncə, dünyaya ümumi bir baxış.

# E

**EFORAT** - Qədim Spartada ildə bir dəfə seçilən 5 nəfər ali vəzifəli şəxsdən ibarət kollegiya, ali nəzarət orqanı. Tam hüquqlu vətandaşların məclisində seçilirdi. Təqribən e.ə VIII əsrin ortalarında təsis edilmiş, e.ə III əsrsə öz əhəmiyyətini itirmişdir.

**EVDEMONİZM** [yun. Eudaimonia – həzz, səadət, xoşbəxt-lik] – etikanın gedonizmə yaxın olan metodoloji prinsipi. Xoş-bəxtliyi, səadəti təmsil edər.

**EVRİSTİKA** [yun. Heurisko – axtarıram, kəşf edirəm ] – yaradıcılıq fəaliyyətini, yeninin kəşfinə və təlimdə istifadə olunan metodları öyrənən elm.

**EQO** [Alm. Ich; ing. Myself, I; lat. Ego; osm. tr. ene; ər. أنا]. bir kimsənin şəxsiyyətini meydana gətirən təməl element, mən.

fərdi o biri varlıqlardan ayıran şüur. Freydə görə əsas və ən primitiv mənlikdir. Ana qaynağı cinsəllik, aclıq kimi ehtiyacların ən eqoistcəsinə doyurulmasıdır

**EKKLESİYA** - Qədim Yunanıstanda xalq yığıncağınım ən çox yayılmış adı.Bütün növ məsələlər Ekklesiyada müzakirə edilirdi.

**EKZOQAMİYA** (yunanca "ekzo"-xarici, "qamos"-nigah) – hərfi mənada kənardan nikah olmaqla nəslin mühüm əlaməti sayılır. Ekzoqamiya prinsipinə əməl edilməsi nəslin üzvlərinin təsərrüfat və ailə-nikah münasibətlərində böyük rol oynayırdı.

**ELİTA** fransızca seçilmiş deməkdir. Hakimiyyətin daşıyıcısı anlamına gəlir.

**EMFİTEVZİS -** Roma hüququnda başqasının torpağından istifadəyə olan irsi hüquq. Yüz il və daha uzun müddətə bağlanan icarə müqaviləsi ilə müəyyən olunurdu və icarəyə götürən, torpaqdan istifadəyə və sərancam verməyə münasibətdə bütün hüquqlara malik idi.

**ENDOQAMİYA** (yunanca "endoi"-daxili, "qamos"-nikah) – hərfi mənada daxili nikah deməkdir. Endoqamiya, bir etnik birlik kimi qəbilənin çox mühüm əlaməti olmuşdur.

**EQOİZM** [Alm. Egoismus; fr. Ègoisme; ing. Egoism; osm. tr. hadkamlik; lat. ego – mən] – 1. Ümumi mənada: mən düşkünlüyü, özünə düşkünlük, başqalarını hesaba qatmadan ancaq özünü düşünmək, öz mənfəətini düşünmək. İnsanı cəmiyyətə və digər adamlara münasibəti baxımından səciyyələndirən həyat prinsipi və əxlaqi keyfiyyət.

**EQOSENTRİZM** [alm. Egozentrismus; fr. Egocentrisme; osm. tr. li-l eneiyye; ər. لإلأنائية] – sözün kökü latın dilindəki "**ego** – mən" kəlməsindən törəyib. – sentrizm əlavəsi isə ideya və konsepsiyalarda artırılan şəkilçi mahiyyətini daşıyır. Centr – mərkəz, ism – isə ideologiya mənasını ifadə edir. Ərəbcə variantı isə mən - **أنا** sözünə **ل** – üçün şəkilçisi artırılmaqla düzəlmişdir. "Mən"i qərar və hadisələrin mərkəzinə yerləşdirmə, yaxud insanın öz aləmini yüksəklərə qaldıraraq bütün dünya hesab edən özünün maddi və mənəvi dəyərlərini bütün dünyaya müncər edən dünyagörüşü forması.

**EQZOTERİK** [alm. Exoterich; fr. Exoterique; ing. Exoteric; yun. Ekso = xaricdə, çöldə; osm. tr. harici] – xaricdə olan, çöldə olan, daxildə olmayan. Eqzoterik, etimoloji olaraq "xaricə doğru",

“xarici” mənasını verər. Bir təlimin ictimaiyyətə açıqlanan və “bilməsinə icazə verilən” qisimlərini ifadə edir. **Ezoterik**, etimoloji olaraq “içə dönük”, “daxili” mənasını verir. Bir təlimin, seçmə seqmenti xaric, ictimaiyyətə açıqlanmayan və “bilməsinə icazə verilməyən” sirli hissələrini ifadə edir.

**EQREQOR** (yun. ἐγρήγοροι) insanların fikir və təxəyyülləri sayəsində yaradılan müstəqil bir xəyali (dini) varlıq, mələk və s.

**EHTİMAL** [alm. Wahrscheinlichkeit; fr. Probabiltè; ing. Probability; lat. Probabilitas; osm. tr. probabilitas; osm. tr. ihtimaliyet; ər. إحتماليّت] – mümkün ola biləcək, baş verə biləcək hadisənin, vəziyyətin və s. həqiqiliyə, düzgünlüyə olan münasibət dərəcəsi. Bu mənada ortaya çıxması vacib olmayan bir hadisənin ortaya çıxma imkanının ən yüksək dərəcəsi. Bir şeyin ola bilməsi, baş verə bilməsi, mümkünlüyü. *Ehtimallıq* [alm. Probabilismus; fr. Probabilisme; ing. Probablism; lat. Probabilis – ola biləcək; osm. tr. ihtimaliye; ər. إحتمال; tr. olasıcılık] biliyin ancaq – imkanlılıq dəyəri olduğunu və imkan olarsa ola biləcəyini önə sürən nəzəri-skeptik təlim.

**EHTİVA** [alm. Ümfang, extension; fr.=ing. – extention; lat. Extensiv; osm. tr. şümul; tr. Kapsam; ər. أحاطة] – əhatə, bir anlamın yaxud kəlmənin və onu dilə gətirən terminin əhatə etdiyi varlıqların və fərdi haidsələrin hamısı. Ərəbcədə kök hərfləri *h+v+y* – dir.

**EHTİRAS** [alm. Leidenschaft; fr.=ing. Passion; lat. Passio; yun. Pathos; osm. tr. ihtiras; ər. إحتراس; tr. tutku] – Ağlın çətinliklə idarə edə bildiyi hiss. Bir insanın istəmə, hiss etmə və düşünməsinə hakim olan güclü meyl. Uzun müddətli qalıcı və

güclü hissiyyat. Pozitiv ehtiras uğura, neqativ ehtiras uğursuzluğa aparıb çıxarır. Hegel ehtiras olmadan heç bir böyük işin öhdəsindən gəlinməyəcəyini deyir.

**EZOTERİK** [alm. Esoterisch; fr. Èsoterique; yun. Esoterikos – daxildə içəridə; osm. tr. batin; ər. باطن] – "Ezoterik" termini ilə yalnız savadlılar üçün nəzərdə tutlmuş, yalnız mütəxəssislərin başa düşəcəyi ideyanı, nəzəriyyəni adlandırırlar. Müəyyən bir insan cəmiyyətinin xaricində heç kəsə bildirilməyən, ancaq məhdud sayda olan, dar bir çevrəyə xəbər verilən bilik, məlumat.

**EYNİYYƏT** [ru. Идентичность; ing. Identity; ər. عينية] - predmetin, hadisənin öz-özü ilə bərabərliyini, eyniliyini və bir neçə predmetin bərabərliyini ifadə edən kateqoriya.

**EKZİSTENSİALİZM** [alm. Existenzialismus; fr. Existentialisme; ing. Existentialism; tr. Varoluşçuluq; lat. exsistentia – varlıq] – Çağımızın bir fəlsəfə cərəyanı. Eqzistensial fəlsəfi təlimi əsas qəbul edən bütün düşüncə sistemlərinə verilən ad. Danimarkalı alim Kierkegaard böyük miqyasda başladığı, eyni zamanda fəlsəfənin əvvəldən bəri ələ aldığı problemləri kökdən yeniləməyə çalışan modern Avropanın bəzi filosoflarının yaşatdığı fəlsəfi cərəyan. Fəlsəfədə XX əsrdə ziyalıların baxışlarına cavab verən yeni dünyagörüşü yaratmaq cəhdi kimi meydana gəlmiş irrasionalist cərəyan.

**EKSPERİMENT** [Alm. Erfahrung, experiment; fr. Experience; ing.experience; experiment; yun.emperia; lat.experientia; osm. tr. tecrübe; ər. أجربة; lat. experimentum – sınaq, təcrübə] – hər hansı bir hadisənin tədqiqatın məqsədlərinə uyğun gələn yeni şəraitin yaradılması vasitəsilə və ya prosesin gedişinin lazımi

istiqamətdə dəyişdirilməsi vasitəsilə həmin hadisəyə fəal təsir yolu ilə tədqiq edilməsi. Yunan dilindəki peria [təcrübə, imtahandan keçirmə] kəlməsindən iki sıra söz törənmişdir: 1. [mücərrəd və ümumi mənada işlədilən] emperia və törəmələri: empirik, empirizm; II. [konkret və daha texniki mənada işlədilən] experientia [lat. Experiri = təcrübə, təcrübədən keçirmə] və növləri: experimenter, experimental, experimentation. I – Emperia = təcrübə, təcrübədən keçirilənlər.

**EXPRESSİONİZM** [alm. Expressionismus; fr. Expressionisme; ing. Expressionism; lat. Exprimere – dilə gətirmək, uzaqlaşdırmaq]. Təbiilik və müşahidəçiliyin əksi olan müasir sənət cərəyanı. Bu cərəyan ön planda və obyektiv təbiəti nə də maddi müşahidələri əks etdirmək istəyər, onun dilə gətirmək istədiyi, mənəvi həyata aid olanların ruhi mühtəvalarıdır.

**EKSPLİKASİYA** [lat. explicatio – izahetmə, genişləndirmə] – bu və ya digər predmetin, hadisənin mahiyyətinin aşkara çıxarılmasından ibarət tədqiqat mərhələsi.

**EKLEKTİZM** [alm. Eklekticismus; fr. Eclectisime; ing. Eclecticism; osm. tr. iktitafiye; eclestisme] – Qurulmuş olan nizamlardan fərqli düşüncələri seçib almaq və öz təlimində birləşdirmə metodu və bu metodla işləyən filosofların təlimi. Seçməcilik, uzlaşdırmacılık-İntihabiyye: müxtəlif və hətta bir-birinin ziddi olan fəlsəfi sistemlərdən iqtibaslar edərək yeni sistem qurmaqdır.

**EKVİVALENT** [alm. Äquivalent; fr. Èquivalent; ing. Equivalent; lat. Aequivalens – eyni dəyərli, dəyərcə eyni olan;

osm. tr. müadil; ər. معادل ] – bir başqa dəyəri əvəz edə biləcək dəyər, aralarında məntiqi eynilik olanlara da deyilir.

**ELEMENT** [alm. Element; fr. Èlèment; ing. Element; lat. Elementum; osm. tr. unsur; ər. أنصٌ; tr. öğe] – ümumi olaraq bir kombinasiyanın ən adı bir parçası. Məntiqdə bir sinifə, yaxud da hər şeyə bağlı olan bölünməz əsas hissələr.

**EMANASİYA** [alm. = ing. Emanation; fr. Èmanation; lat. Emanatio; osm. tr. sudur; emanation] – aşağı olanın daha yuxarı olandan çıxması. Çox olanın "bir" olandan çıxması. Bir olan yetkin olandır və öz varlığı daxilində azalmadan və dəyişmədən qalır, ondan törəyən isə çıxış qaynağından olan uzaqlığın ölçüsünə görə get-gedə yetişkənliyini itirir. Anlam baxımından da bir şeydən axmaq, aşağıdakının yuxarıdakından, hər şeyin "Bir" olandan çıxması deməkdir.

**EMPİRİZM** [ru. Опытность; ing. Empirisme; yun. Empeiriya – təcrübə] – Təcrübə, məlumatın qaynağı olaraq sadəcə təcrübəni qəbul edən fəlsəfi sənətdir. İdrak nəzəriyyəsində cərəyan.

**EPİSTEMOLOGİYA** [alm. Epistemologie; fr.Èpistèmologie; ing. Epistemology; yun. Episteme – bilik, logos – təlim, söz] - idrak nəzəriyyəsi. Bilik nəzəriyyəsi: Elmlərin mövzu, sərhəd və qarşılıqlı münasibətlərini təyin və təsbit edən fəlsəfi məktəb. Bilik təlimi. Elmlərin qoyduğu problemləri tədqiq edən fəlsəfə sahəsi. Elm fəlsəfəsi ilə təxmini olaraq eyni mənalıdır. Ancaq elm fəlsəfəsi elmlərin tarixini fəlsəfi baxımdan tədqiq edir, epistemologiya isə müxtəlif elmlərin ideyalarını, hipotezlərini və nəticələrini tənqid edərək araşdırar, onların məntiqi əsasını, obyektiv dəyərini təyin etməyə çalışır.

**ETHOS** [etos]: Kosmosa qarşı insanın əxlaqi varlığı.

**ELM** [Alm. Wissemschaft; fr., ing. Science; lat. Scientia; osm. tr. ilim; ər. علم] – təbiət, cəmiyyət və təfəkkür haqqında yeni biliklərin istehsalına yönəldilmiş və bu istehsalın bütün şəraitini və momentlərini; özlərinin bilikləri və qabiliyyətləri, peşə ixtisası və təcrübəsi, elmi əməyin bölgüsü və kooperasiyası ilə birlikdə amilləri. Elmlər toplusu yaxud bütünlükdə elmi biliklərə verilən addır. Bəzən bilməyə istiqamətlənmiş müəyyən bir prosesin adına da elm deyilir. Sözün kökü ərəbcədəki alimə-dən [**علم**] gəlir. Elm sözü isə onun məsdər formasıdır.

**EMOTİVİZM** [lat. emovere – oyatmaq, həyəcanlandırmaq] – məntiqi pozitivizm metodologiyasının ardıcıl tətbiq olunduğu subjektivist əxlaq nəzəriyyəsi.

**EMPİRİOKRİTİSİZM** [ru. Эмпириокритицизм; - “təcrübənin tənqidi”] və yaxud maxizm – Avenarius və Max tərəfindən əsaslandırılmış subjektiv idealist cərəyan. Empirio və kritika sözlərinin birləşməsindən əmələ gəlmişdir.

**EMPİRİOMONİZM** [yun. Empeiria – təcrübə və monos – vahid] – empiriokritisizmin, maxizmin növlərindən biri; Boqdanov öz fəlsəfəsini belə adlandırmışdı.

**EMPİRİOSİMVOLİZM** [yun. Empeiria – təcrübə və və sumbolon – şərti, işarə, simbol] – idealist Yuşkeviçin empiriokritisizmin özünə aid olan növün adlandırdığı termin.

**ELM ƏL-YƏQİN** - bax: **yəqin**. Şübhə duymadan bir şeyi, möhkəm və qatı olaraq bilmək. (Yəqin: mərifəti və zəkanı və misalının fövqündə olan elmin sifətidir. İlm-i yəqin deyilir, mərifəti-i yəqin deyilmir. Ayn-əl yəqin: (sözün mərfu halı ayn-ul

yəqindir.) Göz ilə görər dərəcədə və ya görərək, müşahidə edərək bilməkdir. Məsələn; uzaqda bir duman görürük. Artıq atəşin varlığını elmi olaraq bilirik. Bu bilmə dərəcəsinə elm-əl yəqin deyilir. Atəşə yaxınlaşıb, gözümüzlə görsək, ona ayn-əl yəqini bilmək deyilir. Daha da irəli gedərək bütün hisslərimizlə atəşin varlığını anladıqsa; atəşin yandırması və sair sifətlərini da bildiksə, bu növdən olan elmimizin dərəcəsinə də haqq-al yəqin deyilir.

**ENTUZİAZM** [alm. Enthusiasmus; fr. Enthusiasme; ing. Enthusiasm; yun. En-thos – Daxilində Tanrı ilə olma ; osm. tr. Vecit; tr. Coşku; ər. وجد]. 1. Hər hansı bir düşüncə ilə, yüksək bir hisslə dolub daşma, qəlbini fərhləndirmə, ruhun aşıb – daşması, mənəvi coşqunluq və s. kimi vəziyyətlərə deyilir. Bəzən "insanin Tanrı ilə dolub daşmasına" da deyilir. Dilimizdə daha çox ərəbcədən keçmə vəcd sözündən istifadə olunur. Misal üçün kiminsə haqqında "Filan şəxs vəcdə gəldi" deyimi işlək ifadədir.

**ENTELEXİYA** [yun. Entelecheia – özü-özündə məqsədə malik olan] – məqsədlilik Aristoteldə və sxolastikada hərəkətverici qüvvə kimi [Teleologiya] məqsədyönlülük; imkanı gerçəkliyə çevirən özünəməqsəd fəal başlanğıc.

**ENSİKLOPEDİYA** [alm. Enzyklopȧdia; fr. Encyclopèdie; ing. Encyclopedia, yun. En=kyklos- dairə çevrəsində, peedia – təhsil deməkdir; osm. tr. kamus]. Qədim etmiloji termin olan bu kəlmə əslində antik Yunanıstanda məcburi təhsili kimi başa düşülürdü. Müasir anlamında isə bütün elmlərin yaxud da bir elm sahəsinə aid olan hər şeyin maddə-maddə nizamlı olaraq, əlifba sırasıyla verildiyi bir əsər. Müasir dövrdə ilk örnəyi Fransada

Didederot və D`Alambertin təşkil etdiyi məşhur “Encyclopedie ou dictionnaire raisonnè des sciences, des arts et des mètiers”dir. [1751-1780]. İslam mədəni bölgəsi fəlsəfəsində “Saflıq qardaşları” [İxvan əs-Səfa] adı ilə ensiklopedistlər məşhurdur.

**ENTİMEMA** [yun. Entimo – ağılda] - ənənəvi formal məntiqdə deduktiv əqlinəticə; bu əqlinəticədə hər hansı bir hissə ya müqəddimələrdən biri, ya da nəticə aydın ifadə olunmur.

**ENTROPİYA** [yun. En – da, də və trope – dönüş, çevrilmə] – çevrilmə, dəyişmə. Klassik fizikanın əsas anlayışlarından biri; elmə R. Klauzius daxil etmişdir.

**EPİFENOMEN** [yun. Epi – yanında, sonra, ətrafında və phainomenon – təzahür edən] – dünyanın maddi [və ya ideal] məzmunun passiv inikası kimi şüurun ifadə edilməsi üçün tətbiq olunan termin.

**EPİHEYREMA** [yun. Epiheirema - əqlinəticə] – müqəddimələri entimemalardan ibarət sillogistik əqli nəticə.

**ERİSTİKA** [yun.eristikos – mübahisə edən] – qədim yunan sofistləri arasında xüsusilə geniş inkişaf etmiş mübahisə sənəti.

**ETİKA** [alm. Ethik; fr. Èethique; ing. Ethics; lat. Ethica; yun. Ethike; osm. tr. ilm-i ahlak; ər. علم آلأخلاق; tr. ethik – insanın gerçəkliklə qarşılıqlı münasibətlərinin özünəməxsus tərəfləri. Əxlaq fəlsəfəsi, insanın, cəmiyyətin və həyatın əxlaqi tərəflərini araşdıran sahə, insanın həm özünəməxsus, həm də ictimai həyatındakı əxlaqi, mənəvi dəyərləri araşdıran fəlsəfənin bir qoludur.

**ESKATALOGİYA** [alm.=Fr. Eschatologie; ing. Eschatalogy; yun. Eschaton – son, sonuncu; loqos – təlim, doktrina; osm. tr. ilm-ül ahiret; ər. علم آلأخرة] - Yunanca έσχατος yəni "son"

kəlməsindən törəmiş teologiya və fəlsəfənin bir hissəsidir. İnsanlığın son taleyi və ya dünya tarixini nəticələndirən hadisələr, daha kobud bir təbirlə dünyanın sonu ilə məşğul olur. Bir çox din, təlim və ya kultta dünyanın sonu gələcəkdə olacaq bir hadisə kimi müqəddəs mətn, mit və ya folklorda göstərilir. Daha geniş bir baxımdan, eskatologiyada Məsih, Məsih Çağı, axirət və ruh kimi mövzuları da əhatə edə bilər. Fərqli inanışların eskatolojik inancları və düşüncələri fərqli olsa da müəyyən oxşarlıqlar var ola bilər.

**ESTETİKA** [alm. Ā̈sthetik; fr. Esthètique; ing. Aesthetics; yun. Aisthetikè [episteme] – həssaslıq haqqında təlim] – insan tərəfindən aləmin estetik mənimsənilməsi qanunauyğunluqları, gözəllik qanunları əsasında yaradıcılığın mahiyyəti və forması haqqında elm. Kanta görə transandental estetika hissiyyatın ilkin ideyalarının elmidir. Əslində gözəl və sənət Platondan indiyə qədər fəlsəfi fikirlərin mövzusu olmuşdur.

**ETATİZM** [alm. Etatismus; fr. etatisme – dövlət; **فلسفة ألدولة**] – Dövləti bütün ictimai işlərdən xüusilə də iqtisadi və mədəni həyatın sistemindən üstün görən məfhum. Ümumiyyətlə dövləti ənənə, mədəniyyət, hüquq və digərlərinin qaynaq və daşıyıcısı olaraq görmə təlimi. Dövlət fəlsəfəsi dövlətin və ictimai həyatın özü, ortaya çıxması, mənası, əsas ideyaları və əsas formaları üzərində inkişaf etdirilən fəlsəfə təlimləri [Dövlət fəlsəfəsini ilkin Platon ilə Aristotel qurmuşlardır]. Ümumiyyətlə dövləti müasir politologiyada konsepsiya.

**ETİBAR** [alm. Konvention; fr.=ing. Convention; lat. conventio] – etibar, əminlik. Hörmət görmə, qiymətli, etibarlı

olma vəziyyəti, möhtərəmlik, prestij. Borc ödəmədə etibarlı olma vəziyyəti. Əhəmiyyət vermək. Hörmət, riayət və xatir saymaq. Qulaq asmaq. İbrət götürüb ayıq olmaq. Birinci və ya sözünü məqbul fərz etmek.

**ETİQAD** [ər. اعتقاد]– bu və ya digər hadisənin həqiqiliyi haqqında və biliyə əsaaslanmayan inam. Etiqad dini-fəlsəfi ədəbiyyatda da çox işlənir. Kök olaraq aqədə [عقد] felindən gəlir və VIII babda məsdəridir. Dilimizdə işlənənən əqidə sözü də bu qəbildəndir. Elm-i əqaid – hər hansı bir dinin iman məsələlərini və şəriət hökmlərini, o cümlədən ibadət formalarını öyrənən elm.

**EHKAM** - bax: **Doqma**.

**EUDAYMONİA** [yun.eu-daimonia – yaxşı bir dayimonu olan adam, insanın bütün həyatını ehtiva edən, onun fəaliyyətlərinin mərkəzində yer alan güc.] – ümumi mənada isə insan ruhunun yaxşı vəziyyətdə olmasına deyilir. Zamanla daha başqa mənalarda da istifadə edilmişdir. Misal üçün insanın xarici təzyiqlər nəticəsində müvəqqəti xoşbəxtliyinə verilən ümumi anlam kimi götürülmüşdür.

**EUDOMANİZM** [alm. Eudämonismus; fr. Eudèmonisme; ing. eudomonism; yun. Eudaimonismos; osm. tr. istisadiye] – həyatın mənasını xoşbəxtlikdə görən, insanın bütün fəaliyyətlərinin son elementi olaraq xoşbəxliyi görən əxlaqi təlim.

## Ə

**ƏBƏDİYYƏT** [ər. أبدية]– aləmin mövcudluğu zamanı, materiyanın yaradılmazlığı və məhvedilməzliyi, onun substansial sonsuz uzunluğu, sürəkliliyidir.

**ƏCƏMİ** – qeyri-ərəb mənşəli olan. Yaranması etibarı ilə Xilafət dövrünə təsadüf edən bu kəlmə, Xilafətin tabeçiliyində yaşayan və ərəb olmayan çoxlu xalqlara verilən ad idi. Hərfi mənasında "yad", "naməlum", "əcəmi olan" deməkdir. Bəzən hərfi mənasında da işlədilir.

**ƏCR** [أجر] – əvəz, mükafat deməkdir. Əcr, insanların bu dünyada çəkdikləri əzablara, işlədikləri xeyir əməllərə və etdiyi ibadətlərə əvəz olaraq axirət dünyasında Tanrının verdiyi mükafatlardır.

**ƏDƏB** [أدب] – ədəb, əxlaq. Ədəb-ərkan qaydaları, şəxsin bütün hərəkət və sözlərində tərbiyəli davranışları. Təsəvvüfdə isə müridə şeyxinin məsləhət gördüyü və əməl etməsi vacib olan ədəb-ərkan qaydalarıdır.

**ƏHD** [عهد] - əhdləşmə, vədələşmə, müqavilə.

**ƏHKAM** - doqma [dogma – fikir, təlim, qərar[ər. أحكام]] – bütün vəziyyətlərdə dəyişməyən, həqiqətin pozulmazlığı üçün qəbul edilmiş müddəa, anlayış. Ərəbcədən hərfi mənada "hökmlər" deməkdir. Hökm sözünün cəmidir. Şəriətin qoyduğu vacib hökmlərə, qanunlara deyilir. Əhkam-i diniyyə - dini hökmlər.

**ƏHVAL** – ərəbcədən hərfi tərcümədə "hallar" deməkdir. Hal sözünün cəmidir.

**ƏHVAL-i Ruhiyyə** – ruha aid olan hal və xüsusiyyətlər. Bu termin bəzən məcaz olaraq da işlədilməkdədir. Misal üçün, *əhval-i ruhiyyəm çox pisdir, gələ bilməyəcəm.*

**ƏKS** [alm. Konträr; fr.contaire; ing. Contrarylat. Contrarius; osm. tr. zıt; tr. Karşıt; ər. عكس] – bir-birilərinin formal ziddi olmayıb, əslində mahiyyətcə ona qarşı olan məfhumlar.

**ƏMƏL-i saleh** – saleh əməllər, xeyirli işlər, əksəriyyətlə dini – fəlsəfi terminologiyaya aid olub, bir şəxsin dinin hökmlərinin əksinə olmayaraq gördüyü xeyirli işlərə deyilir.

**ƏMƏN** – əski türkcədə bir neçə məna verirdi. 1-Can, ruh, həyat 2- Ağac tikmək üçün açılan çuxur 3- meşə ağacı.

**ƏNBİYA** – Nəbilər, peyğəmbərlər deməkdir. Nəbi sözünün cəmidir. Nəbi sözü nəbəə [نبئ] felindən əmələ gəlmiş və xəbər vermək deməkdir. Dilimizdə bəzən peyğəmbərlər sözünün sinonimi kimi işlədilməkdədir. Ərəbcədir, peyğəmbər sözü isə farscadan keçmişdir.

**ƏNƏNƏ** [alm. Sitte; fr. Moeurs; ing. Customs; lat. Mos-mores; osm. tr. örf; tr. Töre; ər. آدات] – bir cəmiyyət daxilində mənimsənilmiş, yerləşmiş həyat tərzinə və həyat formalarının, qaydaların, aətlərin müştərək vərdişlərinin və izlənilən istiqamətlərin hamısı. Adət-ənənə [ər.آدة] Böyük və kiçik sosial qrupun üzvlərinə özlərini faktiki necə apardıqlarını, nəyi özlərinə rəva bildiklərini və nəyi özlərinə qadağan etdiklərini təsbit edən anlayış. nəsildən-nəslə keçən adətlər, əxlaq normaları, görüşlər, zövqlər və s. **Ənənə** etnosun həyatını qoruyub saxlamaq üçün maddi və mənəvi mədəniyyətin, ailə və ictimai həyatın elə bir amilidir ki, cəmiyyətin üzvləri onu nəsildən-nəslə keçirirlər.

**ƏNSAR** (أنصار) – Mədinə camaatına ənsar deyilirdi. Hərfi mənası “kömək edənlər”, “dəstək olanlar” deməkdir, *nasir* sözündən törəmişdir. *Nasara* ərəbcədə yardım etmək, əl tutmaq deməkdir. Məkkədən Mədinəyə köçərək hicrət edən müsəlmanlara kömək edib, onlarla qardaş kimi öz mallarını paylaşdıqları üçün onlara ənsar deməyə başladılar.

**ƏVHAM** [**أوهأم**] – vəhmlər, şübhələr, zənn etmələr**.** Vəhm [**وهم**] sözünün cəmidir. Səhv və yersiz düşüncə, yanlış fikir. Misal üçün: Boş əvhama dalıb, real heç nə demədi. Bir mövzuyla əlaqədar pis ehtimalları ağla gətirib kədərlənmək, şübhələr, yanlış fikir, vəsvəsəyə düşmək. Olmayacaq bir şeyin olacağını sanma, qorxu duymaq.

**ƏZƏLİ** [أزلي] - əvvəli olmayan, başlanğıc nöqtəsi olmayan. Allahın adlarından biridir. Dini – fəlsəfi ədəbiyyatda əsas var olan tanrının varlığıdır və o var olunmamiş, yaradılmamışdır. Həqiqi, vacib varlıq Tanrıdır. Onun elminə, biliyinə də elm-i əzəli deyilir. *Əzəlilik-əbədilik* [alm. Ewigkeit; fr. Èternite; ing. Eternity; lat. Aeternitas; osm. tr. ezeliyet-ebediyet; tr. Öncesizlik-sonrasızlıq; ər. أدية- أزليَّة] əvvəli və sonu olmayan proses. Varlığın bütövlükdə tamlığı. Bu tamlıq zamanı və zamansızlığı özündə ehtiva edir.

**ƏDALƏT** [ər. عدالة]- əxlaqi-hüquqi və sosial-siyasi şüur kateqoriyası, insanın şəksiz hüquqları barədə tarixən dəyişən təsəvvürlərdə bağlı lazımlıq anlayış. Ərəbcədəki ədl [عدل] sözündən əmələ gəlmişdir. *Adil* sözü də bu qəbildəndir.

**ƏKSLİK** [عكس]– ziddiyyətin inkişaf pillələrindən birini ifadə və əks etdirən kateqoriya. Ziddiyyət, uyğunsuzluq, məntiqsizlik. Fikirlər arasında əkslik. Fəlsəfi anlamda aralarında ziddiyyət olan

əşya, hadisə, ya proseslərdən hər biri. Əksliklərin vəhdəti və mübarizəsi. İnkişaf əksliklərin mübarizəsidir.

**ƏL-İxvan** [ər. ألإخوأن]– İslamiyyətdə [misir] şeyx həsən əl-Bənnanın yaratdığı [1928] "Müsəlman Qardaşlar" cəmiyyəti adlı dini-siyasi təşkilatın üzvlərinin adı. İslam Şərqində "İxvan əs-Səfa" [Saflıq qardaşları] adı ilə məşhurdur.

**ƏLƏVİLİK** [ər. علوية] – şiəliyə mənsub dini-fəlsəfi təlim. Əliallahilik isə [ər. علىآللاّهية]- şiəlik təriqətidir. Orta əsrlərdə İranda, Azərb. və digər ölkələrdə geniş yayılmış dini-mistik cərəyandır. Ələvilik Türkiyədə sünnilik sonra ən çox mənsubu olan ikinci müsəlmançılıq inanc sistemidir. Əhli-sünnə məzhəbində Allah - Məhəmməd vəhdətindən fərqli olaraq, ələvilikdə Allah - Məhəmməd - Əli ilə tamamlanan və Əhl-i Beyt, On iki İmamları əsas alan bir inancdır. Ələvilik daxilində müxtəlif təriqətlər mövcuddur. Bunlardan ən tanınmışı Anadoludan qaynaqlanan Bəktaşilikdir. Bektaşilik ələvəlik içində bir təriqət olması səbəbiylə ələviliyi bütünlükdə tərif edə bilməz. Ələvilik təməl inanc sistemi kimi Ələvilik , Allah - Məhəmməd - Əli üçlüyü və Əhl-i Beyt, On iki İmamlara ciddi olaraq əhəmiyyət verən Şiəliyin On ikicilik məzhəbi ilə ortaq nöqtələrə sahib bir yoldur. Ələvilikdə araşdırılması lazım olan əsl inanc varlığın birliyidir. Ələvilikdə Tanrının insan daxil kainatdakı hər şeyin içində olduğu inancı vardır. Ələvilik Allah qorxusu yerinə sevgisini mənimsəyən, təməlində insan sevgisi ilə hərəkət edən, Quranın şəklini deyil özünü qəbul etdiklərini ifadə edən, məqsədi ruhi yetkinləşmə olan bir təsəvvüf yoludur. Özünü insan sevgisində tapan, Tanrının insanda təcəlli etdiyinə və zərrəsindən meydana gəldiyinə, onun üçün də insanın

ölümsüzlüyünə inanan, ibadətlərində qadın kişi ayrı-seçkiliyi etmədən , öz diliylə, musiqisiylə inancını icra etmə formasıdır.

**ƏMƏK** [ing. Labour; fr. Ouvrage; ru. Работа; tr. Iş; ər. **عمل**] – insanın məqsədyönlü fəaliyyətinin adıdır. Bir şeyin yaradılması və ya çıxarılması üçün xərclənən bədən və baş gücü, yaxud uzun və yorucu, diqqətli iş yaxud da insanın şüurlu olaraq müəyyən bir məqsədə çatmaq üçün girişdiyi həm təbii və ictimai ətrafını həm də özünü dəyişdirən iş prosesi, səy.

**ƏRDƏM** [alm. Tugend; ing. Virtue; fr. Vertu; yun. Arete; osm. tr. fazilet; ər. **فضيلة**] – İnsanın mənəvi və ruhani yetkinliyi, istəyin əxlaqi yaxşılığa yönəlməsi. Fəlsəfə tarixində ərdəmə və ərdəmliyə müxtəlif mövqelərdən münasibət bildirilmişdir. Ümumiyyətlə isə ərdəmi – fəziləti əxlaqi yaxşılıq kimi qiymətləndirmişlər.

**ƏRƏZ** [cəm آرآز; ing. Accident] – fəlsəfi terminologiyaya aiddir. Bir şeydə var olan, fəqət o şeyin təbiəti xaricində yer olan her məna arazıdır. Orta əsrlər Şərq fəlsəfəsində şeyin mahiyyətini təşkil edənə cövhər, ona əlavə olunanlara isə ərəz deyilirdi. Müasir fəlsəfi dildə bu sözün əvəzində aksidensiya ifadəsindən istifadə olunur. Şeyin zatında mövcud olan, lakin onun mahiyyətindən kənarda qalan hər şey ərəzdir. Ərəzlərin müstəqil var ola bilmə xarakterinə malik deyil, çünki ərəzlər cövhərlərin təbiətinə əlavə olunduqda varlıq əldə edirlər. Misal üçün, taxta şeyin cövhəri, onun hər hansı bir formaya salınmış şəkli, rəngi isə ərəzlərdir. Elə ərəzlər vardır ki, onlar sanki əşyanın mahiyyəti ilə bərabərdirlər, onları cövhərlərdən ayrı düşünmək mümkün deyil. Bu ərəzlərə lazım ərəz deyilir. Əşyanın mahiyyətindən fərqlənən

və xarakterik olaraq, onlardan ayrıla bilən ərəzlərə isə fərqlənən ərəzlər deyilir. Misal üçün, hər hansı bir şəxsin peşəsi onun üçün lazım ərəz olduğu halda, geyimi, tipi, yaxud hərəkəti, sükunəti fərqlənən ərəzdir.

**ƏRŞ** – Yer kürəsi, yaxud göy, asiman. Tez-tez Quranda işlədilən ərş sözündən mıəqsəd ilahi hakimiyyət, yaxud da Tanrının dərgahı deməkdir.

**ƏRMIŞ** – Müdrik, mütəfəkkir, yetişkin, Tanrıdan ilham alan. Əski türkcədir. Türkiyə türkcəsində hazırda işlənir və övliya anlamına gəlir.

**ƏSRİMİŞ** – Əski türkcədə özündən geçmiş, vəcdə gəlmiş adam deməkdir.

**ƏSAS** [alm. Grund, Grundlage, Fundament; fr. Fondament; ing. Foundation; lat. Fundamentum; osm. tr. esas; tr. Temel; ər. أسس] – bir şeyin üzərində təməlləndiyi, təşkil olunduğu şey. Müəyyən hadisələrin [nəticələrin] mövcudluğunun ilkin şəraiti və onların izahından ibarət zəruri şərt. Əsas kökündən ərəbcədə bir neçə söz də əmələ gəlir; təsis, müəssisə və s.

**ƏŞƏRİLİK [ər. أشعارية]** – X əsrin əvvəllərində yaranmış dini-fəlsəfi təlim; ortodoksal islam sxolostikası [kəlam]. Əşərilik, islami etiqadı məzhəblərindən biridir. Əqlə Mötəzilə qədər əhəmiyyət verməsə belə, Sələfiyyə qədər də kiçik ölçüdə tədqiq etməz. Bunu belə təsvir etmək mümkündür. Əgər Sələfiyyə ilə mötəzilə arasında *əql* və *nass* mövzusunda bir sərhəd qoysalar məhz söü gedən  əşərilik bu sərhəddə ortada qalacaq lakin Sələfiyyəyə daha yaxın mövqedədir. Əbu Həsən Əşaridən (öl. B.e. 935 ) qurduğu bu təlim, ağılın heç bir zaman gerçəyə çata

bilməyəcəyini, qulların ancaq qeydsiz şərtsiz inanmaqla xoşbəxt ola biləcəkləri ideyasını irəli sürür. Təbii hadisələr, səbəbləri bilinməyən və bəlkə də əsla bilinməyəcək olan bütöv bir ilahi qanunauyğunluğun məhsuludur, bu belə də idarə olunur. Ağıl, gücsüz bir məlumatdır. Qaldı ki, ağılın bu gün bilədiyini sabah da bilməyəcəyi deyilə bilməz. İmam Bakıllani, Ebu-l- Məali kimi mütəfəkkirlərin rəhbərliyi altında getdikcə inkişaf edən bu təlim təzyiqini elə artırmış və yayılmışdır ki əleyhinə çıxan axınlar XII əsrdə Qərbə keçərək Əndülüs ərəbləri arasında yaşamağa məcbur qalmışlar. Əşariliyin ən böyük tənqidçilərindən biri də məşhur filosof İbn Rüşddür. Əslində ümumiyyətlə kəlam və kəlamçılara qarşı çıxmış olsa da İbn Rüşd tənqidlərini ən çox Qəzali və Əşarilik üzərinə yönəlir.

**ƏŞYALAŞMA** [maddiləşmə] – predmetləşmədən fərqli olaraq tarixən keçici və əmtəə istehsalına, xüsusilə kapitalizm cəmiyyətinə xas sosial münasibətlərin şəxsi münasibətlərdən əşya münasibətlərinə, xalis rol münasibətlərinə çevrilməsi. Əşyalaşma yadlaşma, qəribələşmə ilə sinonim şəklində də işlənir. Bir dəyişmənin mövcud olduğu vəziyyət, hər şeyin şüurlu olaraq bir tanıma sığması vəziyyətidir. Bu vəziyyətdə cümlədə təyinedici funksiyada nəyisə xarakterizə etmiş olur.

**ƏXİLİK** [أخويّة] - əxilərin dini-fəlsəfi təlimi. Əxi sözünün hərfi mənası dilimizdə “qardaş” deməkdir. Azərbaycan dilinə qardaşlıq kimi də tərcümə olunur. Orta əsrlərdə islam mədəni bölgəsində ortaya çıxmışdır. Əslində “əxi” terminin mənşəyi mövzusunda dil alimləri arasında görüş birliyi yoxdur. “Əxi” kəlməsi ərəbcə “qardaş” mənasını versə də, ancaq Divani Lüğət-i Türkdə “əxi”

sözü, əli açıq, comərd, igid mənasını verən "ağı" sözündən törədiyi qeyd olunur. Termin olaraq əxilik isə , XIII əsrin ilk yarısından XIX əsrin ikinci yarısına qədər Anadoluda, Balkanlarda və Krımda yaşamış olan Türk xalqının sənət və peşə sahəsində yetişmələrinə, əxlaqi istiqamətdən inkişaflarını təmin edən bir sistemin adıdır. Bu təriflərdən yola çıxaraq əxi sözünün, qardaş, yoldaş, yar, dost, igid mənasını verdiyini söyləyə bilərik. Əxilik həm ictimai, həm də mədəni strukturlara aid bir termin olaraq; bir-birini sevən, bir-birinə hörmət edən, kömək edən, kasıbı güdən, yoxsulu saxlayan, işi müqəddəs və ibadət sayan, din və əxlaq qaydalarına möhkəm bağlı olan tacir və sənətkarların iş təşkilatı mənasını verir. Öz içərisində düzgünlük, qarşılıqlı yardım və hörmət əsasında hərəkət edərək Türkiyənin ticari və iqtisadi həyatında böyük rol oynamış ustalar, şəyirdlər, qısacası sənətkarlar yetişdirmiş və yetişən bu biznesmen tək tərəfli fayda təminatı ilə hərəkət etməmişdir.

**ƏXLAQ** [ər. أخلآق]- ictimai şüur formalarından biri. [alm. – Moral, ing. Morals]. 1. Müəyyən bir zaman ərzində məlum ictimai qrup, yaxud insan kütləsi tərəfindən mənimsənilən, şəxslərin bir-biri ilə əlaqələrini sistemə salan, nizamlayan ənənəvi davranış qaydalarının, qanunlarının cəmi; yaxud müxtəlif cəmiyyətlərdə və zamanlarda əhatə dairəsi və məzmunu dəyişən əxlaqi dəyərlər məcmusu. 2. Eyni zamanda fəlsəfənin bir qoludur. Ərəbcədəki xulq [خلق] sözünün cəmidir.

**ƏHALİ** [ər. أهآل] – Özünün həyat fəaliyyətini müəyyən sosial birliklərin: bütövlükdə bəşəriyyətin, ölkələr qrupunun, ayrı-ayrı ölkələrin, həmin ölkələr daxilində konkret yaşayış sahələrinə

qədər müxtəlif məhəlli bölmələr çərçivəsində həyata keçirən insanların məcmusu.

**ƏXBƏRİLİK [**ing. Akhbariyya; ər. أخبار**]** - Şiə məzhəblərindən biri; yalnız hədislərə yəni şiə imamlarının dedikləri sözlərə və bunlar haqqındakı rəvayətlərə istinad etməyi tələb edən ənənəçilər. Ərəbcədə “xəbər” [خبر] sözünün cəmidir. Hərfi mənada əxbar – xəbərlər deməkdir.

**ƏZGİ** – əski türkcədə müxtəlif mənalar verirdi. 1- yaxşı, yaxşılıq, 2- uyum, ahəng, 3- əzab, üzüntü, 4- nəğmə, xoş səda.

# F

**FAKT** [alm. Faktum; fr. Fait; ing. Fact; lat. Factum – edilən, həyata keçirilən; osm. tr. vakia; ər. واقعة; tr. olgu] – fikirdə olanın əksi, baş vermiş olan, həqiqi olan, həqiqətə çevrilmiş olan. Dilimizdə işlək ifadə kimi vaqiə sözü də işlənməkdədir. Vaqiə sözü vaqəa-dan [وقع] gəlir və hərfi mənada olan , baş verən deməkdir. Türkcədəki ol+gu sözü də qədim oğuzcadakı ol felindən qaynaqlanır. Misal üçün, müqayisə et: Olana çarə yoxdur = Hadisə 1890-cu ildə uzaq bir mahalda vaqe oldu. *Obyektiv və elmi fakt* anlayışları bir-birindən fərqləndirilir. Obyektiv fakt insan fəaliyyətinin və ya idrakının obyektini dərk edən müəyyən hadisəni, təzahürü, reallığın parçasını başa düşmək kimi qəbul olunub.

**FANTAZİYA** [alm. Enbildung, phantasie; fr. Fantasie; ing. phantasy; lat. = yun. – phantsia; osm. tr. hayal; ər. خيال] – qarşılığında bir reallıq olmayan mənzərəli görüntü. Fantaziya, xəyal, görüntü sözləri ilə eyni anlamlarda Azərbaycan türkcəsində rast gəlinir. Misal üçün: Gözümə nəsə göründü. Xəyalın gözlərimdə canlandı. Fantaziyalarımın qurbanı oldum.

**FASİQ** [فاسق] – imanlı adamın kafirliyi. Yəni küfür və iman arasında olan şəxs. Bəzi məzhəblərə görə, fasiq olan kəs tövbə etmədən ölərsə, əbədi olaraq cəhənnəmə gedər**.** Fəsəqə [فسق] sözündən törəmişdir. Onun failidir [subyekt, işgörən mənasında]. Fisq [فسق] isə Haqq yolundan ayrılma, üsyan etme, günahkarlıq, suç hesab olunur.

**FATALİZM** [alm. Fatalismus alm; fr. Fatalisme; ing. Fatalism; osm. tr. cebriyel; at**.** fatalis – tale, qismət] – anti-dialektik dünyagörüşü konsepsiyası. Hər şeyin alınyazısına əsasən əvvəlcədən təyin olunmuş olduğuna, insanın bu əvvəlcədən müəyyən olunmuş olan alınyazısını dəyişdirə bilməyəcəyinə inanan dünyagörüşü. Bu konsepsiyaya görə aləmdə baş verən bütün proseslər azadlığa, yaradıcılığa imkan verməyən zərurətə tabedir və əzəldən müəyyən edilmişdir.

**FAŞİZM** [ital. Fascio – birlik, dəstə] – maliyyə kapitalının ən mürtəce, şovinist, imperialist ünsürlərininaşıq terorçuluq diktaturası. Faşizmin hakim olduğu Almaniya ən yeni tarix ərəfəsində II dünya müharibəsinin törənməsinə səbəb oldu.

**FƏHM** – [فهم] ağıl, düşüncə, təfəkkür. Fəhm etmək – düşünmək, təfəkkürə dalmaq mənasını verir. Sözün kökü *fəhimə* [فهم] -dir. Dilimizdə anlam mənasında çox işlətdiyimiz “*məfhum*” (مفهومٌ) sözü də bu kökdən törəmişdir. Ərəbcədə hərfi mənada “başa düşülən” deməkdir.

**FATALİZM** [fatalisme - Qədərə inanma – Cəbriyyə [جبريّة] - Yazgıcılık] – Bütün hadisələrin aləmin üstündə var olan bir qüvvət və ilk səbəb tərəfindən, dəyişməsi mümkün olmayacaq formada əvvəlcədən təsbit və təyin edilmiş olduğuna inanan görüş. İngiliscədə fate – tale, qədər deməkdir. Qədərə, taleyə alın yazısına inanmaq istər Qərb, istərsə də Şərq dünyasında mövcud olmuşdur. Şərqdə Cəbəriyyə adlı bir cərəyanda mövcud olmuşdur.

**FAYDALILIQ** [alm. Utilitarismus; fr. Utilitarisme; ing. Utilitarism; lat. Utilis – fayda, yarar; osm. tr. nefiye; ər. نفعيّة] – yararın, faydanın həyat ideyasına, amalına çevrilməsi. Əxlaqi fəa-

liyyət və davranışlarda faydanan ideya. Anlam olaraq *pozitivizmlə* bəzi oxşar tərəfləri mövcuddur.

**FENOMEN** [alm. Erscheinung, phänomen; tr. Görüngü; ing. Phenomenon; appearance; tun. Phainomenon; osm. tr. hadise; ər. حادثةٌ] – ümumiyyətlə hisslərlə dərk edilən hər şey. Hadisəolan, zahir olan, yaxud müşahidəsi mümkün olan, idrak ediləbilən, mövcud olana müqabil görünən şey. *Fenomen* [fr. Phénomène; ing. Phenomenon; ər. تظاهرٌ; yun. Phainomenon – təzahür edən, aşkara çıxan] – təcrübədə bizə verilmiş, hisslərin köməyilə dərk olunan hadisəni ifadə edən anlayış. Fenomenalizm – idrak haqqında təlim; duyğuların bilavasitə idrakın obyektindən ibarət olması tezisini əsas tutur.

**FENOMONEOLOGİYA** [alm. phänomenologie; fr. Phenomè-nologie; ing. Phenomenology; tr. Görüngübilim; yun. Phainomenon] – təzahürlər haqqında təlim, əslində fenomenologiya. Yunanca Phainomenon – görüntü, təzahür, logos – təlim, doktrina. Husserd və şagirdləri tərəfindən [L.Landqrebe, E.Fink və b.] əsaslandırılmış və müasir fəlsəfəyə təsir göstərmiş subyektiv idealist cərəyan

**FƏNA** – [فنأء] fəna, yox olma, ərimə, itmə. sufi məqamlarından biridir. Hərfi mənada yox olma, heçliyə qovuşma deməkdir. Sufinin Tanrıya doğru yüksəldiyi məqamda şüurunu itirərək, mənliyindən keçməsi və Tanrıda əriyib getməsidir. Maddi varlıktan sıyrılıp Hakk'a ulaşma. Fəna halı bir sufinin Allaha yaxınlaşmasında ən üstün dərəcələrdən biri hesab olunur. Fəna kəlməsi adətən, bəqa kəlməsi ilə bir işlədilir. Misal üçün fəna fi-llah bəqa bi-

llah [فناء في آلله بقآء بآلله]. Fəna mülkü [Fəna şəhəri]: müvəqqəti dünya, öz varlığından keçmə.

**FƏQİH** [فقيه] – fəqih, hüqşünas. Şəriət hökmlərini bilən, İslam hüququna bələd olan kəs deməkdir. Termin olaraq isə Allah-təala-nın vəhylə bildirdiyi əmrlərindən və peyğəmbərin hədislərindən dini hökmlər çıxara bilən, bu hökmlərlə məşğul olan şəxsə deyilir.

**FƏR** [فرع] – bölmə, şöbə. əsas olanın bölmələri, onu təşkil edənlər**.** Sözün kökü fərə`a dən gəlir.

**FƏRZ** [فرز] – dinin yerinə yetirilməsini vacib hesab etdiyi ibadətlərə deyilir. Fərzi yerinə yetirən şəxs savab qazanar, onu üzürlü səbəbdən yerinə yetirməyən isə axirətdə cəzalandırılar. Fərzin iki növü var. Sözün kökü ərəbcədəki fərəzə-dən gəlir, lazımlılıq, vaciblik deməkdir.

**FƏSAD** [فساد] – olmayan, yaxud yox olan şeylərə deyilir. Fəlsəfi terminologyada "kövn" sözünün ziddidir. "Fəsədə" [فسد] yox olmaq, ortadan itmək mənasına gəlir.

**FƏSAHƏT** [فساهة] – açıqlıq, aydınlıq, dilin səlisliyi. Fəsahətli danışma. Fəsahət tələffüzün açıqlığına, səlisliyinə deyilir. Səlis, gözəl danişan natiqə isə "fasih" deyilirdi.

**FƏLƏK** [**فلكٌ**] **–** göy üzü, səma, qədər, taleh, bəx mənalari da vardir. Fələk sözü ilə bəzən dini-fəlsəfi ədəbiyyatda göyün qatları da nəzərdə tutulur. Suryanicə olan fələk kəlməsi tale, qismət, gələcəkdən xəbər vermək, kahinlik etmək [kəhanətdə olmaq] mənalarında da işlədilir. Cəmi "əflak"dır [أفلاك].

**FİNALİZM** [ру. Финализм; alm. Finalismus; fr. Finalisme; ing. Finalism; osm. tr. gaiye; ər. غايِّة] – hər şeyin bir məqsədlə müəyyənləşdiyini, bir məqsədə yönəldiyini, yaxud hər şeyin bir

məqsədyönlülük qaydasına görə olub-bitdiyini qəbul edən görüş. Sözün kökündə final sözü son, axır deməkdir.

**FİRAQ** [فراق] – yrılık, ayrılma, kader, hüzün. Sözün kökü ərəbcədəki fərəqə-dir. Hərfi mənada ayırmaq, bölmək deməkdir. Furqan [فرقان] sözü də buradan əmələ gəlmişdir. Bu söz Quran-i Kərim haqqında işlədilir. Sözdən məqsəd də yaxşıyla pisi, doğru ilə yalnışı, haqq ilə batili ayırd edən deməkdir. "Təfqiqə" sözü də buradan əmələ gəlmişdir, ayrılıq, bölücülük deməkdir.

**FİTRİ** [alm. Angerbaren; fr. Innè; ing. Innate; osm. tr. vehbi, fitri; ər. فتري] – hər hansı bir varlığın təbiətində olan, var olandan sonra özünün qazandığı öyrənilmiş şeylərin nəticəsi olmayan, anadanolma özü ilə var olan. Fitrət [ər. فترة] isə yaradılma, xəlq olunmaq deməkdir. Bəzən də insanın anadangəlmə xasiyyətlərinin məcmusu mənasında da işlədilir.

**FƏTVA / fitva** [فتوى] – hökm, fitva, qanun. Daha çox dini-fəlsəfi mətnlərdə qarşılaşılan termindir. Ərəbcədən hərfi mənada görüşünü, məsləhətini almaq yaxud kiməsə məsləhət vermək anlamındadır. İslam dinində xüsusilə İslam hüququnda dini məsələlərlə əlaqəli, bu məsələlərdən başı çıxan, yaxud məsul tutulan şəxsin verdiyi hökm və qanunlara deyilir. İslam dövlət modelinə xas olan bu cəhət şəhərlərdə və bölgələrdə dini məsələlərə, şəriətə nəzarət edən qazılar, mollalar tərəfindən verilirdi. Müasir dünyamızda fitvaların sayı demək olar ki yox dərəcəsindədir. Müftü sözü də buradan əmələ gəlmişdir. Kəlmə olaraq mənası fətva verən deməkdir.

**FEODALİZM** [ру. Феодализм; lat. feodum – malikanə] – ümumdünya tarixi tərəqqinin gedişində ictimai-iqtisadi forma-

siyaların əvəz olunmasından ibarət bütöv dialektik prosesin orta həlqəsini təşkil edən ictimai-iqtisadi formasiya. Orta əsrlər dövrü üçün xarakterikdir.

**FETİŞİZM** [alm. Fetischismus; fr. Fètichisme; ing. Fetichism; tr. Tapınakçilik; ər. ألبوذيّة, portuqalca feitice – cadugərlik] – maddi şeylərə səciyyəvi sosial keyfiyyətlər aid edən, mədəniyyətin yaratdığı xassələri isə təbiətə aid bir şey kimi nəzərdən keçirən ictimai [iqtisadi, ideoloji və i. a.] münasibət və buna uyğun baxış.

**FƏAL** [ər. فعال] – aktiv, Çox çalışan, çalışqan, canlı, hərəkətli, aktiv. *Fəaliyyət* [ər. فعالية]– aləmə yanaşmanın səciyyəvi üsulu, predmet üsulu; elə bir prosesdir ki, bunun gedişində insan təbiəti təcəssüm etdirir və yaradıcı sürətdə dəyişdirir, bununla da özünü fəal subyektə çevirir və mənimsəməkdə olduğu təbiət hadisələrini öz fəaliyyətinin obyektinə çevrilir.

**FƏLSƏFƏ** [alm.=fr. Philosophie; ing. Philosophy: yun. Philia – sevgi və sophia – bilik, hikmət] – istər varlığın [yəni təbiət və cəmiyyətin], istərsə də insan təfəkkürünün, idrak prosesinin tabe olduğu ən ümumi qanunauyğunluqlar haqqında elm.Var olanların varlığı, mənası və səbəbləri haqqında ortaya çıxan sualları cavablandırır. İlk əvvəllər bu suallara dindən və müdriklərin söhbətlərindən cavab tapmağa çalışırdılarsa, fəlsəfə onları daha doğru və ətraflı cavablandırdı. Fəlsəfə terminінə ilk dəfə Pifaqorda təsadüf edilir. Xüsusi elm kimi onu ilk dəfə Platon işlətmiş və onu fərqlənmişdir. Fəlsəfə formalaşmış bir elm kimi quldarlıq cəmiyyətində meydana gəlsədə feodalizmdə fəlsəfə demək oalr ki özünün zirvəsində olmuşdur. İlkin fəlsəfi

görüşlərin Şərqə məxsus olmasına baxmayaraq, fəlsəfə sistemli bir elm kimi ilk dəfə Yunanıstanda öyrənilməyə çalışlımışdır.

Filo" və "sofiya" yunan sözləridir. "Sofiya" hikmət, "filo" isə sevmək deməkdir."Filosofiya" - "hikməti sevmək" mənasını verir. "Fəlsəfə" isə orta əsr şərq alimlərinin bu yunan sözünü ərəb dilinə uyğun demələrindən yaranıb. Ərəblər filosofa feyləsuf deyirlər. İlk dəfə Pifaqor özünü "filosof" adlandırıb və "*Mən öz yerimi bilirəm. Bilirəm ki, hikmət yalnız Tanrı biliyidir və məndə ola bilməz. Mən ancaq hikməti sevə bilərəm*" deyib.

**FƏRD** individuum [lat. individuum – bölünməz] – Obyektlərin müəyyən növündən, cinsindən və ya sinfindən seçilib ayrılmış təkcə, ayrıca obyekt.

**FİDEİZM** [fr. Fideisme, lat. fides – etiqad, inam] – elmi dinə tabe etməyə, elmi biliklərdən dini ehkamların müdafiəsində istifadəyə çalışan mürtəce təlim. Fideizm – inanma, möminlik: Məlumatı ilahi vəhyə və imana dayandıran fəlsəfi görüş. Daha çox irrasional bilikləri və informasiyanı əsaslandırmaq üçündür. Fideistlərə görə insanın qəbul etdiyi rasional biliklərə irrasional biliklər də daxil edilməlidir. Bu səbəbdən *vəhy* ilahi biliyi təmsil edir və bizə həm bilmədiyimiz həm də əldə edilməsi qeyri-mümkün olan məlumatları çatdırır.

**FİNİTİZM** [ing. finitisme; lat. finitus – müəyyən, məhdudlaşdırılmış, bitmiş] – Sonsuzluq kateqoriyasının [sonsuz və sonlu] obyektiv real məzmununu inkar edən fəlsəfi kateqoriya; bu kateqoriya onu əsas tutur ki, nə kainatda, nə mikroaləmdə, nə də təfəkkürümüzdə sonsuzluq mövcud deyil. İngilis dilində “finish” sözü də eyni kökdəndir, son, axır deməkdir.

**FORMA** [alm. Form; fr. Forme; ing. Form; lat. Forma; yun. Morphe, eidos. osm. tr. suret; ər. صورة] - Şeyin xarici görünüşü, şəkli. Bir şeyin məzmununu ifadə etmək üçün istifadə olunan bədii vasitələr sistemi.

**FORMALİZM** [alm. Formalismus; fr. Formalisme; ing. Formalism; osm. tr. şekliye; ər. شكلية] - İşin mahiyyəti zərərinə olaraq, onun ancaq zahiri cəhətinə riayət etmək.

**FREYDİZM** – psixoanaliz nəzəriyəsinin və metodunun adı. Z.Freydin [1856-1939] adı ilə adlandırılmışdır. Psixologiya və psixopatologiyada insanın bütün hərəkətlərinin başlıca amilinin yalnız qeyri-şüuri bioloji instinktlər və meyillər olduğunu iddia edən, insanların həyatında sosial momentləri hesaba almayan və onların şüurlu fəaliyyətinin rolunu azaltmağa çalışan cərəyan. Freydizmin müasir tərəfdarları. Klassik freydizmin metodoloji xüsusiyyətləri.

**FUNKSİYA** [alm. Funktion; fr. Fanction; ing. Function; osm. tr. üfule, vazife, tr. Görev; ər. وظيفة, ألعمل lat. functio – icra, yerinə yetirmə] – Mövcud münasibətlər sistemində hər hansı bir obyektin xassələrinin xarici təzahürü; məs., orqanizmdə hiss orqanlarının funksiyaları, pulun funksiyaları, cəmiyyətdə dövlətin funksiyaları və i.a.

**FUNKSİONALİZM** (ing. functionalism) – sosioloji tədqiqatlarda və biologiyada yayılmış konsepsiya; cəmiyyətin təşkilinin təhlilinə yanaşmaların geniş spektrini əhatə edir; başlıca cəhət cəmiyyətin bir hissəsinin digər hissəsinə və ya daha böyük sosial sistemə inteqrasiyasını və ya adaptasiyasını təmin edən tamın müəyyən aspektinə münasibətdən ibarətdir.

**FUTUROLOGİYA** [ing. Futurology; lat. futurum – gələcək, logos – təlim, söz] – bəşəriyyətin gələcəyi haqqında təsəvvürlər, sosial proseslər perspektivlərini əhatə edən biliklər sahəsi.

**FÜYUZAT** (**فيوضات**) – həftəlik ictimai-siyasi, ədəbi-tənqidi jurnal, 1906-cı il noyabrın 1-dən 1907-ci il noybrın 1-dək Bakıda Azərbaycan dilində nəşr edilmiş, 38 nömrəsi çıxmışdır. Kəlmə olaraq "feyz"dən əmələ gəlmişdir. Mənası dolub daşmaq, su basmaq, ətrafa axmaq deməkdir.

**FÜZULİ** [فضولي] – boş, mənasız, cəfəng. Əslində orijinal ərəb dilində maraqlı, hər şeylə maraqlanan, hər işə qarışan kəs deməkdir. Fəzilət sözü də buradan əmələ gəlib. Füzuli sözü fəzlin nisbi sifət halında olan formasıdır. Fəzilət, əfzəl, fazil sözləri eyni kökdən gəlmişdir. Məşhur Azərbaycan şairi və filosofu Məhəmməd Füzulinin də təxəllüsü buradandır.

## İ

**İDEYA** [yun. Idea – anlayış, təsəvvür] – “Məna”, “əhəmiyyət” və “mahiyyəti” ifadə edən, təfəkkür və varlıq kateqoriyaları ilə sıx bağlı olan fəlsəfi termin. **İDEA** [alm. İdee; fr. Idèe; ing. Idea; yun. Idea = idein – görmək; osm. tr. fikir, misal; osm. tr. mefjurevi; ər. ألفكر] – Fikir-Misal: Platonda dəyişməyən öz, əşyanın ilk nümunələri. Dilimizdə ideya sözü geniş içlənməkdədir, misal üçün: ağlıma bir ideya gəldi, yaxud fikir gəldi.

**İDEAL** [alm. Ideel; fr. Idèal, ideal; ing. Ideal; osm. tr. iftikari; ər. إفتكاري; tr. düşüncel] – həqiqətdə real əsası olmayıb, ancaq düşüncədə qurulan, dizayn edilən şey. Yaxud da düşüncə ilə qavranıla bilən. İdeallıq isə obyektiv həqiqəti olan varlığın qarşısında ideal yaxud da qurulan bir varlıq anlayışıdır. İdeal sözü bəzən oxşarı-bənzəri olmayan, öz cinsində tam mükəmməl olan, hər şeyi yerli-yerində olan mənasını da ifadə etməkdədir. *İdeal***,** hər hansı sosial qrupun səy və fəaliyyətinin son məqsədi, ən mükəmməl ictimai quruluş haqqında həmin sosial qrupun iqtisadi və sosial qrupun ictimai sosial mənafelərinə uyğun gələn təsəvvür.

**İDEALIZM** [alm. Idealismus; fr. Idèalisme; ing. Idealism; osm. tr. mefkurecilik; iftikariyye; ər. إفتكاريّة; yun. İdealisme] – fikirçilik-təsəvvürçülük: ideallıq, bir ideyaya bağlanmış olan və bu ideyadan fayda güdmədən bağlı qalan, düşüncənin əsl həqiqət olduğunu, bütün gerçəklərin əsası olduğunu, maddənin və əşyanın, zehin və düşüncənin bir məhsulundan ibarət olduğunu irəli sürən fəlsəfi bir baxımdır. İdealizm – fəlsəfi cərəyandır. İdealizm ruhi olanın, qeyri-maddinin birinciliyi və maddi olanın

ikinciliyi prinsipindən çıxış edir ki, bu da onu aləmin zamanca və məkanca sonlu olması və Allah tərəfindən yaradılması haqqında dini ehkamlara yaxınlaşdırır.

Hər hansı bir ideyaya bağlı olan, sadiq qalan və onu müdafiə edənlərə, yaxud həmin ideyanın əsasını qoyanlara ideoloqlar deyirlər. İdeologiya [alm. Ideologie; fr. Idèologie; ing. Ideology; osm. tr. ilm-i süver-i akliye; ər. إديولوجي] – terminin yaradıcısı Destut de Trasiyə görə ideologiya "ideyaların elmi"dir.

**İDOLA** [alm.=ing. Idol; fr. Idole; lat. Idola; yun. Eldoion; osm. tr. sanem; put, imge]. F.Bekonun "Yeni orqanon" əsərində istifadə etdiyi anlam. Insanın təbiətində yerləşən yaxud da sonradan qaznılmış olan və əsl biliyə mane olan prinsiplər.

**İMAN** [alm. Glaube; fr. Crayance; ing. Belief; osm. tr. Itikat, iman; ər. إيمان] – Bir şeyi etimadla doğru qəbul etmə halı; bu mənada; kifayət qədər vacibliyi olmayan; dəqiq olmayan bir şeyi doğru qəbul etmək; əqllə ümumi bir dəqiqlik aparmadan başqasının şahidliyi üstündə qurulan, sübutları olmadan, amma heç bir şübhə duymadan təsdiq etmək. Səmavi dinlərdə (yəhudilik, xristianlıq, islam və s.) iman Allaha ona heç bir varlığı şərik qoşmadan yaradıcı olduğuna, hər şeyi idarə etdiyinə, mütləq həqiqət, mütləq yaxşı olduğuna, əzəli – əbədi olduğuna inanmaqdır. Tanrının varlığı ilə birlikdə səmavi dinlərdə iman əsasları da mövcuddur. Onlardan peyğəmbərliyə, axirət dünyasının mövcudluğuna, qəzavü-qədərə, mələklərə, kitablara imanı sadalamaq mümkündür. Bunlar səmavi dinlərin bütövlükdə mahiyyətini təşkil edir. Sözün kök ərəbdə "əmənə" sadə felidir.

Buradan “təmin”, “təminat”, “əmanət”, “əmin” sözləri də törəmişdir.

**İMMANENT** (os.tr. mündemiç; ər. مندمج; ing. Immanent; tr. içte bulunan) – Allahı aləmin içində, aləmlə birlikdə qəbul edən fəlsəfi görüş.

**İMMATERYALİZM** [ing. Immeterialisme; fr. Immaterialisme; ru. имматертализм] – qeyri-maddilik. Materi-alizmin ziddi olan bu görüş, aləmin öz-özünə təsəvvürlərimiz və fikirlərimiz xaricində bir həqiqəti olmadığını irəli sürür. Kök olaraq ingiliscədəki im+materia+ism formasındadır. Sözün kökünün əvvəlinə -im prefiksi və sonuna da -ism sufiksi artırılmışdır.

**İMPERATİV** [alm. Imperativ; fr. Impèratif; ing. Imperative; lat. Imperativum; osm. tr. emir; ər. امر] prinsip, şərt, əmr. Kanta görə fərdi ideyaların [maxim] qarşısına qoyulan obyektiv keçərli və hər hansı bir fəaliyyətin vacibliyini dilə gətirən əxlaqi prinsip. İmperativlər iki cür olur. Qəti imperativlər və qəti olmayan imperativlər.

**İMZA** [alm. Zeichen; fr. Signe; ing. Sign; lat. Signum; osm. tr. işaret; ər. إمضاءٌ] – bir başqa şeyi göstərən, bir şeyi anladan, dilə gətirən şey, idrak ediliyi zaman əslində başqa bir məfhumu xəyalımızda canlandıran şey. Misal üçün dini – fəlsəfi ədəbiyyatda “gördüyümüz və var olduğunu bildiyimiz hər şey Tanrının imzasıdır.” cümləsilə çox qarşılaşırıq.

**İNDETERMİNİZM** [Alm. Indeterminismus; fr. Indete`rminisme; ing. Indterminisme; lat. In-de-terminare – sərhəd qoyma, hədd qoyma. osm. tr. laicabiyyə, ər. لأجابية indeterminisme] – qeyri-müəyyənlik, determinizmin ziddi olan bir fəlsəfi

görüşdür.1. Ümumi olaraq səbəbiyyət qaydasına bağlı olmayaraq bir səbəbə bağlı olmayan hadisə və vəziyyətlərin də mövcudluğunu irəli sürən görüş. 2. Xüsusi olaraq isə əxlaq fəlsəfəsində insan istəyinin heç bir qeydə - şərtə bağlı olmadığını, içində olduğu şərtlərlə müəyyənləşmədiyini, insanın müstəqil səbəbiyyət qaydasına bağlı olmadığını iddia edən görüş. İndeterminizmin kökü əslində "determine" kəlməsidir, kəlmənin əvvəlinə sözə inkarlıq verən –in prefiksi, axırına da konsepsiyaları, nəzəriyyələri ifadə edən –ism sufiksi artırılmışdır.

**İNDİVİDUALİZM** [alm. Individualismus; ing. Individualism; osm. tr. ferdiye; ər. **فردية**]. Ümumiyyətlə hamıya olmayıb əslində tək şəxsə üstünlük verən və ona istinad edən görüş, düşüncə şəklidir. İndividualizm bəzən insanın özünün görüşlərinə istinad etməsi təmayülünə də deyilir. Metodologiyada tarixi və ictimai hadisələrin açıqlanmasını şəxsin mənəvi dünyagörüşünə əsaslandıran görüş hesab edilir. Individualizə etmə, yəni fərdiləşdirmə isə ümumi deyildə olanı şəxsi vəziyyətə çevirmə fəaliyyətinə deyilir.

**İNFORMASİYA** [alm= fr= ing= information; ər. **معلومة**; tr. bilişi] – Komputerə daxil edilən, onda saxlanılan yaxud istehsal olunan bilik, məlumat. Mənşəcə ingilis sözüdür. Sözün kökü form, in – prefiks, tion isə sufiksdir. Inform hərfi tərcümədə məlumat, informasiya anlamına gəlməkdədir. Dilimizdə məlumat sözü çox geniş işlənməkdədir, ərəbcədən keçmişdir. İnformasiya sözü isə daha müasirdir. *İnformasiya* ifadə formasından asılı olmayaraq insanlar, canlılar, cansızlar, faktlar, hadisələr, proseslər və s. haqqında olan məlumat və biliklərdir. Biliklər isə müəyyən faktlar və onlar arasındakı asılılıqlar şəklində ifadə olunur. İnfor-

masiyanı yaratmaq, ötürmək, saxlamaq, emal etmək mümkündür (biz bunu informasiya texnologiyası kimi komputerdə həyata keçiririk). İnformasiya təbiətdə siqnallar şəklində ötürülür və iki tipə ayrılır: *analoq* və *rəqəmli*. İnsanlar öz hissiyyat üzvlərinə görə analoq, kompyuterlər isə rəqəmli informasiyaların köməyilə fəaliyyət göstərir.

**İNNEİZM** [fr. Inneismeing. Ing. Inneism; ру. Иннеизм; əг. **فترتيّة**; osm.tr. fitratçilik] – fitrətçilik: Sonradan qazanılmış olanın ziddi olan, yəni fitri doğuştan olan. İnsanda xarakterik xüsusiyyətlərin fitrətdən onunla bərabər doğulmasına, nəsli xüsusiyyətlərin qabardılmasına istiqamətlənmiş fikirlər, iddialar inneizmin əsas mahiyyətini təşkil edir. Bu səpkidə misal üçün, filosoflar insanda fitrətdən onun mahiyyətində olan Allah axtarıcılıq ideyasını göstərirlər. Çünki insanda Allahı axtarıb tapmaq, ona itaət – ibadət etmək ideyası anadangəlmədir.

**İNTELLEKTUALİZM** [ing. Inttelectualisation; fr. Intellectualisme] – zehniyyət: Prinsip olaraq hər şeyin zəkaya, zehni ünsürlərə bağlanacağını, onlarla əlaqələndiriləcəyini qəbul və iddia edən fəlsəfi görüş. Dilimizdə intellektual sözünün əvəzinə daha çox ziyalı ifadəsi işlənir. İntellektualizmi isə daha çox ziyalılıq sözüilə əvəz etmək mümkündür. Bundan başqa müasir dönəmdə zəka sözü, ağıl, dünyagörüşü sözlərini daha çox dilimizə yeni transfer edən "intellekt" termini işlənməkdədir.

**İNTUİSİYA** [alm. Anschauung; fr.=ing. Untuition; lat. Intuitio-intuius. In tueri – daxilini görmə; osm. tr. tehaddüs, hads; ər. حدثٌ] – nəyinsə qəflətən açılması, bir əlaqənin birdən, birbaşa vasitəsiz kəşf edilməsi, yaxalanması. İntuisiya insandan əslində

hisslərin fövqündə olan bir qabiliyyət tələb edir, çünki bəzən bəzi şeyləri duymaq və hiss edib qavramaq üçün intuisiyaya əsaslanmaq lazım gəlir. İntuisiya vasitəsiz qavramaq, ani olaraq başa düşmək, bir şeyin daxilini birbaşa görmək, həqiqəti bilavasitə anlamaq, dərk etmək qabiliyyəti kimi də xarakterizə etmək olar. İntuitiv [alm. Intuitiv; fr. Intuitif; ing. intuitive] isə hər şeyi bir anda ələ keçirməyə, qavramağa istiqamətlənən düşüncə tərzidir. İntuitivizm – imperializm dövrünün burjua fəlsəfəsində geniş yayılmış idealist cərəyan.

**İNTUİSYONİZM** – [alm. Intuitionismus; fr. Intuitionisme; ing. Intuitionism, intuitionalism; osm. tr. tehaddüsiye; ər. تحدثيّة], intuitizmə əql, mənalı düşüncə qarşısında üstünlük verən, intuisiyanı biliyin, xüsusilə də fəlsəfi biliyin əsası olaraq görən təlim. Müşahidəçilik, həds məsləyi. Bir münasəbətin birdən və birbaşa kəşfedilməsi mənasına gələn intuisiya, elmin vasitəsilə olan zəka və ağıldan əlavə olaraq bilmə qabiliyyti olan sezgi və obyektlərə, həqiqətin özünə və mütləq surətdə vara biləcəyini irəli sürür. Kəlmənin kökü intuisiyadan qaynaqlanır. İntuisionizm həm də riyaziyyatın fəlsəfi əsasını təşkil edən cərəyanlardan biridir.

**İNSAN** [alm. Mensch; fr. Homme; ing. Man; lat. Homo; yun. Anthropos; ər. أنسآن; tr. Insan, adem evladı] - əqli olan canlı varlıq. Bir tərəfdən canlı varlıqlar, heyvanlar aləminin bir üzvü, növü. Digər tərəfdən isə onu keçən bir varlıq, qamətli yürüyən, əllərindən istifadə edən, beyni, kəlləsi xüsusi formada inkişaf etmiş olan, xüsusiləşmiş orqanları olmayan, ətrafını dəyişdirə bilən, dünyaya və kainata açıq olan, danışan və yaradıcı düşünmə qabiliyyəti olan, təcrübə dünyasını aşa bilən, özünün və kainatın

şüuruna vaqif olan, əməllərindən məsul tutulan sosial varlıq. İnsan sözü bir termin kimi dilimizə ərəbcədən keçmişdir. Lakin indi çox geniş istifadə hüququna malikdir. İnsan sözü orijinalda “nəsiyə” (نسي) felinin “ənsə” formasında (أنسى) IV babda məsdəri olduğunu iddia edənlər vardır. Bu anlamda “insan” sözünün hərfi mənası unudan, unutqan demək olur. Lakin bu iddia yalnışdır. Çünki insan sözü əslində “ənisə” (أنس) felindən əmələ gəlmişdir. “Ənisə” sözünün hərfi mənası isə səmimi olmaq, cana yaxın olmaq, sosial olmaq, ictimailəşmək deməkdir. İnsan sözü isə bu felin məsdəridir, nisbi sifətdir – humanist, bəşəri anlamlarına gəlir.

**İNSTRUMENTALİZM** [alm. Intrumentalismus; fr. Istrumentalisme; ing. Intrumentalism; lat. Instrumentum – vasitə, alət] - Düşünmə formalarının, qaydaların, məntiq və əxlaq formalarının yalnız həyatın müxtəlif şərtlərinə uyğun əmələ gəlmə vasitələri Amerika filosofu Dyuinin və davamçılarının subyektiv-idealist təlimi.

**İSTİNBAT** (ər. إستنبط)- Bir hökümdən başqa bir hüküm çıxarmaq. Hərfi anlamda “nəbata” (نبط) su çıxartmaq, yetirmək mənalarını verir. İstinbat – nədənsə nəyi çıxartmaq, doğurmaq anlamlarını verir. Amma sözün mahiyyətində olan kəşf etmək, çıxartmaq anlamı əslində asanlıqla görülməyən, bilinməyən nəyisə fərqləndirmək, tapıb ortaya çıxartmaq üçün işlədilir. İstinbat orta əsrlər İslam bölgəsi fəlsəfəsində filosofların ən çox baş vurduqları metoldoloji üsula uyğun gəlir. Nəzəri metodoloji sistem olaraq deduksiyaya uyğun gəlir.

**İSTİYAA** – (ər. إستياع) Allahın canlılarda yaratdığı və canlının özüylə əməllərinin iradi və ixtiyari olaraq işlədiyi şeydir. Şərq peripatetiklərinin fəlsəfi traktatlarında rats gəlinən fəlsəfi termindir.

**İŞRAQ** [ing. illumine; ər. إشراق] – kəşf, işıqlanma, nurlanma, ilham gəlmə. Günəşin doğması [işraq] necə əşyanın görülməsini mümkünləşdirirsə, mənəvi bir kəşf, ilham və ya müşahidə olan İşraq ilə də insan bir cox bacarıq və məlumatı əldə edər. İşraq fəlsəfəsinin Şərq fəlsəfəsində banisi İbn Sina hesab olunsa da, Seyid Yəhya Sührəvərdi əl-Məqtul işraqi filosof kimi dünyada tanınmış və bütün fəlsəfəsini bu yöndə qurmuş, özünəməxsus şəkildə əsaslandırmışdır. İşraq termini ərəbcə işıqlanma, nurlanma, ziyalanma, qəlbinə nur doğma kimi tərcümə edilə bilər. Dilimizdə günçıxan anlamına gələn cəhət adı, Şərq də bu kökdəndir.

**İZAFİ** [ing. Relatif; ər. إضافي] – nisbi, qeyri-mütləq, əlavə. Mütləq [absolut] sözünün bəzi mənalarının müqabilidir. İzafi sözü dilimizdə "əlavə" kimi də mənalandırılır.

**İCTİHAD** [إجتهاد] – [ər] ciddi-vəhd var gücü ilə çalışmaq səy göstərmək dinin əsaslarını bilən din alimlərinin, qazilərin dinin əsasları olan Qurani Kərimə və peyğəmbər hədislərinə əsaslanaraq şəriətə aid məsələlər haqqında hökm çıxarmaları, yaxud bu yolda səy göstərmələri. İctihad sözü dini – fəlsəfi termin kimi bölgənin islamı qəbul etməsindən sonra dilimizdə daxil olmuşdur. Daha çox məhdud çevrədə işlənməkdədir. "Müctəhid", "cihad" da bu kökdəndir.

**İFRAT** (ər. إفراد) – daha çox, həddindən artıq, lazımi səviyyədən çox. Sözün kökündə ərəbcədə "fərd" kəlməsi mövcuddur. İfrat sözünün sonundakı d → t əvəzlənməsi dilimizin

özünəməxsusluğundan irəli gəlir. Bu kökdən münfərid, təfrit sözləri də əmələ gəlmişdir.

**İLHAM** (os.tr. ilham; ru. Вдохновение; ing. inspiration, enthusiasm; fr. Inspiration; ər. إلهام) – ilham. Ezoterik bilik növlərindən biri olub, Allah-təala tərəfindən insanların qəlbinə bir hissin doğması, ona bir xeyirin gəlməsi, vəcdin doğmasıdır. İlham dilimizdə geniş sferada işlənməkdədir. Bəzən şairlər şeir yazma ərəfəsində özlərinə qaibdən gələn yüksək entuzaist halın gəlməsini gözlərlər. Bu əsnada onlarda yüksək poetiik əhval-ruhiyyə yaranır və şeir yazarlar. İlham bəzən problemli bir iş əsnasında problemin həll olunması üçün ağıla anidən gələn fikrə, ideyaya da deyilir. İlham yalnız və yalnız şəxsi təcrübələr əsasında açıqlana, izah edilə bilər. Çünki ilhamlar ümumi eksperiment kimi təkrarən sınaqdan keçirilə bilməz.

**İNZAR** (إنظار) – ortaya çıxma, görünmə. Terminin kökü ərəbcədə "nəzərə" üç hərfli felidir. Dilimizdə çox işlətdiyimiz nəzər sözü də bu kökdəndir.

**İNQİLAB** [alm. Revolution; umwölzung; fr. Revolution; ing. Revolution; tr. Devrim; ər. ثورة, إنقلب] qaləbə [إنفعل - إنقلب]. 1. Daimi ictimai sistemi dəyişdirmə və yenidən formalaşdırma; yavaş inkişafda olan dünyanın ziddinə ictimai həyatda və siyasi vəziyyətdə birdən birə həyata keçən köklü və əsaslı bir dəyişmə. 2. Dünya görüşündə, fəlsəfədə, elmdə, sənətdə və sairlərin fikrində olan dəyişikliklər, köhnəlmiş olanı yenisi ilə əvəz etmək, çevriliş. Fel ərəbcədən keçmə termindir.

**İQTİDA** (ər. إقتداء) – uymaq, tabe olmaq, dini – fəlsəfi terminologiyada hər hansı bir müctəhidin, yaxud məzhəb şeyxinin

dini əqidəsinə uymaq və bundan irəli gələn qanun qaydalara əməl etmək. İqtida edənlərə isə "müqtədi" deyilməkdədir.

**İRŞAD** (ər. إرشاد) – dorğu yolu tapmaq, hidayətə çatmaq deməkdir. Bəzən dini terminologiyada müsəlman olmaq, imanlı olmaq yaxud pis vərdişlərdən çəkinmək mənasını ifadə edən "irşad olunmaq" sözündən də istifadə olunur. İrşad olunan adama isə mürşid deyilir. Sufi ədəbiyyatında geniş çərçivədə rast gəldiyimiz mürid – mürşid sistemi də bununla bağlıdır. Mürid sanki müəllim, mürşid isə şagirddir. Təsəvvüf təlimində mürşidlər öz müəllimlərindən sözü gedən təlimi əxz edənlərdir.

**İSTİDLAL** (ər. إستدلال) – dəlil çıxartmaq, elmi prinsiplərə əsaslanaraq elmi nəticələrə gəlmək. Sözün kök kərflərini "dəl" və "ləm" hərfləri təşkil edir. Dəllə feli ərəb dilində son hərfi təkrar olunan şəddəli fellər qrupuna aiddir. Dilimizdə geniş işlətdiyimiz "dəlil və dəlalət" sözü də burdan əmələ gəlmişdir. İstidlal fəlsəfi termin kimi islam mədəni bölgəsi fəlsəfəsinin dilində geniş rast gəlinir.

**İTKİ** [alm. Impuls. Trieb; fr. Impulsion; ing. Impulse; lat. Impulsio: pulsio – itmək, in-içərisində, qarşı, doğru; osm. tr. əs.tr. ilca; ər. إلجاء] – insanı bir şüur cəhdi lazım gəlmədən yaşama cəhdinə yönəldən, onu özlüyündən fəaliyyətə sürükləyən, tətbiq etmə sahəsini genişləndirən ruhi qüvvələr üçün də istifadə olunur. Kök olaraq əski türkcədən günümüzə qədər gəlmişdir.

**İXLAS** – imanın forması, ixlaq, qurtulma, pisliklərdən arınma. Öz imanına heç nəyi qarışdırmamaq, bidət yollara və vasitələrə baş vurmamaq, riyakarlıq etmədən, özünü göstərmədən, səmimi qəlbdən inanmaq.

**İXTİLAF** – mübahisə, yaxud fikirlərin bir-birinə zidd olması. Hər hansı dini məsələdə fikir ayrılıqlarından doğan məsələ və problem.

**İXTİYARİ** – iradənin istək və arzusuna uyğun olaraq.

**İZHAR** – təzahür, biruzə vermək, ortaya çıxmaq. Aşkar etmə, meydanaçıxarma, göstərmə, bəlli etmə, bildirmə. Bəlli, aydın, məlum. Bir gülüzlü nigar,sərvi-xoşrəftar; *Cümlə xalqa izhar eyləmək – yəni bütün aləmə car çəkmək.*

**İBADİLİK [ər.ألعبأدية ]** – *İbadiyyə.* xaricilikdə ən mötədil təriqət. Həzrət - i Əli zamanında ortaya çıxan Xaricilərin bir qoludur. Qurucusu , Abdullah bin İbad'dır . Bu səbəblə bu adı qəbul etmişlər. Bu adla bərabər, "özlərini Allaha satanlar" mənasında sifət, *Əhlül'Adl vəl- İstiqamət* adlarını da istifadə edirlər. Abdullah bin İbad , Həzrət -i Əli, Həzrət - i Müaviyə ilə, hakim etmək surətiylə razılaşdığı üçün, həzrət- i Əlidən ayrıldı. Trablusgarb'a getdi. Orada İbadiyye firqəsini qurdu. İbadiyyənin qurucusu haqqında dəqiq bir məlumat yoxdur. İbadilər də, onu yalnız təriqətin qurucusu, imamı olaraq tanımaqdadır. Onun , 64 (M.683) ilində İbn-i Zübeyrə kömək etmək üçün Mədinə müdafiəsinə qatıldığı və Əməvi məmurları ilə və xüsusən Əbdülməlik min Mərvan ilə 65-86 (M. 685-705 ) dostluq münasibətləri qurmağa çalışdığı bildirilir. Hazırda siyasi gücü qalmamış olan İbadiyyə firqəsinin, Ərəb Yarımadasının bəzi bölgələrində, Oman, Liviya , Madaqaskar, Cəbri adası və Şimali Afrika ölkələrində mənsubları var.

**İDENTİFİKASİYA** [identificare - eyniləşdirmək] identikləşirmə - müəyyən əlamətləır əsasında müxtəlif obyektlərin eyniyyətinin müəyyən edilməsi.

**İDEOLOGİYA** – siyasi, hüquqi, əxlaqi, estetik, dini-fəlsəfi baxışlar və ideyalar sistemi.

**İDRAK** [**alm.** Warnehmnung; **fr.** Perception; **lat.** Perceptio, trk.alqı; **ər.** إدرآك]– nəyəsə diqqəti yönəldib, onun mahiyyətinə varmaq; nəyinsə şüurlu surətdə fərqinə varmaqdır. İnsanların yaradıcılıq fəaliyyətinin ictimai-tarixi prosesi; bilikləri formalaşdırır və bunların əsasında insanın hərəkətlərinin məqsədləri və motivləri meydana gəlir.

**İDİ** - [İdik] 1- Tanrı, Rəbb, sahib, əfəndi 2- Tanrısal, Tanrıdan gelen, mübarek, kutlu.

**İDİKUT** – idi+Kut...Kut sahibi, Tanrıdan gələn, Tanrıya yaxın, Tanrıya bənzər, Tanrı tərəfindən məsul tutulmuş və s. anlamları ehtiva edən ve Uygur kağanlarının böyük əksəriyyətinin istifadə edildiyi bir unvan.

**İZAH** – insanın idrakının, xüsusilə elmi tədqiqatın öyrənilən obyektin mahiyyətinin aşkara çıxarılmasından ibarət çox mühüm funksiyası və [və müvafiq sürətdə elmi tədqiqatın bu funksiyanın yerinə yetirildiyi mərhələsi].

**İZOMORFİZM** [yun. Isos – eyni olan, morphe – forma] – obyektlərin strukturları arasındakı uyğunluğu xarakterize edən anlayışlar.

**İYERARXİYA** [yun. Hieros – müqəddəs, arche – hakimiyyət] – çoxsəviyyəli mürəkkəb sistemlərdə struktur münasibətlərin

şaquli xətt üzrə ayrı-ayrı səviyyələr arasındakı qarşılıqlı əlaqələrin nizamlılığı, mütəşəkkilliyi ilə səciyyələnən tipi.

**İLLUZİYA** [**lat.** illusio – aldatma,yanılma] – gerçəkliyin təhrif olunmuş qavranılması. İllüziya göz aldadıcı, olanı həqiqət kimi göstərməkdir. Gerçək bir obyektin duyğular üzərindəki hadisəni səhv dəyərləndirilməsidir."İllüziya" latın sözüdür, mənası "yanlış təsəvvür" deməkdir. İllüziya ilə məşğul olana illüzionist deyiirlər. Dilimizdə bu temrin *sehrbazlıq* kimi da işlədilir.İllüzionist beynəlxalq termindir və dünyanın bütün ölkələrində bu cür qəbul olunur. Bir aldadıcı haqqında əvvəlcədən məlumatımız olsa belə heçnə dəyişmir, çünki gözlər yenə aldanır.

**İLHAM [ər. إلهام]**– insanın müxtəlif növ yaradıcılıq fəaliyyəti göstərməsi üçün xüsusi əlverişli olan halı. Ezoterik bilik növlərindən biridir. Bu sözün ərəbcədən istilahi mənası "bir şeyi ani olaraq qəbul etmək" mənasında olub, termin olaraq "qəlbə bəzi məna və fikirlərin ötürülməsi" kimi ifadə olunur. O, "Allahın insanın qəlbinə ötürdüyü şey", "feyz yolu ilə qəlbə ötürülən şey" kimi də başa düşülür . İlham ezoterik bilik növlərindən olub, əsaslı surətdə vəhydən fərqlənir. Səmavi dinlərin (İslam, Xristianlıq, İudaizm) dininin inanc konteksində və sufi mövzularda ilhama nəzər saldığımızda bir ezoterik bilik tipi kimi peyğəmbərlərdən fərqli olaraq, aid olduğu insan təbəqəsinin daha kütləvi xarakter kəsb etdiyi məlumdur. Ayrıca bu da məlumdur ki, ilham bizim başa düşdüyümüz şəkildə, məsələn, hər hansı bir işə başlamazdan əvvəl təbiətimizdə, yaxud ruhumuzda mənəviyyatımızdan doğan təskinlik halı, yaxud işə təşviqdən daha ziyadə dini məntiqə görə "vicdanda anidən ortaya çıxan, qaynağının dərkinin

insanın əqli qabiliyyətlərinin xaricində, yəni idrak olunmayan hiss və həyəcan tipində xarakterizə olunabiləcək bir duyğu növüdür".

**İMMANENT** [tr. Içkin; fr.=alm.=ing. Immanent; lat. Immenens – içərisində qalaraq, içində olaraq, in – içərisində, manere – qalmaq; translens [ifrat]- bir şeyin xaricinə çıxmanın əksi; osm. tr. mündemiç; ər. **مندمج**] -

**İMAMENTLİK** – bu və ya digər predmetə, hadisə və ya prosesə daxilən mahiyət mənasına görə aid olan xassə [qanunauyğunluq].

**İMMORALİZM** [alm. Immoralismus; fr. Immoralisme; ing. Immoralism; tr. Töre tanımazlık; ər. osm. tr. gayr-i ahlakiye; ər. **غير أخلآقيّة**] - əxlaqi dəyərlərə, adət ənənələrə və ideyalara qarşı qeydsizlik, fikir verməmək. Ümumiyyətlə əxlaqi dəyərləri və ideyaları qəbul etməmək, onlarla mübarizə aparmaq.

**İMKAN** [alm. Möglichkeit; fr. Possibilitè; ing. Possibility; lat. Possibilats, potentia; osm. tr. imkan; ər. إمكان; tr. olanak] – olmasına şərait yaranan, müəyyən fərziyyələrlə başverməsi fərz edilən şey. Ərəbcədən dilimizə axtarılan bu kəlmə **مكن** felinin IV babda olan **أمْكن** formasından [modeli əf`alə **أفْعل**] əmələ gələn məsdərdir. Məsdəri **إفعال** [ifal] modeli üzrə düzəlir [**إمكانٌ** – imkənun].

**İMPRESSİONİZM** [alm. Impressionismus; fr. Impressionisme; ing. Impressionism] – fəlsəfədə ancaq duyğu müşahidələri və hissləri həqiqi olaraq qəbul edən əlsəfi təlim.

**İNVARİANTLIQ** [invariantis – dəyişməyən] – kəmiyyətlərin, tənliklərin, qanunların dəyişməz qalmaq, koordinatların və zamanın müəyyən çevrilmələrində saxlanıla bilmək xassəsi.

**İNAM** [alm. Glaube; fr. Foi; ing. Faith; lat. Fides; osm. tr. iman; ər. إيمان] – xüsusilə də dini mənada hər hansı bir bağlılıqdan ortaya çıxan güvən. Tanrıya qarşı hiss edilən ucsuz-bucasız etimad hissi. Görünməz olana daxilən inanmaq, bağlanmaq, etiqad etmək. Bilinməyənə bağlanmaq, inanılan doğruların hamısı.

**İNDUKSİYA** [**lat.** inductio – yönəltmə] əqlinəticələrin tiplərindən biri və tədqiqat metodu.

**İNİKAS [ər. إنعكآس]** – inikas xassəsini, onun məzmunu və formalarını, dinamikasını, idrak prosesində rolunu öyrənən nəzəriyyə.

**İNKAR [ər. إنكار]** – Materialist dialektikada inkar inkişafın zəruri cəhəti, şeylərin keyfiyyətcə dəyişməsinin şərti kimi nəzərdən keçirilir [inkarı inkar qanunu].

**İNKİŞAF [ər. إنكشآف]** – maddi və ideal obyektlərin geriyə dönməz və istiqamətli olması ilə səciyyələnən qanunauyğunluq keyfiyyət dəyişməsi.

**İNİTSİYASİYA -** Sinfi quruluşa qədərki cəmiyyətin həyatında initsiyasiyalar (təqdis adətləri) böyük rol oynayırdı (latınca "initsiare"-başlamaq). Bu yeniyetmələrin böyüklər cərgəsinə keçirilməsi qaydası idi. Kasta – (portuqaliya dilində nəsil deməkdir) qapalı endoqam ictimai qrupdur. Onun öz xüsusi davranış qaydaları vardır.

**İNTEQRASİYA** – Etnik proseslərin xarakterini müəyyənləşdirmək üçün əksər hallarda inteqrasiya, konsolidasiya və assimilyasiya kimi latın terminlərindən istifadə olunur. İnteqrasiya hərfi mənada ayrı-ayrı hissələrin vahid bir tamda birləşməsi deməkdir. Bu müxtəlif etnik mədəniyyətlərin qarşılıqlı əlaqəsi zəmnində

mədəniyyətlərin yaxınlaşmasına aiddir. Müstəqil xalqların və ya onların böyük qruplarının böyük etnoslar şəklində birləşməsinə konsolidasiya deyilir. Adətən bu cür birləşmələrin vahid dili və mədəniyyəti olur. Assimilyasiya isə artıq formalaşmış etnosların qarşılıqlı təsiredici əlaqə prosesidir. Bu cür etnoslar əksər hallarda mənşə, dil və mədəniyyət cəhətcə müxtəlif olurlar.

**İRQ** –Tarixən konkret bir ərazidə qərarlaşan, nəsildən-nəslə keçən fiziki əlamətlər kompleksinə görə bir-birindən fərqlənən böyük insan qruplarına irq deyilir. İrqlər ümumi, oxşar xarici fiziki əlamətlərinə görə bir-birindən seçilirlər. İrqlərin ətraf mühitə uyğunlaşması nəticəsində elə xarici fiziki əlamətlər kompleksi yaranmışdır ki, bu əlamətlərə görə dünya xalqalrına əvvəllər “ağ”, “qara” və “sarı” rənglərə və üç əsas irqə ayırırdılar: avropoid,ekvatorial (neqroid) və monqoloid. Son vaxtlarda monqoloid irqindən amerikanoid, ekvatorial irqindən avstraloid irqinin ayrılması tövsiyyə olunur.

**İNSAN [ər. إنسآن]**– tarixi prosesin, Yer üzərində maddi və mənəvi mədəniyyətin inkişafının subyekti, həyatın digər formaları ilə genetik bağlı olan və bu formalardan əmək alətləri istehsal etmək qabiliyyətinə görə seçilən, aydın nitqə, təfəkkür və şüura malik olan biososial varlıq.

**İNSTİNKT** [alm. Instinkt; fr.=ing. Instinct; lat. Instinctus; osm. tr. sevkitabii; garize; insiyak; ər **lat.** instinctus – oyanma] – heyvan növünün bütün nümayəndələrində ortaya çıxan və həyatın mühafizə edilməsinə yarayan şüursuz fəaliyyətə və davranış formasına deyilir. Psixi fəaliyyətin forması, davranış.

**İNTELİGENSİYA** [fr.Intelligence; ing. Intelligence; lat. Intelligentia;tr.anlak] 1.Əqlin ruhu idarəedici təbəqəsi.

**İNTELLEKTUALİZM** [lat. intellectualis – zehni-əqli] intellekt vasitəsilə idrakı ilk plana çəkən və metafizikcəsinə hissi idrakdan və praktikadan ayıran fəlsəfi təlim.

**İNTENSİONALLIQ** [lat. intentio – səy, cəhd] şüurun predmetə istiqamətləndirilməsi [yönəldilməsi].

**İNAN** - İman, inanç, 2- qayda, əqidə 3- əmniyyət, ehtiyat.

**İNTERPRETASİYA** [lat. interpreitatio – şərh, izah etmə] – istər metariyaziyyatda və metaməntiqdə, istərsədə bütövlükdə Elmdə mühüm rol oynayan semantik anlayış.

**İNTİBAH** [ər. إنتبآه] [fəlsəfədə] – feodalizmin dağıldığı və erkən burjua cəmiyyətinin təşəkkülü dövründə Avropada [xüsusilə İtaliyada] inkişaf etmiş fəlsəfi və sosioloji təlim.

**İNTİZAM** [ər. إنتزآم]– insanlar arasında ictimai əlaqənin spesifik forması; maddi istehsal şəraitindən obyektiv surətdə meydana gəlir, birgə fəaliyyət üçün zəruri olan istehsal vasitələri üzərində mülkiyyətin müəyyən tipi və sosial münasibətlərin xarakteri ilə şərtlənir.

**İNTROYEKSİYA** [lat. intro – daxilə, iectio – tullama] – natruralist və seyrci [metafizik] materializmin şərhini və tənqidini vermək üçün Avenarius bu materializmin əksinə "prinsipial koordinasiya" nəzəriyyəsini irəli sürür.

**İNTROSPEKSİYA** [lat. introspecto – içəriyə baxıram] – insanın öz daxili psixi hadisələrini müşahidə etməsi, özünümüşahidə.

**İNFORMASİYA** [lat. informatio – izahetmə, şərhetmə] – müəyyən xəbərlər, hər hansı məlumatların, biliklərin məcmusu.

**İNCƏSƏNƏT** – ictimai şüurun və insan fəaliyyətinin spesifik forması, gerçəkliyin bədii obrazlarda əks olunması, inikası, aləmin mənimsənilməsinin mühüm üsullarından biri.

**İRADƏ** [ər. إرآدة]- insanın bu və ya digər hərəkətlərinin yerinə yetirilməsinə doğru yönəldilmiş şüurlu meyli.

**İRRASİONAL** [alm.=ing. Irrational; fr. Irrationnel; osm. tr. gayr-i akli] – əqllə qavranıla bilməyən, əsassız, bəzən də ruhi, mənəvi olanlara deyilir. Zəka ilə, təfəkkürlə dərk edilə bilməyən, məntiqi anlayışlarda ifadə oluna bilməyən mənasını verən anlayış.

**İRIM** - 1- Sehr, əfsun, 2- İçinden su axan torpaq, ərazi.

**İRTÜK** – dəyər, qiymət.

**İRRASİONALİZM** [alm. Irrationalismus; fr. Irrationalisme; ing. Orrationalism; lat. irrationalis – düşüncəsiz, şüursuz] – Zəkanın, təfəkkürün idrakı imkanlarının məhdudluğunu israr edən və intuisiyanı, hissi, instinkti və s.-ni idrakın əsas növü kimi qəbul edən fəlsəfi təlim.

**İSBAT** [alm. Beweis; fr. Preuve; ing. Proof; lat. Probare – sınamaq, göstərmək, sübut etmək; tr. Tanıt; ər. إسبات] – önə sürülən bir şeyin həqiqətini göstərməkdə izlənilən təfəkkür müddəti. Sübut etməkdə önə sürülən şey.

**İSLAM** [ər. ألإسلام] – itaət etmə - dünyada geniş yayılmış monoteist dinlərdən biri.

**İSMAİLİLİK** – şiəlikdə təriqət. VIII əsrdə Xilafətdə sinfi ziddiyyətlərin kəskinləşməsi nəticəsində yaranmışdır. İsmailililik, İslami müxalifət hərəkəti olan Əli yandaşlıarının bir törəməsidir.

Hz. Məhəmmədin ölümündən dərhal sonra, yeni dinin Batinilik tərəfdarı qrupu olan Hənifə, xəlifəliyə kürəkəni Əlinin seçilməsini istəmiş ancaq sünni əksəriyyətin qəbulu ilə Əbubəkr xəlifə seçilmişdir. Əli tərəfdarları, Ömər və Osmanın xəlifəliyini də qəbul etməmiş, Əlinin qısa davamlı və daxili qarşıdurmalarla keçən xəlifəlik dövründən sonra oğullarının qətli ilə, İslamiyyət günümüzə qədər sürən bölünmə və qarşıdurmalara süründürülmüşdür. İsmailiik də, Əlinin qırğından xilas nəvəsi Zeynelabidin'in soyundan gələn Cəfər Sadiqin oğlu İsmailin imamlığını qəbul edən qrupun təşkilatı olmuşdur.

**İSTİDLAL** [alm. Schluss; fr. Inference; ing. Inference; illation; lat. Illation, conclusio; osm. tr. istidlal; tr. Çıkarım; ər. **إستدلآل**] – Verilmiş bir və ya daha çox prinsipdən nəticə çıxarma fəaliyyəti. Həqiqəti naməlum qalan bir prinsipin doğru olaraq qəbul edilmiş başqa prinsiplərlə əlaqəsinə əsaslanaraq doğru olanı ortaya çıxarma prosesi.

**İSTƏK** [alm. Wille; fr. Valontè; ing. Will; lat. Voluntas; velle – istək; volo – istəmək; osm. tr. irade; ər. **إرآدة**] – sövqedici qüvvə, müstəqilliyini də qoruyub saxlayan arzu etmə, diləmə.

**İUDAİZM** əsasən yəhudilər arasında yayılmış din. Qədim yəhudi tayfalarının bütpərəstlik politeizmindən [çoxallahlılığından] meydana gəlmiş İudaizm e.ə. VII əsrdən başlayaraq monoteist dinə çevrilir. İudaizm islam və xristianlıq kimi səmavi dinlərdən hesab olunur. İudaizm öz adını müqəddəs İudanın adından götürmüşdür. İuda adını bəzi tədqiqtçılar Tanrı Yahovanın adı ilə eyniləşdirirlər.

**İCMA** [ər. إجمآع]– ibtidai-icma quruluşunun əsas iqtisadi özəyi; istehsal vasitələri üzərində ictimai mülkiyyətə, kişilər və qadınlar arasında, yaşlılar və uşaqlar arasında təbii bölgüsü ilə birlikdə kollektiv əməyə, istehsal edilən məhsulun birgə bölgüsünə və istehlakına əsaslanaraq yaranır. **İcma** sözünün bir mənası da eyni dövrdə yaşayan islam müctəhidlərinin şəriətə aid hər hansı bir hökm və qaydanı müdafiə etmələridir.

**İŞARƏ** [ər. إشارة]- idrakda digər predmetin, hadisənin, hərəkətin, subyektiv törəmənin işarəsi, ifadəsi və nümunəsi kimi çıxış edən hissən qavranılan maddi predmet, hadisə və ya hərəkət. İşarə sözü ərəbcədəki *əşarə* (أشأر) felindən əmələ gəlmişdir. Qadın cinsindədir, hərfi mənada nəyisə göstərmək, işarələmək deməkdir. İşarə sözü dilimizdə bəzən hansısa mövzunun anlaşılan və o mövzu ətrafında ətraflı bir

**İŞRAQİLİK** [ər. ألإشرآقية] – Orta əsrlərdə müsəlman ölkələrində yayılmış fəlsəfi cərəyan.

## G

**GENESIZ** [yun. Genesis – mənşə, yaranma] – “G.” termini ilk dəfə qədim yunan mifologiyasında işlənmişdir.sonralar fəlsəfədə, həmçinin təbiəətşünaslıqda yayılmışdır.

**GENETIKA** [yun. Genetikos – mənşəyə aid olan] – orqanizmlərin irsiyyəti və dəyişkənliyi haqqında təlim.

**GENERALIZM** [alm. Generalisation; fr. Gènèralisation; ing. Generalization; lat. Generalis – genel; osm. tr. tamim; ər. تعميم; tr. Genel] tək – tək yaxud da xüsusi vəziyyıtlərdən ümumi bir qanunun, prinsipin çıxarılması.

**GEOPOLITIKA** [yun. Ge – yer, politike – dövləti idarə etmək məharəti] – imperialist ekspansiyanın müxtəlif formalarına iqtisadi və siyasi coğrafiyanın məlumatlarına saxta istinadlarla haqq qazandıran konsepsiya.

**GƏLDƏÇ** – türk dilində gələcək, istiqbal mənalarını verməkdədir.

**GÖK** – 1 – Tanrı, Tanrıdan. Tanrısal, müqəddəs 2 – Mavi, Göyün rengi 3 – Yer üstü, göy üzü 4 – Əzəl-ebed, başsızlıq və sonsuzluq 5 – Gözəllik, göz alıcılık, üstünlük. Əski türkcədir. Əski Türkcədə Tanrıya da bəzən Gök Tenqri  - yəni Göy Tanrı ifadəsi işlədilirdi.

**GERÇƏKLIK** – real mövcud olub inkişaf edən, özündə xüsusi mahiyyət və qanunauyğunluq olan, həmçinin xüsusi təsir və inkişaf nəticələrinə malik şey. *Reallıq, yaxud həqiqət.*

**GƏLƏCƏK** – zaman çərçivəsində və məkan hüdudlarında fantaziyanın gizli söylədiklərinin hamısının formasız və qeyri-müəyyən baş verməsi.

**GÖZƏL** [tr. Güzel; alm. Schön; fr. Beau; ing. Beauti+ful; yun. Kalos; ər. **جميلة**] – konkret anlamda görmə zamanı gözə çox xoş görünən, göz oxşayan. Estetikada geniş istifadə olunur. Dəyərləndirmədə tətbiq olunur. Bu kəlmənin fəlsəfəyə daxil edən Platon olmuşdur.

**GÖZƏLLİK** – ən yüksək estetik məziyyətli hadisələri səciyyələndirən estetik kateqoriya.

**GÖRÜNMƏ –** obyektin, yaxud hadisənin qavrayışında saxtalıq anını ifadə edən anlayış.

**GEOSENTRİZM** [geocentrisme] – yerin mərkəz qəbul edilməsi: Dünyanı bütün aləmin mərkəzi qəbul edən görüş.

**GÜC** [alm. Kraft; fr. Fo. Power; lat. Fortitudo; osm. tr. kuvvet; **ألقدرة**] – fiziki və əxlaqi olaraq təsir edə bilmə yaxud da bir təzyiqə qarşı müqavimət göstərə bilmək qabiliyyəti. Güc müxtəlif mənalarda çoxçalarlılığı ilə fərqlənir: qol gücü, ictimai güc, güc sahibi və s.

# H

**HAKİMİYYƏT** – cəmiyyətin siyasi təşkilinin əsas funksiyalarından biri, bir-birinə zidd fərdi və ya qrup mənafelərini əlaqələndirməklə insanların hərəkətini idarə etmək üçün, inandırma və ya məcburiyyət vasitəsi ilə onları vahid idarəyə tabe etməkdə real imkana malik nüfuzlu qüvvə.

**HAQQ** (ing. Real; ər. حقق) – sözünün lüğət mənası "dəyişməz" deməkdir. Termin olaraq mənası isə "hər şərt altında doğru olan şey" deməkdir. Məsələn, iki dəfə ikinin dörd etdiyi kimi. Batil kəlməsinin lüğət mənası "səhv, yanlış" deməkdir. Termin olaraq mənası isə "hər şərt altında yanlış olan şey" deməkdir. Məsələn, iki dəfə iki üç edir, iddiası kimi. Bu günkü Qərb mədəniyyəti özlərinin hər zaman ifadə etdikləri kimi qədim Roma mədəniyyətinə, qədim Roma mədəniyyəti qədim Yunan mədəniyyətinə, qədim Yunan mədəniyyəti də qədim Misir mədəniyyətinə yəni Fironlara söykənməkdədir. Fironlar insanlara zülm edərkən bu etdikləri zülmləri "biz sizə zülm edirik" deyə etməzdilər. Etdikləri zülmləri "bu bizim haqqımızdır" deyə edərlərdi. Səhvləri onların haqq anlayışının yanlış yəni batil olmasında idi.

**HARMONİYA** ahəngdarlıq.

**HEDONİZM** [yun. Hedone – həzz] – əxlaqi tələblərin əsaslandırılması prinsipi; qədim dövrdə meydana gəlmişdir; xeyirxahlıq [xeyir] həzz gətirən və iztirablardan azad edən, şər isə iztiraba səbəb kimi qiymətləndirilir.

**HERMENEVTİKA** [yun. Hermeneuo – aydınlaşdırıram] – məqsədi mətnin obyektiv [sözlərin qramatik mənaları və tarixən şərtlənmiş variantları] və subyektiv [müəlliflərin niyyəti] əsasları-na görə mənasını müəyyən etmək olan şərh məharəti nəzəriyyəsi.

**HERMETİZM** [yun. Hermes – magiyanın hamisi hesab olu-nan qədim yunan ticarət və gəlir alla-hı] – ellinizm mərhələsində və son aitik dövrdə təşəkkül tapmış dini-fəlsəfi təlim.

**HƏQİQƏT** – gerçəkliyin fikirdə doğru, düzgün inikası; meyarı praktikadır. Həqiqilik xarakteristikası şeylərin özünə və onları dillə ifadə etməyin vasitələrinə deyil, məhz fikirlərə aiddir.

**HERUSTİKA** [alm. Herustika; fr. Heruistique; lat. Ars; tr. Bulgulama; yun. Heuruskein; osm. tr. tekşif; ər. **إختراء**] əslən yunan mənşəlidir heuruskein – tapmaq, ortaya çıxarmaq deməkdir. Fəlsəfədə herustika nəyisə, hansısa metodu tapıb ortaya çıxarmaq mənasında işlədilir. Ərəb dilli fəlsəfədə **تكشيف فراضية** [təkşif-i fəra̱ziyyə] istilahı çox işlədilir. Bu elə bir fərziyyə idi ki, onun köməyilə olanların mahiyyətini açmağa, hadisələrin arxa üzünü aşkarlayıb ortaya çıxarmağa vasitəçi olurdu. Buradakı Təkşif sözü [**تكشيف**] kəşəfə **كَشَفَ** felinin II babda [kəşşəfə - **كشّفَ**] təf`il [**تفعيل**] babında məsdəridir. Fəraziyə isə fərziyyətun – fərz, nəzəriyyə və s. sözünün cəmidir. Dilimizdə VIII babın məsdəri olan ixtira sözü daha çox işlənir.

**HADİS**: başlanğıcda mövud olmayıb, sonradan var olan şeydir. ***hadis hallar*** – başlanğıcda olmayıb sonradan baş verən hallar, əslə aid olmayanlar.

**HEDONİZM**[hedonisme] – Hazcilik-Zevkçilik: ləzzət və zövqü həyatın məqsədi qəbul edən bütün əxlaq anlayışlarına verilən isim.

**HELİOSANTRİZM** [heliocentrisme] – Güneş merkezcilik: Kopernik və Galileyin ortaya qoyduğu Günəş mərkəz görüşü.

**HOMOJEN** [homogene] – Mütecanis-Ayni cinsten: Qisimləri, təbiət və mahiyyətləri baxımından bir-birinin eyni olan.

**HİLEİZM** [Hyleeisme] – Heyülaiyye: Maddəyə əzəli və əbədi, yaradılmamış və hər cür formu qəbul etməyə hazır və uyğun olaraq baxan görüş.

**HUDÜS**: Yoxdan var edilmiş, yaradılmış olmaq, varlığı üzərindən bəlli bir zaman keçmiş olmaq, əvvəli olmaq.

**HƏYAT** [alm. Leben; fr. Vie; ing. Life; yun. Bios; lat. Vita; osm. tr. hayat; tr. Yaşam; ər. **حيات**] – cansız maddədən və ruhi varlıqdan da ayrı olaraq canlıların [orqanizmlərin] varlıq forması və varlıq məkanı. Canlıların ən birinci xüsusiyyəti. Əlamətləri öz-özünə böyümə, inkişaf, dəyişmə, çevrilmə, təsir etmə, təsirlənmə, artıb çoxalmaq. Lakin elm və texnologiyanın ən modern imkanları ilə belə canlılar ilə cansızları ayırd etmək mümkün deyildir. Misal üçün viruslar ən aşağı dərəcədəki canlı varlıqlar, yoxsa kimyəvi maddədən ibarət olduğunu sübut etmək mümkün olmamışdır. Həyat bir növ ölümün antonimi mənasında da işlənir. Materiyanın hərəkət forması; fiziki və kimyəvi hərəkət formalarına nisbətən keyfiyyətcə yüksək və onları “bərtərəf” olunmuş formada özündə ehtiva edən forması.

**HƏYAT ENERJİSİ** [alm. Erlebnis; fr. Expèrience vècue; ing. experience] – insanlığı zənginləşdirdiyi qəbul edilən, bir mənası

olan bütün yaşanmış təcrübələr. Özləri vasitəsilə mənin şüuruna vardığı bütün mənəvi hadisələr.

**HƏNİFİLİK** – islam dinin yaranması ərəfəsində Ərəbistanda bütpərəstliyə qarşı çıxıb, təkallahlığı təbliğ edən cərəyan. Hənifilik islamdan əvvəlki Ərəbistanın sosial qurluşu və dini ideologiyasının böhranı nəticəsində meydana gəlmişdir.

**HAL ərbabı** – hal əhli. Hər hansı bir məqama sahib olan kəsl**ər.**

**HAQQ əl-yəqin** – daxili hiss və təcrübənin verdiyi, insanın özündə hiss etdiyi, özündə müşahidə etdiyi elmə deyilir.

**HARAM** – dinin yerinə yetirilməsini qadağan etdiyi əməllərə deyilir. İnsan öldürmək, oğurluq etmək, ana-ataya qarşı çıxmaq və s. əməllər haram sayılır və yerinə yetirilməsi qadağandır.

**HARMONİYA** – [alm.=fr. Harmonie; ing. Harmony; yun. Harmonia – bağlam, birlik, uyğunluq. Birlikdə səs verən sistem; osm. tr. aheng; ər. **تطابق**] – çoxluğun və qarışıqlığın sistemli bir birlik yaratması.

**HƏDƏS** – islam dini etiqadına görə, müsəlmanın ibadət etməsinə mane olan və dəstəmaz, qüsul, yaxud təyəmmüm etmədikcə bədəndə qalıcı xüsusiyyətə malik olan maneə, yaxud haldır.

**HƏDD** [alm. Grenze; fr. Limite; ing. Limit; lat. Limitus; osm. tr. had, hudut] – tamamlama, sona çatma, bir şeyin sona çatdığı nöqtə. Varlıq yaxud da təsir dairəsinin xarici sərhəddi.

**HELM** – yumşaq xasiyyətlilik, mülayimlik, səbirli, təmkinli olmaq.

**HERMENEVTİKA** [alm. Hermeneutik; fr. Hermèneutique; ing. Hermeneutics; yun. Hermeneutike; hermeneuiein – yorumlamaq, tekhnè – sənət] – açıqlamaq, yorumlamaq, izah etmək. Bir mətni anlamağa yönələn, mətnin izahından bəhs edən təlim.

**HƏVAİ şeylər** – boş şeylər, dünyanın fani ləzzətlərinə meyl etmək.

**HƏVASAT-İ nəfsiyyə** - nəfsin arzuları istəkləri.

**HEYBƏT** – qorxu dolu həyəcan, dəhşət.

**HİCAB** – örtük, çarşab.

**HİDAYƏT** – doğru yolda olma, Allah-təalaya aparan doğru yol, yaxud Allahın əmr və qadağalarına tabe olmaq.

**HÜCCƏT** – dəlil.

**HÜDUS** – yoxdan, heçdən var edilmək. Hüdus Tanrıya aid xarakterik xüsusiyyətin əməli nəticəsi olub, mahiyyət etibarı ilə maddi, yaxud mənəvi olmalarından asılı olmayaraq Tanrıdan başqa bütün varlıqların yaradılış formasıdır. Dini məntiq varlıqların yaradılış formasını Tanrının "Ol!" ifadəsinə bağlı olduğunu qeyd edir. Tanrı varlıqları yaratmaqda hüç bir çətinlik bilməz. Hüdus, həm də varlıqların əzəli olmadıqlarını ifadə etmək üçün də işlədilir. Varlıqların əzəli olmamaları başlanğıcda onların başqa bir varlıq tərəfindən yaradılmış olmasına və İlkin səbəbə möhtac olmaları deməkdir. Şərq peripatetik fəlsəfəsində varlıqların bu xüsusiyyətlərini ifadə etmək üçün vacib varlıq və mümkün varlıq terminləri işlədilmişdir. Vacib varlıq yaradılmamış olub, yaradanadır və yaradan varlıqların heç bir xüsusiyyətini Ona aid etmək olmaz. O, əzəli və əbədidir. Bu varlıq Tanrının özüdür. Ondan başqa bütün varlıqlar isə var ola

bilmələri üçün yaradıcıya möhtacdır. Var ola bilmələri üçün başqa varlığa ehtiyacı olan varlıqlar isə mümkün varlıqlar adlanır.

**HÜLUL** – bəzi inam və əqidə sahiblərinə görə, ruhun insan öldükdən sonra hər hansı bir əşyaya, cismə yəni maddi olan şeylərə daxil olması.

**HUMANİZM** [alm. Humanismus; fr. Humanisme; ing. Humanism; ər. **إنسأنيّة** lat. Humanus – insana xas olan, insani] – Bəşrəiyyətə, insana yaraşan bir həyatı və təfəkkürü əldə etmək üçün cəhd etmək. Bu mənada məfhumun ən geniş mənasında insanın dəyər və hörmətinə, insan olmağa və insanlığa olan əqli inam.

**HUŞU** – Allah-təalanın cisimlərə girməsi, cisimlərin də Allahın varlığına keçməsini nəzərdə tutan ifadədir

**HƏRƏKƏT** – Matriyanın mühüm atributu, mövcudluq üsulu. Hərəkətə təbiət və cəmiyyətdə baş verən bütün proseslər daxildir.

**HƏZZ** [alm. Lust; fr. Plaisir; ing. Pleasure; yun. Hedone; ər.**هزٌّ**; tr. haz] – Hissin içində yaşadığı vəziyyətin əsas xüsusiyyətlərindən biri, ağrının əksinə xoşlanma, zövq alma, ləzzət alma.

**HƏYƏCAN** [alm.=fr.=ing. Emotion; lat. Emovere – həyəcanlanmaq] – daxili, yaxud da xarici təzyiqlərlə ortaya çıxan ruhi-mənəvi sarsıntı.

**HİKMƏT** [alm. Weisheit; fr. Sagesse; ing. Wisdom; lat. Sapientia; yun. Sophia. əs.tr.hikmet; [ər.] **حكمة** – Müdrik söz, dərin fikir, dərin məna. Keçmişdə fəlsəfəyə, xüsusilə də təbiət elmlərinə verilən ad.

**HİLOZOİZM** [alm. Hylozoismus; fr. Hylozoisme; ing. Hylozoism; tr. Canlı özdekçilik; yun. Hyle – maddə, cisim, materiya və zoe – həyat] – kainatın əsası olaHilozoizm termini ilk

dəfə 17 əsrdə işlədilmişdir. Duyğu və təfəkkür qabiliyyətini materiyanın bütün formalarına aid edir. Əslində duyğu yalnız yüksək inkişaf etmiş materiyanın xassəsidir.

**HİNAYANA** [sanskritcə, hərfi mənası – balaca araba və ya kiçik [dar] yol] – Mahayana ilə yanaşı budizmin iki əsas cərəyanından biri. Hinayanaya theravada, sarvastivada [Vaybhaşika], sautrantika və s. məktəblər daxildir.

**HİNDUİZM** – Hindistan əhalisinin əksəriyyəti üçün [heç olmasa valideynlərindən biri hindli olan və digər dinə etiqad bəsləməyən hər bir kəs hinduist hesab olunur] səciyyəvi olan dini təsəvvürlərin, mərasim və adətlərin, sosial-məişət təsisatlarının məcmusu.

**HİPOTEZ** [Alm. = fr. Hypotasez; ing. hypostasis; yun. Hypothesis – təməl, dayanaq, əsas; osm. tr. uknum; tr. dayantı] - əsas təməl, özünə əsaslandırılan əsas təməl. Əqli nəticələr sistemi; onun vasitəsi ilə bir sıra faktlarla obyektin mövcud olması, hadisənin əlaqə və ya səbəbinin mövcudluğu haqında nəticə çıxarılır; bu nəticəni mütləq səhih nəticə hesab etmək olmaz.

**HİPNOZ** [alm.fr. hypnose; ing. Hypnosis; yun. Hypnos – yuxu; osm. tr. nevm-i sınai] – insanın iradəsinin, yatırdanın iradəsinə bağlı və eyni zamanda bütün başqa təsirlərə bağlı olduğu, ancaq deyiləni yerinə yetirmə halına gəlmiş vəziyyət. Belə bir vəziyyətə və bu vəziyyətdəki adama da hipnoz deyilir.

**HİSS** [alm. Sinn; fr. Sens; ing. Sense; lat. Sensus; osm. tr. hasse; Emosiya; ər. ألحس] – Xəbərdarlığı almaq qabiliyyəti. Əsas hiss orqanları olan görmək, eşitmək, dadmaq, qoxu bilmək və toxunmaq hissləri, duyğu orqanları vasitəsilə qəbul edilir. İnsanın

ətraf gerçəkliyə [adamlara, onların davranışına, hər hansı hadisəyə] və özünə münasibətini hiss etməsi, yanaşması.

**HİSSİ** [alm. Sensitiv, empfindlich; fr. Sensitif; ing. Sensitive; osm. tr. hıssi; ər. حسي]. Duyğularla verilməyən, qavrama vasitəsilə deyil, düşünmə ilə qavranılan yaxud hisslərin bununla əlaqədar təcrübə dünyasının xaricində olan. **Hissi müştərək** [alm. Gemeinsinn; fr. Sens commun; ing. Common sense; lat. Sensus communis; yun. Koine aisthesis; osm. tr. hıss-i müşterek; tr. Ortakduyu; ər. حسّ مشترك] – Aristotel və sxolastik fəlsəfədə müxtəlif hiss orqanlarının qabiliyyətlərini birləşdirən, başqa bir deyimlə desək, eyni şeydən hisslərin hər biri ilə alınan növ hissləri formalaşdıraraq həmin şeyi tək və eyni şey kimi qavranılan şey. ***Hissiyyatsizliq*** [alm.=fr. Apathie; ing. Apathy; yun. Apatheia; osm. tr. fıkdan-i hassasiyet]. 1. Ümumi mənada unutqanlıq ; az və yavaş dərəcədə təzyiq göstərən və bunun nəticəsində duyğulandıran hisslərə əhəmiyyət verməyən insan xarakteri. 2. Stoa məktəbində məlumat sahibinin özünü tərbiyələndirmə ideyası kimi hisslərdən arınması və ağıla tərs gələn hisslər qarşısında müstəqil olma və beləcə sarsılmazlıq prinsipinə qovuşmaq halı.

**HOLİZM** [yun. Holos – bütöv, tam] – öz ideyalarına görə emercent təkamülünə yaxın olan idealist "tamlıq, bütövlük fəlsəfəsi".

**HOMEOMERİYA** [yun. Homoiomereia – oxşarhissəlik və ya oxşar, bir-birinə bənzər hissələri olan şey] – Anaksaqor fəlsəfəsində işlədilmiş termin. Lakin bizə gəlib çatmış

fraqmentlərdə bu terminə təsadüf edilmir və Anaksaqorun sonrakı şərhçilərindən alınmışdır.

**HOMEOSTAZ** homeostazis [yun. Homoios – oxşar; stasis – dayanma, tərpənməzlik, hərəkətsizlik] – öz-özünə idarə olunan mürəkkəb sistemlər üçün səciyyəvi və sistemin saxlanılması üçün mühüm olan parametrlərin mümkün həddlərdə saxlanılmasından ibarət dinamik müvazinət tipi.

**HÖKM** [alm. Urteil; fr. Jugement; ing. Judgement; yun. Opophasis; lat. Judicium; osm. tr. hüküm] – bir şeyin yaxud da iki şey arasındakı əlaqənin həqiqətini təsdiqləyən yaxud da ləğv edən düşüncənin ortaya qoyulması, dilə gətirilməsi. Obyekt haqqında nəyinsə iqrar edildiyi təklif formasında ifadə olunan və obyektiv olaraq ya həqiqi, ya da yanlış olan fikir.

**HÖRMƏT** [alm. Achtung; fr. = ing. Respect; osm. tr. hurmet] – bir insana, bir fikirə, bir hadisəyə, nəyəsə olan ehtiram, yaxud xüsusi bir hiss.

**HUMANİZM** [lat. humanus – insani - Bəşəri] – insanın ləyaqət və hüquqlarına hörməti, şəxsiyyət kimi onun qiymətli-liyini, insanların rifahı, onların hərtərəfli inkişafı, ictimai həyatda insan üçün əlverişli şərait yaradılması haqında qayğını ifadə edən baxışların məcmusu.

**HÜQUQ** – hakim sinfin qanun səviyyəsinə qaldırılmış iradəsi; bu iradənin məzmunu mövcud sinfin maddi həyat şəraiti ilə, həmin sinfin mənafeyi ilə müəyyən olunur.

**HÜLULİLİK** [ər. "daxil olma" sözündəndir] – ilahinin insanda həll olması, təcəssüm etməsi haqqında dini-fəlsəfi təlim.

**HÜRUFİLİK** [ər. "hərflər" sözündəndir] – şiəlikdə təriqət.14 əsrin sonlarında yaranmışdır. Banisi Fəzlullah Nəimidir.

## K

**KABALA** [alm. Kabala; fr. Cabale; ing. Cabala; ibr. Kabbalah – alınma şeylər, adət, ənənə] – yəhudilərin yazılı olaraq qorunub saxlanan dini ayinləri və qanunları özündə əks etdirən qanunnamələrlə birlikdə ağızdan – ağıza keçən dini buyruqlar. İbrani fəlsəfəsinin və deyilən mitos yazıların cəmi. Tarixləri dəqiq olaraq bilinmir.

**KAMAL-i əvvəl** [alm. Entelechie; fr. Entèlèchie; ing. Entelechy; ər. **كمال أول**; yun. Enteelekheia = en – içində, telos – məqsəd, èkhein – sahib olmaq] – özünü təzahürlərində reallaşdıran öz, maddəyə forma verən, imkanı gerçəyə çevirən təsirli ideya.

**KAOS** [Chaos]: kainatın bir nizama girmədən əvvəlki, şəkildən məhrum olan qarışıq vəziyyətini ifadə edər.

**KASTA** – portuqalca nəsil və qəbilə mənasındadır.

**KONKORDAT** – latınca razılıqlı olmaq mənasındadır. Məsələn Vatikanla başqa bir dövlət arasında həmin ölkədə katolik kilsənin fəaliyyətinin müəyyən edən razılaşmalı müqavilə buna aiddir.

**KOMMUNİKASİYA** siyasi sistemlə mühit arasında qarşılıqlı fəaliyyət.

**KONKRET** [alm. Konkret; fr. Concret; ing. Concrete; lat. Concretus; tr. Somut; osm. tr. muşahhas; ər. **مشخّص**] – müəyyən bir zamanda müəyyən bir yerdə ortaya çıxan, təbii, müşahidə

edilə bilən, əllə tutula bilən, hiss edilən yaxud da işarə ilə qavranılan.

**KONSEPTUALİZM** [alm. Konzeptualismus; fr. Conceptualisme; ing. Conceptulism; osm. tr. mefhumiye; tr. Kavramcılık; ər. **مفهومية**] - Küllülərin yəni İnsan-Heyvan kimi mücərrəd anlayışların bir təsəvvür olmaları baxımından, özlərini düşünən zehində onların gerçək varlıqlarının var olduğunu qəbul edən fəlsəfi görüş.

**KƏMİYYƏT** [Qantite] – Nicelik: Ölçülüb sayıla bilən böyüklük.

**KEYFİYYƏT** [Kalite] – Nitelik: Bir şeyin quruluşunu göstərən, bir obyekti özünün var olduğu kimi edən xüsusiyyət. **Keyfiyyət -** nəyinsə yaxşı və ya pis olma xüsusiyyətidir. Hansısa obyektə dəyər verdirən, xarici görünüş , rəng və dad kimi ona aid obyektiv xüsusiyyətlərin hamısına birgə verilən addır. Burada ifadə edilən, hər hansı bir baxımdan, üstünlük və əskiklikdir. Xalq dilində keyfiyyət, üstünlüyü, yaxşılığı bildirir. Fəlsəfi anlamda isə keyfiyyət fəlsəfi kateqoriya kimi şeyin onun mahiyyətindən olmayan lakin sonradan ona əlavə olunan forma və xüsusiyyətlərin məcmusuna deyilir. Keyfiyyətə Orta əsrlər Şərq fəlsəfəsində daha çox ərəz deyidilər. Misal üçün, bir stul taxtadandır, onun taxtalığı onun mahiyyətidir, sakin onun forması, rəngi, görünüşü, sərtliyi onun forma və keyfiyyətlərini təşkil edir.

**KÖVN** [geneşe]: Aləmin doğuşu.

**KOMPROMİS** – əsl mənası qarşılıqlı məğlubiyyət olmasına baxmayaraq, bu söz hal-hazırda sülh bağlamaq üçün razılığa gəlmək anlamında işlədilir.

**KOZMOLOJİ** [cosmologie] – Alem bilgisi: Kainatı idarə edən ümumi qanunları araşdıran elm.

**KOZMOGONİ** [cosmologie] Aləmin oluşu-Tekevvün-ü aləm: Aləmin necə təşəkkül edib meydana gəldiyini şərh etməyə çalışan nəzəriyyə.

**QÜVVƏ** [force] - Güç:Hərəkətə keçirən təsirli qüvvət.

**KÜLLİ** [universel] – Tümel: Bütün aləmə şamil olan. Ümumi olan. **Külli** – bütün şeylərin əslinə aid olan, ümumi olan, bütün olanlara aid olan. Şeylər kəmiyyət etibarl ilə fərdi, külli və cüzi olurlar. Külli bütün fərdi olanlarda ortaq xüsusiyyətdir. Küllilər ümumi şeyləri əks etdirirl**ər.**

**KAİNAT** [ər. كآءنة]- ənənəvi anlayışda maddi aləm, maddi obyektlərin, materiyanın keyfiyyətcə müxtəlif formalarının bütün məcmusu.

**KAPİTALİZM** [fr. Capital – başlıca əmlak və yaxud məbləğ] – ictimai-iqtisadi formasiya.

**KATARSİS** [yun. Katharsis – təmizlənmə, saflaşma] – qədim yunan estetikasında anlayış.

**KATEQORİYA** [alm. Kategorie; fr. Catègorie; ing. Category; lat. Paedicamentum; yun. Kategoria – özünəməxsusluq, hər hansı bir obyektə yüklənən xüsusiyyət, əlamət] – Aritotetlə görə kateqoriya var olanın üzərindəki dəyişiklik formalardır və on kateqoriya mövcuddur. İnsanın aləmə münasibətinin ən ümumi üsullarının anlayışlarda dərk edilməsi; təbiətin, cəmiyyətin və təfəkkürün daha ümumi və mühüm xassələrinin, qanunlarının əks etdirilməsi.

**KİBERNETİKA** [alm. Kybernetik; fr. Cybernètique; ing. Cybernetics; yun. Kybernetike; kybernetes – idarəçi, idarə edən; tr. Güdümbilim] – Əsasını informatikanın təşkil etdiyi idarəetmənin tədqiq edildiyi sahədir. Bir başqa deyimlə, geniş texnologiyaların tətbiq olunduğu, həyatı mexanikləşdirən, robotlaşdıran sahə.

**KOMMUNİZM** [alm. Kommunismus; fr. Communisme; ing. Communism; lat. Communis-ortaq] – bütün insanların bərabərliyi və bərabər haqlılığı daxilində "hamıya vacibiyyatı".

**Koqito erqo sum** [fr.] – düşünürəm, demək ki varam.

**Konvensionalizm** [lat. Conventio – müqavilə, saziş] – fəlsəfi konsepsiyaya görə elmi anlayışlar və nəzəri fikirlər öz əsasları etibarı ilə alimlər arasındakı sazişin məhsuludur.

**KONDİSİONALİZM** [conditio – şərt, şərait] – səbəb anlayışını şərtlər [şəraitlər] kompleksi anlayışı ilə əvəz edən fəlsəfi təlim.

**KONYUNKSİYA** [lat. Conjunctio – bağlayıcı, əlaqə] – məntiqi bağlayıcı "və"nin köməyi ilə [simvolik yazısı ALB] birləşən iki mülahizədən mürəkkəb bir mülahizənin əmələ gətirən məntiqi əməliyyat.

**KONKRET –** bax Abstrakt və konkret.

**KONSEKVENSİAL** [lat. Consequentia – nəticələr] – etik nəzəriyyələrin bir tipi; burada əməlin əxlaqi qiyməti bu əməlin səbəbləri və ümumi əxlaqi prinsipləri nəzərə alınmadan onun praktiki nəticələrindən asılı olaraq müəyyən edilir.

**KONSEPT** [lat. Conseptus – fikir, anlayış] – ifadə edilmiş zehni obraz, ümumi fikir, anlayış [konseptualizm], məntiqi semantikada adın mənası.

**KONSTRUKTİV Metod** [lat. Constructio – qurulma] – elmi nəzəriyyələrin deduktiv qurulması üsullarından biri [deduktiv metod

**KONFORMİZM** [lat. Conformis – oxşar, uyğunluq] – hər cür uyğunlaşmanı, şeylərin mövcud vəziyyətini, hakim rəyləri və s. passivcəsinə qəbul etməyi bildirən anlayış.

**KONVERSİYA** [alm. Konversion; fr. = ing. Conversion; lat. Conversio; osm. tr. akis; tr. evirme] – məntiqdə hər hansı bir prinsipdə köklə ona aid olan təyinlərin yerlərini dəyişməsidir. Misal üçün, Hər insan canlıdır. Yaxud hər canlı insandır. Təbii ki, bu cür konversiyalarda məntiqi doğruluğa da riayət etmək lazımdır. Çünki əslində hər canlı insan deyil. Bu səbəbdən konversiyalarda məntiqi doğruluğu qorumaq lazımdır. Misal üçün, hər insan danışır. Yaxud hər danışan insandır. Belə konversiya neqayov deyil, məntiqlə düzgün olduğu üçün pozitiv konversiya adlanır.

**KOORDİNASİYA** [alm. Koordination; fr.=ing. Coordination; osm. tr. tertip, tanzim]. Eyni sıradakı şey və obyektlərin bir-birinin yanında olması, eyni nizamda dayanması; eyni təsnifatda olan iki və yaxud da daha çox anlamın bir arada ardıcıllığı.

**KOSMOQONİYA** [yun. Kosmos – aləm, kainat, goneia – doğulma, yaranma] – səma cisimləri və sistemlərinin mənşəyi və inkişafının öyrənən elm sahəsi.

**KOSMOLOGİYA** [yun. Kosmos – kainat, logos – söz, təlim] – astronomiyanı bölməsi, bütöv əlaqəli tam kimi kainat haqqında

və bu tamın bir hissəsi kimi kainatın astronomik müşahidələrlə əhatə olunan bütün sahəsi haqqında elm.

**KOSMOPOLİTİZM** [yun. Kosmopolites – dünya vətəndaşı] – vətənpərvərlik hisslərindən, milli mədəniyyət və ənənələrdən "bəşər nəslinin birliyi" naminə imtina edilməsinə çağıran burjua təlimi.

**KOSMOS** [yun. Kosmos - aləm, kainat] – kainat, bütövlükdə aləm və bir tam kimi Yer, Günəş sistemi, bizim qalaktika və bütün qalaktikalarda daxil olmaqla hərəkət edən materiyanın bütün məcmusu.

**KREASİONİZM** [lat. Creatio – yaradılma, yaratmaq] – dünyanın, canlı və cansız təbiətin vahid yaradıcılıq əməli ilə yaradılması haqqında idealist təlim.

**KRİTERİYA** [alm. Kriterium; fr. Criterium, critère; ing. Criterion; yun. Kriterion; osm. tr. mısdak, miyar, kıstas] – ayırma və ittiham etmə vasitəsi, doğrunu səhvdəm ayırd etmək üçün bir vasitə.

**KRİTİSİZM** [alm. Kritizismus; fr. Critisisme; ing. Critisism; osm. tr. intikadiye, tenkidiye]. İnsan biliyinin sərhəddi üzərində fəlsəfi şüuru və bu şüurun oyanıq tutulması. Kantda əql və biliyin sərhəddini və imkanlarını təyin etmək şərtilə doqmaçılığın və şübhəçiliyin qarşısına qoyduğu fəlsəfə metodu. Kantın və onun məktəbinə daxil olanların fəlsəfi metodudur.

**KÜTLƏ** [alm.=fr. Masse; ing. Mass; lat. Massa; osm. tr. kütle; ər. جمعات] – sosial – psixoloji anlam olaraq öz daxilində bölünməmiş, ya gəlib keçici hissiyatında yaxud da bir xarici gücün təsiriylə bir bütün əmələ gətirən insan qələbəliyi.

## L

**LAQEYDLİK –** [alm. Indifferenz, gleichgüligkeit; fr. Indiifference; ing. Indifference; lat. Indifferentia; trk.lakaydi, aldırmazlık] – müəyyən hallara, vəziyyətlərə, çıxan hadisələrə heç bir reaksiya verməmək.

**LƏYAQƏT** – şəxsiyyətin nüfuzu haqqında təsəvvürü ifadə edən əxlaqi şüur anlayışı, etikanın insanın öz-özünə və cəmiyyətin fərdə əxlaqi münasibətini ifadə edən kateqoriya.

**LİBERLİZM** – cəryanı fransız maarifçiləri və filosofları (J.J.Russo, Didro, Lametri ), ingilis filosofları (C.Lokk, T. Hobbs) və utopik sosialistlərin yaradıcılığında yer almış “təbii hüquq” nəzəriyyəsinə və dövlətin yaradılması haqqındakı “ictimai müqavilə” təliminə əsaslanır. Əsas fikir bundan ibarətdir ki, insanlar dünyaya gələrkən hamısı bərabər təbii hüquqlara malik olurlar.

**LOBBİÇİLİK*** – (“Lobbi” – ingilis parlamentinin dəhlizi belə adlanır, buraya insanlar deputatlara qeyri-rəsmi təsir göstərmək üçün gəlirdilər) ictimai şüurda birmənalı qarşılanmır, həm pozitiv, həm neqativ məna daşıyır. Lobbiçiliyin ifrat neqativ ifadəsi müəyyən qrup və şəxslərin maraqlarının təmin olunması üçün hakimiyyət nümayəndələrinə qeyri-qanuni təzyiq edilməsi, rüşvət və korrupsiyadır.

**LİBERALİZM** [alm. Liberalismus; fr. Liberalisme; iing. Liberalism; lat. Liberalis = azad bir adama yaraşan; osm. tr. serbestiyye; tr. erkincilik] – Hamı üçün fikir, düşüncə azadlığı tanınmasının vacib olduğu görüşünü müdafiə edən, müstəqil

düşünməyə bağlı dünyagörüşü. Fəlsəfi baxımdan fərdiyyətçilik tendensiyasına bənzəyir. İctimai dəyərlərdən daha çox şəxsi dəyərlər daha üstün tutulur.

**LİBİDO** [lat. Libido – şövq, arzu, ehtiras, cəhd] – Freyd tərəfindən fəlsəfəyə, psixoloji psixoanalitik ədəbiyyta gətirilmiş və seksual meyli, seksual ehtiras dərəcəsini, məhəbbət instinktini, psixi enerjini bildirən anlayış.

**LOQOS** [yun. legein – demək, danışmaq] – Yunan dilindəki ilkin mənası söz, sonralar isə düşüncə, fikir, anlam, əql kimi mənaları da ehtiva etmişdir. İlk dəfə heraklitin təlimində dünyanın ümumi qanunauyğunluğu mənasında irəli sürülmüş fəlsəfi termin.

**LOGİSİZM** – Riyaziyyatın əsaslandırılmasında başlıca cərəyanlardan biri; bütün riyaziyyatı məntiqə müncər etməyə səy göstərir.

**LOGİSTİKA** – məntiqi hesablamaların ilkin adı. Leybnits çox vaxt riyazi məntiqdən L. Kimi bəhs etmişdir.

**LƏDÜNNİ** elm – ilham yolu ilə qazanılan bilik.

**LƏVAİH** – ilk zühur edən nur parıltıları.

**LƏVAMI`** - ləvaihdən sonra gələn nur və təzahür.

**LÖVH-i məhfuz** – hifz olunan lövhə. Tanrı dərgahında olan bu böyük lövhənin üzərinə olmuş və olacaq hər şey yazılmışdır. Bəzi təfsirçilərə görə, Qurani Kərim də Peyğəmbər əleyhissəlama nazil olmamışdan qabaq bu lövhədə yazılmış idi. Cəbrayıl mələyi də nazil olunan ayələri buradan peyğəmbərə gətirmişdir.

## M

**MAKROKOZMOS** – Böyük aləm- Kainat: Kainatın hamısı üçün istifadə edilən anlayışdır. Makrokosmos deyəndə insanı xaricdən əhatə edən böyük dünya nəzərdə tutulur. Antonimi mikrokosmosdur.

**MAKUL** Aləm: Duyğuları aşan, tək zehin və saf ağıl ilə qavranan aləm.

**MAKSİM** [alm.=fr. Maxime; ing. Maxim; lat. Maxima regula - ən böyük, ən yüksək qayda; osm. tr. kaide-i külliyye, mesel; ər. **قائدة كليَّة**] - əxlaq ideyası yaxud Kanta görə bir insanın öz istək və fəaliyyətlərini müəyyən etmək üzrə qoyduğu əxlaq ideyası.

**MALUL**: Varlığı başqasının varlığından olan hər şeydir.

**MƏDƏNİYYƏT**- Etnoqrafiyada – geniş istifadə olunan anlayışlardan biri də mədəniyyət terminidir. Bu anlayış öz tətbiq sahəsindən asılı olaraq müxtəlif mənalarda işlədilir. Fəlsəfi mənada mədəniyyət dedikdə təbiət tərəfindən deyil, yalnız insan tərəfindən yaradılan bütün şeylər başa düşülür. Latın dilindən götürülən “kultura” anlayışı “hazırlanmış”, “emal edilmiş” sözlərinə uyğun gəlir. Ümumi fəlsəfi anlayış olan “mədəniyyət” anlayışı etnoqrafiyada bir xalqı başqasından fərqləndirən maddi və mənəvi həyat amillərinin xüsusiyyətləri şəklində izah edilir.

**MƏRASİM** – etnosun müəyyən sosial, ailə və mənəvi həyatı ilə bağlı olan reqlamentli hadisələrdir. Adətlə fərqləndirmək üçün onlar aşağıdakı söz birləşmələri şəklində işlədilir: dəfn mərasimi, toy mərasimi, qonaqpərvərlik adəti, oğulluğa götürmə adəti və s.

MONARXİYA – (yunanca – təkhakimiyyətlilik) – elə bir idarəetmə formasıdır ki, burada ali hakimiiyət vətəndaşların iradəsindən asılı olmayaraq tam və ya qismən bir mütləq dövlət başçısının (imperator, kral, sultan, şah və s.) əlində cəmləşmişdir. Monarxiyanın xüsusiyyətləri: ➢ hakimiyyət vərasət yolu ilə ötürülür; ➢ müddətsiz olaraq həyata keçirilir; ➢ əhalinin iradəsindən asılı deyil.

**MANİXEİZM** [alm.Manichäismus; fr. Manicheisme; ing. manichaeism] Əsasını İranda miladi III əsrdə Mani qoymuşdur, onun yaratdığı yarı fəlsəfi, ideoloji, ictimai təlim. Bu təlimin əsasında zərdüştiliyin yaxşı və pis yaxud xeyir və şərin arasında gedən əbədi mübarizədən bəhs edən ideoloji fikirlər dayanır.

**MƏBDE** – ideya, prinsip, başlanğıc: İlk olan özündən, başqa şeylərin çıxdığı təməl mənşə, əsl.

**MEXANİZM** [mecanisme] – mekanikçilik: Bütün cismani dəyişiklikləri mexaniki hərəkətlərlə açıqlamağa çalışan görüş.

**METAFİZİK** [methaphysique] – Fizik ötesi –İlm-i mababdet tabia: "İlk xəstəliklərin və ilk prinsiplərin elmi" deyə tərif olunur.

**MƏQSƏD** [alm. Zweck; fr. Fin; ing. End, purpose; lat. Finis; yun. Telos; osm. tr. gaye]. Həyata keçirmək məqsədilə qurulan və qovuşmaq istənilən məfhum, şey.

**MİF** [alm. Mythos; fr.=ing. Mythe; yun. Mythos – söz, deyilən və hiss edilən söz, nağıl, əfsanə; osm. tr. üstüre; ər. أسطورة] – tanrılar, qəhrəmanlar, əvvəlki zamanların hadisələri üzərinə deyilənlər, nağıllar, əfsanələr. Yaxud hər hansı bir cəmiyyətdə əfsanə formasında canlı olaraq yaşayan əvvəlki adət və ənənələrdə, düşüncələrdə dilə gəlmiş olan əfsanələr.

**MİFOLOGİYA** [alm.=fr. Mythologie; ihology; yun. Mythologia; osm. tr. ilm-i esatir; ər.علم أساتير; tr. Söylence bilim] Miflər, mifik rəvayətlər toplusu, əsatir. Yunan mifologiyası, mifləri tədqiq edən elm.

**MONİZM** [monisme] – Bircilik-Tekçilik: Kainatdakı hər şeyi bir tək prinsipə  [maddə, ruh və ya fikir] irca edər.

**MONOTEİZM** [monotheisme] – Tek Tanrıcılık-Vahdaniyyet: bir tək ilaha inanmağı ifadə edir.

**MUHAL** [impossible] – İmkansız: Məntiq və metafizikada ziddiyyəti içinə alan şeydir.

**MÜHƏRRİK** [moteur] – Hareket etdiren, Kımıldatan: Aristotelə görə Tanrı və ya aləmdə hər cür dəyişmənin, meydana gələn xəstəliyi olan lakin özü heç bir dəyişiklik tabe olmayan sırf hərəkətdir.

**MUTLAK** [absolu]: Qeydə şərtə bağlı olmayan, sərhədsiz sonsuz, dəyişməz və müstəqil olan.

**MÜSTEFAD** [acquis] – Kazanılmış-Müktesep: Bir şəxs və ya növdə əvvəlcədən var olmayıb, sonradan kəşf edilən.

**MAARİFÇİLİK** – [ər. معارف] ictimai-siyasi cərəyan; nümayəndələri mövcud cəmiyyətin nöqsanlarını aradan qaldırmağa, həmin cəmiyyətin əxlaq, siyasət və məişətini xeyir-xahlıq, ədalət ideyalarının, elmi biliklərin, yayılması yolu ilə dəyişdirməyə çalışmışlar.

**MAGİYA** [yun. Magia – cadügərlik, sehrbazlıq, ovsunculuq] – ibtidai din formalarından biri; aydın olmayan hadisələr sehirli qüvvələrin təsirinə aid edilir; bu forma insan və heyvanlara,

təsəvvürə gətirilən ruhlara təsir göstərmək məqsədi daşıyan ayinlərin məcmusunda ifadə olunur.

**MAN** [alm. Man – qeyri-müəyyən şəxs əvəzliyi] – ekzistensializmin əsas anlayışlarından biri; Haydegger tərəfindən elmə gətirilmişdir.

**MANDEİZM** – e.ə. I minilliyin ikinci yarısı – eramızın başlanğıcında Cənubi Mesopotamiyada meydana gəlmiş dini təlim.

**MANİLİK** – Zərdüştiliyin, budizmin, xristianlığın, qnostisizmin və digər təlimlərin təsiri altında yaranmış dini-fəlsəfi təlim.

**MATERİALİZM** [lat. materialis – maddi, real] – idealizmə əks elmi fəlsəfi cərəyan.

**MATERİYA** [alm. Materie; fr. Matière; ing. Matter; lat. Materia, materies; yun. Hyle; osm. tr. madde; ər. مآدّة] – Dekarta görə maddə məkan tutan hər şeydir. Materiya ruhun əksidir. Maddi olanlar ruhi və mənəvi olanlarla eyni mahiyyətdən deyil. İnsan şüurundan kənarda və ondan asılı olmayaraq mövcud olan və həmin şüurda iniaks etdirilən obyektiv reallıq. Maddə və formanın, reallığın iki ideyası olduğunu irəli sürən təlimə isə Hilemorfizm [alm. Hylemorphismus; fr. Hylèmorphisme; ing. Hylemorphism; yun. Hyle – maddə, morphè - forma] deyilir.

**MATRİARXAT** [mater – ana, yun. Arche – hakimiyyət] – ibtidai icma quruluşunun qəbilə təşkilinin forması; istehsalda [nəslin tərbiyə edilməsi, ictimai təsərrüfatın aparılması, ailənin saxlanması və digər mühüm həyati funksiyalar] və qəbilə icmasının sosial həyatında [icma işlərinin idarə edilməsi, onun

üzvləri arasındakı münasibətlərin tənzimlənməsi, dini ayinlərinicra edilməsi və s.] qadının aparıcı rolu ilə səciyyələnir.

**MATERİALİZM** [alm. Materialismus; fr. Materialisme; ing. Materialism; osm. tr. maddiye; ər. **مآديَّةٌ**] – hər növ reallığın hətta ruhi və mənəvi olanların da əsasını maddədə görən, maddədən başqa heç bir şeyin olmadığınl iddia edən dünyagörüşü. Hərşeyi maddə və ya maddəyə aid olana irca ediləbilər olduğunu iddia edən fəlsəfi bir sənətdir.

**MAXİZM** – bax Max, Empiriokritisizm.

**MAHAYANA** [sanskritcə - böyük araba və ya böyük yol] – budizmin ən böyük [hinayana ilə yanaşı] variantlardan biri.

**MAHATMA** [sanskritcə - mahatma] – 1] hind mifologiyası və teosofiyasında dünya ruhu; "ilahi, fövəladə insan"; 2] hindistanda görkəmli, xüsusi ehtiram bəslənilən adamların adına edilən əlavə.

**MAHİYYƏT** [alm. Wesen; fr.=ing. Essence; lat. Essentia; yun. Ausia; osm. tr. zat, mahiyet ər. **ماهية]** – varlığın əslini təşkil edən şey. Əsas xüsusiyyət, təməl əsas. mövcud şeyin mənası, bütün digər şeylərdən, bu və ya digər şəraitin təsiri altında şeyin dəyişkən vəziyyətlərdən fərqli öz-özlüyündə mövcud olan.

**MEDİTASİYA** [lat. meditatio – fikirləşmə, düşünmə] – məqsədi insan psixikasını dərin dalğınlıq vəziyyətinə gətirən əqli fəaliyyət.

**MERİTOKRATİYA** [lat. meritus – layiqli, yun. Kratos – hakimiyyət] – burjua politologiyasında anlayış; şəxsi xidmət və bacarıqları əsaslarında seçilmiş şəxslərdən ibarət hökümət tərəfindən idarə edilən cəmiyyət ifadə olunur; "postindustrial

cəmiyyət" və ya "bilik cəmiyyəti"nin ["istehlak cəmiyyəti"ndən sonra gələn] sinonimidir.

**METAQALAKTİKA** [hərfi mənada "qalaktikadan kənarda olan"] – mlrd.-larla qalaktikaların daxil olduğu kosmik sistem.

**METANƏZƏRİYYƏ** – Tədqiqat predmeti hər hansı digər nəzəriyyə olan nəzəriyyə.

**METAMƏNTİQ** – Müasir formal məntiqin sistem və anlayışlarını tədqiq edən nəzəriyyə [Metanəzəriyyə].

**METARİYAZİYYAT** [sübutlar nəzəriyyəsi] – formal sistemlərin və hesablamaların müxtəlif xassələrinin öyrənilməsilə məşğul olan nəzəriyyə.

**METAFİZİKA** [alm. Metaphysik; fr. Mètaphysique; ing. Metaphysics; yun. Meta physika; osm. tr. mabad-et-tarbiya]. Varlığın son təməlləri, özü və anlamı haqqında təlimlər. Aristotelin ilk fəlsəfə adını verdiyi "bütün var olanlar üçün ortaq ideyalar"ı araşdıran abidə.

1. "M." termini e.ə. I əsrdə Aristotelin fəlsəfi irsinin bir hissəsini göstərmək üçün meydana gəlmişdir.

**METOD** [alm. Methode; fr. Mèthode; ing. Method; lat. Methodus; yun. Methods; osm. tr. usul] – bir qayəyə çatmaq üçün izlənilən, tutulan yol. Elmlərdə müəyyən bir nəticəyə qovuşmaq üçün gedilən yol.

**METODOLOGİYA** [alm. Methodologie, methodenlehre; fr. Mèthologie; ing. Methodology; osm. tr. usuliyat] xüsusilə fəlsəfə və elm sahəsində metod araşdırmaq və yeni üsullar əmələ gətirmək şərtillə ideyaları inkişaf etdirən elm. Hər hansı elmdə

istifadə olunan idrak vasitələrinin, metodlarının, üsullarının məcmusu.

**MEXANİSİZM** – Təbiət və cəmiyyətin inkişafını materiya hərəkətinin mexaniki formasının ən universal hesab olunan və maddi hərəkətin bütün növlərinə şamil edilən qanunları ilə izah edən dünyagörüşü.

**MƏDƏNİYYƏT** [ər. مدنية]– varlığın və şüurun bütün sahələrində bəşəriyyətin predmetləşdirmə [sərvətlər, normalar, işarə sistemləri yaradılması və s.] və predmetsizləşdirmə mədəni irsin mənimsənilməsi] proseslərin dialektik vəhdətindən ibarət, gerçəkliyin yenidən dəyişdirilməsinə, bəşər tarixi zənginliyinin şəxsiyyətin daxili zənginliyinə çevrilməsinə, insanın mahiyyət qüvvələrinin hər vasitə ilə aşkara çıxarılmasına və inkişaf etdirilməsinə yönəldilmiş sosial-mütərəqqi yaradıcı fəaliyyəti.

**MƏZDƏKİLİK** – V əsrin sonunda İranda yaranmış, sonralar Azərbaycanda və bir sıra qonşu ölkələrdə geniş yayılmış dini-fəlsəfi və sosial təlim.

**MƏCBURİYYƏT** [alm. Notwendigkeit; fr. Nècessitè; ing. Necessity; lat. Necessitas; osm. tr. zaruret; ər. ضرورة] – olduğundan başqa olmama hallı. Məntiqi riyazi anlamda məcburiyyət. Anlamların və prinsiplərin məntiqi əlaqəsində və nəticələrində olur. Düşüncə baxımından məcburi reallıqlar.

**MƏFHUM** [alm. Begriff; fr. Concept, notion; ing. Conception, notion; lat. Conceptus, notia; yun. Logos, ènoia; horos, noema; osm. tr. mefhum; tr. Kavram; ər. مفهومٌ] – obyektlərin yaxud da hadisələrin müştərək xüsusiyyətlərini ehtiva edən və bir müştərək adda cəm edən ümumi kəlmələr.

**MƏDƏNİYYƏT** [alm. Kültür; fr. = ing. Culture; lat. Cultura; colere – baxmaq, həsrətində olmaq; osm. tr. hars.] 1. Konkret mənada bədənlə və ruhla əlaqəsi olan müəyyən qabiliyyətləri inkişaf etdirmək, əqli və əxlaqi savaddır.

**MƏİŞƏT** [ər. **معيشة**]– cəmiyyət həyatının insanın özünün təkrar istehsalı ilə bilavasitə bağlı mühüm sahələrindən biri; qida məhsulları, paltar, mənzil, istirahət, əyləncə, sağlamlığın mühafizə edilməsi və s. tələbatın öyrənildiyi maddi və mədəni mühit.

**MƏN** [alm. Ich; fr. Moi; lat. Ego; osm. tr. ene; ər. **أنا**] – türkdilli terminologiyaya aiddir. 1. Şüurlu olaraq özünü başqalarından fərqləndirən, ayıran kəlmə. Aləmə və öz-özünə fəal yanaşan, münasibət bəsləyən insan şəxsiyyətinin, insan fərdliliyinin mənəvi mərkəzi. Dekart məni düşünən varlıq hesab edirdi.

**MƏNAFE** – fərdlərin, sosial bliklərin [sinfin , millətin, peşə qrupunun] hərəkətlərinin sosial davranışını müəyyən edən səbəb.

**MƏNTİQ** [alm. Logik; fr. Logique; ing. Logic; yun. Logike – tekhne; ər. **منطق**] - ərəb dilindəki **نطق** [I babda] felinin mim məsdəiridir. Dilimizə hərfi mənada danışma, nitq söyləmə mənalarına uyğun gəlir. Əslində isə düzgün fikirləşməyin metodu, düşüncənin varlıq formalarının, elementlərinin, növlərinin, imkanlarının qanun və qaydalarının elmi. Məntiq elminin qolları və şaxələri çoxdir, bax dialektik məntik, riyazi məntiq, formal məntiq, psixoloji məntiq, filoloji məntiq və s. hər şeyi məntiqinə uyğunlaşdırmağa isə məntiqçilik [logismus] deyilir.

**MƏHƏBBƏT** [ər. مهبة]– insanların qarşılıqlı maraq və meyllərinə əsaslanan ünsiyyət və yaxınlıq münasibətlərindən doğan dərin intim hiss.

**MƏKAN** [alm. Raum; fr. Espace; ing. Space; lat. Spatium; osm. tr. mekan; ər. مكان] – daxilində bir cismin ola biləcəyi yerlərin hamısını göstərən termin. Bütün var olanları içərisində ehtiva etdiyi yer. Fəlsəfənin təməl anlamı olaraq daha əvvəl Yunanlı atomistlərdə də vardır.

**MƏSULİYYƏT** [alm. Verantwortung; fr. Responsabilitè; tr. Sorumluluk; ing. Responsability; osm. tr. mesuliyet; ər. مسؤليّة] – insanın öz fəaliyyətlərini yaxud da öz təsir sahəsinə daxil olan hər hansı bir hadisənin nəticələrini öz boynuna götürməsi.

**MİKROSOSİOLOGİYA** [yun. Mikros – kiçik] – sosiologiyanın bölməsi; öyrənmə obyektini [üzvləri bir-biri ilə sabit şəxsi ünsiyyətdə olan tərkibcə azsaylı sosial qruplar] təşkil edir.

**MİLLƏT** [ər. ملة]– insan birliyinin tarixən təşəkkül tapmış və xalqı əvəz etmiş forması, insanların yeni sosial və beynəlmiləl birliyi.

**MİMANSA** [sanskritcə - tədqiqat, mülahizə] – hind fəlsəfəsinin ortodoksal sistemlərindən biri.

**MİSTİSİZM** [alm. Mystizismus; fr. Mysticisme; ing. Mysticism; osm. tr. tasavvuf; tr. gizemçilik] – ruhi – mənəvi hal və tutum, naməlum qalan və üstüörtülü olan məsələlər, İlahi müşahidə yolu ilə həqiqətlərə, yaxud Tanrıya qovuşma fəaliyyətləri. Mistisizm bəzən fövqəltəbii bir qüdrəti əldə etmək və işlərini bu qüdrətin sayəsində həyata keçirə bilmək üçün həqiqətlərin səbəblərini bilib ortaya çıxarmaq fəaliyyətləri kimi də xarakterizə

edilir. İnsanın təbiət üstü aləmlə səmimi bir şəkildə doğrudan doğruya əlaqə qurub birləşməsinin imkanına inanan, qaynağı ağıl və duyğular olmayan üstün bir məlumat hiss gücü və vəcd yoluyla əldə etdiyinə inanan, beləcə Allaha çatıldığını irəli sürən görüş.

**MİSTİK** [alm. Mystichh; fr. Mystique; ing.mystic; mystical; yun. Mystikos – myein – gözlərini yumub bağlamaq, örtmək; osm. tr. tasavvuf; ər. **تصوف**] – hissi idrakın xaricində sirli sehirli mənəvi nurlanmağa aid olan.

**MİFOLOGİYA** [yun. Mytologia, muthos – rəvayət, əfsanə, logos – təlim, söz] gerçəkliyin ibtidai şüurda qədim dövr üçün səciyyəvi olan şifahi xalq yaradıcılığında təcəssümləşmiş fantastik inikası.

**MODALLIQ** [məntiqdə] [lat. modus – ölçü, üsul] – mühakimənin, həmin mühakimədə söylənilən iqrari fikrin "qüvvəsinə" xarakteristikası: mühakimə zəruri, mümkün, təsadüfi, qeyri mümkün və s. ola bilər.

**MODELLƏŞDİRMƏ** [ fr. Modele – nümunə, ilkin nümunə] – müəyyən obyektin xarakteristikalarının öyrənilməsi üçün onların xüsusi yaradılmış digər obyektdə təkrar yaradılması.

**MONARXİYA** – [alm.=fr. Monarchhie; ing. Monarchy; yun. Monos – tək, yeganə. Arkhein - suverenlik] – bir nəfərin suverenliyi, hakimiyyəti. Dövlət gücünün bir nəfərin əlində cəm olunmasını bildirən dövlət forması.

**MONADA** [alm.=fr.=yun. Monas – vahid] – varlığın struktur, substansional vahidini ifadə edən fəlsəfi termin.

**MONİZM** [alm. Monismus; fr. Monisme; ing. Monism; yun. Monos – tək, vahid; osm. tr. vahdetiye; ər. **وحديّة**] – bütün mövcu-

datın əsasında bir başlanğıcın dayandığını qəbul edən fəlsəfi təlim.

**MONOTEİZM** – [alm. Monotheismus; fr. Monotheisme; ing. Monotheism; yun. Monos – tək, yeganə. Theos – Tanrı. osm. tr. vahdetiye - ər. **وحدتية**] – Ancaq bir Tanrının varlığını qəbul edən din və fəlsəfi təlim.

**MORFOLOGİYA** [alm. , fr. Marphologie; ing. Marphology; yun. Morphe = forma, logos = elm; osm. tr. mebhasu-l eşkal; ər. **آلأشكال مبحاس**]

**MOTİV** [alm. Motiv; fr. Motif; ing. Motive; lat. Movere – qımıldatmaq; osm. tr. saik; ər. **سائِك**] – hər hansı bir istəkdən doğan fəaliyyətin səbəbi, hərəkətverici qüvvəsi. Motivasiya isə istəyin motivlərlə təyin edilməsidir. Motiv insanın tələbatını təmin etməyə yönəlmiş hərəkəti şərtləndirən düşünülmüş meyldir.

**MƏAD** – Axirət dünyası, insanların öldükdən sonra həşr olunduqları yer.

**MƏBDƏ** – Başlanğıc, birinci olan. Özündən başqa şeylərin törədiyi ilkin mənşə.

**MƏFKURƏ** [alm.=ing. Idea; fr. Idèal; osm. tr. mefjure; ər. **مفكورة**; tr. Ülkü ] – fikir, məfkurə, qayə, insanı hisslər dünyasının fövqünə çıxaran qayə. 1. Ən yüksək, ən yetişkin həqiqət. Mücərrəd olaraq düşünülmüş şey. 2. Ancaq ideya olaraq var olan.

**MƏXLUQAT** – Yaradılmışlar, Allahdan başqa bütün varlıqlar məxluqat hesab olunur. Çünki yeganə yaradılmayan varlıq Allahdır. O ilkin varlıq və bütün varlıqların səbəbidir. Tanrının varlığı üçün yaradılma, bölünmə və məhv olma kimi xüsusiyyətləri düşünmək olmaz. Onun varlığı zəruridir. Yəni var olma

etibarı ilə özündən başqa heç nəyə ehtiyacı olmayandır. Tanrının varlığından başqa bütün varlıqlar isə mümkün varlıqlardır. Onlar var olmaları üçün Tanrının varlığına möhtacdırlar.

**MÜDDƏT** [alm. Dauer; fr. Durèe; ing. Duration; osm. tr. müddet, sayrure] – öz bütünü daxilində alınmış, məhdud bir zaman parçası, axıb gedən zaman dilimində bir parça.

**MÜMTƏNİ** [vacib əl – mümtəni] Yoxluğu müqabilində varlığı düşünülməyəndir. Allahın yoxluğunun düşünülməməsi, dörd sayının tək olmasının iddia edilə bilməməsi kimi. Mümteninin xüsusiyyəti heç bir vəchlə var olmamasıdır. Bu onun mahiyyətinin gərəyidir. Mümtenini əqlənvar olan bir obyekt kimi təsəvvür etmək belə mümkün deyil. Buna Muhal və ya müstəhil də deyilir. İkinci bir Tanrı ideyası heç bir zaman düşünülə bilməz.

**MÜMKÜN** [alm. Kontingent; fr.=ing. Contingent; lat. Contingens; osm. tr. **ممكنْ**] – nə zəruri, nə də imkansız olan, yəni nə olmayan nə də mütləq olan.

**MÜNTƏHİ** – Sülukunda sona çatmış şəxsdir. **müntəhi** sona çatan, bitən, kamilliyə çatmış.

**MÜSTƏFAD** – Şərq peripatetiklərinin "əqllər" nəzəriyyəsinə görə, müstəfad əql qazanılmış olub, şəxsin özünə aid deyil.

**MÜŞTƏRƏKLİK** [alm. Gemeinschaft; fr. Communautè; ing. Community; osm. tr. cemaat] – ortaq olmanın təyinatı. Ortaqlaşa həyata keçirilən maddi və mənəvi dəyərlərə əsaslanan ictimai kontakt.

**MÜSTƏĞNİ** – Zəngin olmaq, ehtiyacı olmamaq.

**MÜTƏMADİ** [alm. Kontinuierlich; fr. Continu; ing. Continuous; lat. Continium; osm. tr. metamadi; ər. **متمآدي**] – öz daxilində daimi olaraq davam edən, gedən zaman.

**MÜTƏSƏVVİF** – Təsəvvüflə məşğul olan.

**MÜTLƏQ** [alm. Absolut; fr. Absolu; ing. Absolute; lat. Absolutus = həll olan, osm. tr. mütləq; ər. **مطلق**] – öz başına var olan, heç bir şeylə bağlı olmayan, müstəqil, şərtsiz. Heç bir şeylə məhdudlaşdırılmayan. Metafizikada olduğu kimi, düşüncədə də heç bir başqa şeylə bağlı olmayan və varlıq səbəbini özündə daşıyan şey. Heç nədən asılı olmayıb, sərhəd tanımayan, müstəqil olaraq baş verən hal və hadisələri ifadə edən məfhum. Həqiqətdə olan mütləqlik öz ifadəsini insan düşüncəsində tapır.

**MÜTLƏQİYYƏT** [alm. Absolutismus; fr. Absolutisme; ing. Absolutism; osm. tr. mutlakiyet; ər. **مطلقية**] – ideyaları, normaları. Terminləri doqmatik bir formada saf olaraq qoyan görüş. Saf dəyərlərin, saf doğrularım ortaya çıxdığını müdafiə edən görüş.

**MÖVCUDLUQ** [ər. **موجودية**]– bir-birilə əlaqədə və qarşılıqlı təsir halında dəyişən şeylərin bütün rəngarəngliyi.

**MÜQAYİSƏ** [ər. **مقايسة**]- obyektlər arasındakı oxşarlıq və ya fərq əlamətini [yaxud hər ikisi birlikdə] müəyyən etmək məqsədi ilə onların bir-birilə tutuşdurulması, fərqləndirilməsi.

**MÜQƏDDƏM** [alm. Antecedent; fr. Antècèdent; ing. Antecedent; lat. Antecedens; osm. tr. mukaddem; ər. **مقدمٌ**] – məntiqdə nəticənin çıxardığı prinsip və yaxud prinsiplər.

**MÜQƏDDİMƏLƏR** [ər. **مقدمة**]– məntiqdə, əqli nəticələrdə yeni mühakimənin [nəticənin] alındığı mühakimələr.

**MÜQƏDDƏS** [alm. Heilig; fr. Saint; ing. Saint, holy; sanctu; osm. tr. kutsi; **مقدس**] – Tanrıya həsr edilmiş olan, Tanrıya aid olan, bütün var olanların, yer üzünə bağlı olanın üstündə yüksələn, ondan tamamilə başqa olan. Yaxud da əxlaqi yetişkənliyə çatan, bu yolla Tanrıya yaxınlaşan insanların necəliyi. [Əzizlər, övliyalar, kəramət sahibləri].

**مقدس [مفعل] [فعَّل] قدَّس**

**MÜLAHİZƏ** [ər. **ملآهزة**] – müasir formal məntiqdə müəyyən dildə verilən təklif; onun həqiqiliyinə [həqiqidir, yalandır] və ya modallığına [ehtimaldır, mümkündür, mümkün deyil, zəruridir və s.] verilən qiymətlərlə əlaqədər nəzərdən keçirilir.

**MÜLKİYYƏT** [ər. **ملكية**] – hər hansı obyektlərin subyektə məxsus olması.

**MUXTARİYYƏT** [alm. Autonomie; fr. Autonomie; ing. Autonomy; yun. Autos – öz, nomiso – qayda; osm. tr. muhtariyet] – bir adamın, bir cəmiyyətin özünün qoyacağı qaydalara özünün tabe olacağı. **muxtariyyət : is. [ər.]** Daxili qanunvericilik və idarəetmə işlərində sərbəst olma hüququ; özünüidarə.

**MÜNASİBƏT[ər.مناسبة]** bütün hadisələrin qarşılıqlı əlaqə anı.

**MÜTLƏQ [ər. متلق]** – “özü onun özü üçün kafi olan” digər heç bir şeydən asılı olmayan, bütün mövcudiyyatı özündə əks etdirən və onu yaradan əbədi, sonsuz, şərtsiz, bitkin və dəyişməz subyekti ifadə etmək üçün idealist fəlsəfəsində işlənir.

**MÜHARİBƏ [ər. مهآربة]**dövlətlərin və bu dövlətlər daxilində siniflərin siyasətinin zorakılıqla davam etdirilməsindən ibarət olan ictimai-siyasi hadisə.

**MÜCƏRRƏD** [alm. Abstrakt; fr. Abstrait; ing. Abstract; lat. Abstractum – çəkib çıxarılmış, sıyrılmış; osm. tr. mücerret; ər. **مجرّد**] – mücərrədlik ilə əldə edilmiş bir düşüncə. Mücərrəd anlamlar ehtiva edən məfhum.

**MÜCƏRRƏDLİK [ər. مجرد]** – həqiqəti nəzəri dərk etməyin elmi cəhətdən müəyyənləşdirilmiş müşahidə və eksperiment faktları ilə bağlı olmayan mücərrəd məntiqi mühakimələrə əsaslanan üsulu.

**MÜŞAHİDƏ** [alm. Beobachtung; fr.=ing. Observation; tr. Gözlem; osm. tr. müşahede; ər. **مشاهدة**] – bir obyekt, yaxud bir hadisənin xüsusiyyətlərini bilmək şərtilə diqqətli və planlı olaraq araşdırılıb tədqiq edilməsi. Müşahidə əslində bütün empirik eılmlərin ilkin şərtidir. Lakin, bu o deməkdeyildir ki, tənqid edilmdən keçərli olmaz, çünki ən dəqiq müşahidələr belə nöqsansız, xətasız olmaz.

## N

**NATURALİZM** [alm. Naturalismus; fr. Naturalisme; ing. Naturalism; ər. ألطبيعية; **lat.** natura – təbiət + ism] – hər şeyi təbiətə əsaslandıraraq tədqiq edən dünyagörüşü. Təbiətə verilən anlam baxımından fərqli anlamlar verir. Təbiətin xaricində heç bir həqiqət və dəyər olmadığını irəli sürən doktrina

**NATÜRİZM** [naturisme] – Təbiətpərəstlik: Dinin başlanğıcında Günəş, Ay, Ulduzlar və Od kimi təbii varlıqlarla Fırtına kimi təbiət hadisələrindən eşidilən qorxu və gözlənən ümid nəticəsində onlara bir şəxsiyyət verib, tapma surətiylə ortaya çıxdığını irəli sürən görüş.

**NƏFS-i Natika**: Düşünən və düşündüyünu söyləyən nəfs,ruh.

**NOMİNALİZM** [nominalisme] – İsimcilik: Ümumi fikirlərin və küllülərin nə zehində, nə zehnin xaricində, özündən və ya təcrübənin məhsulu olaraq olmadıqlarını, onların bir xəyal və addan yəni, yalnızca əşyanın adları olduğunu və bir termindən ibarət olduğunu qəbul edən görüş.

**NOUS**: Aləmi tənzim edən və maddi olmayan mebde prinsip.

**NAİTİVİZM** – İdrakın mistik-dini xarakteri haqqında idealist təlim; təlimdə həqiqət realist-məntiqi yolda və ya diskursiv qaydada deyil, guya qəflətən heç bir hazırlıq olmadan, təkcə qeyri-şüuri ilhamın, yəni ilhamlanmanın nəticəsində yaranmış, ilahi təlqin şəklində insana yuxarıdan söylənilmiş fikrin köməyilə açılır.

**NAMUS –** Fərd tərəfindən özünün ictimai əhəmiyyətini, dəyərini dərk etməsini və bu dəyərin cəmiyyət tərəfindən qəbul

edilməsi anlarını özünə daxil edən əxlaqi şüur anlayışı;etik kateqoriya.

**NATURA** [alm. Natur; fr. Nature; lat. Natura; yun. Physis; osm. tr. tabiat; ər. طبيعة; tr. doğa] – 1.Hər bir var olan şeyin sırf özünü təşkil edən şey yaxud struktur. 2.Insanın əsasını qoyduğu sistemlər, formalarla [mədəni, sosial, texniki] əksliklər içərisində öz-özünə meydana gələn, formalaşan. 3.İnsanın qarşısında olan, ona yad olan və buna görə də məlum olmayan, naməlum qalan, öz qüdrətindən üstün olan, onun xaricində olan. 4.Hiss edilən və dərk edilən, qavranılan hər şey. 5.Kainat. 6.Hər şeyi öz mahiyyətində ehtiva edən bütün həqiqətlər. 7.Yaradıcı, xəlq edici varlıq. 8. Dünyaya gətirən, formalaşdıran, inkişaf etdirən, qoruyub bəsləyən "ana təbiət". 9.Təbiət elmlərinin mövzusu olan, dəyərlərin xaricində olan həqiqət – canlı, cansız təbiət mənasında.

**NAFİ** – Olmaq – boş olmaq, mənasız gəlmək.

**NƏHV** - Ərəb dilinin qrammatikasına verilən addır.

**NƏSİL** [alm. Generation; fr. Gènèration; ing. Generation; lat. Generatio; generare – doğurmaq; osm. tr. nesil; ər. نسيل] – ümumi olaraq eyni illərdə doğulan və eyni zəmanənin şərtlərini və beləcə bir-birinə bənzəyən sıxıntıları, taleləri yaşamış, oxşar tapşırıqlarla məsul olmuş insanların toplusu.

**NƏSİL** – Sosial həyatın ən mühüm anlayışlarından biridir. Nəsil öz mənşəyini vahid bir əcdaddan götürən qan qohumlarının ittifaqıdır. Antik dünyada nəsil sözünə "gens" anlayışı uyğun gəlir. **Ana nəsli** (Matriarxat – latınca "mater"- ana, yunanca "arxe" – hakimiyyət) hərfi mənada ananın hakimiyyəti deməkdir. Ananın hökmüranlığı bəşəriyyət tarixinin o dövrünə aiddir ki, bu

vaxt qadınlar sosial quruluşun yüksək pilləsində dururdular. Matriarxatizm ana xətti ilə qohum olan qan qohumlarının ittifaqıdır. **Ata nəsli** (Patriarxat – yunanca "patriarxe"-nəslin başçısı) kişilərin hakimiyyəti mənasında işlədilir. Etnoqrafiyada bu quruluş sinifsiz cəmiyyətdən sinifli cəmiyyətə keçid dövrü kimi xarakterizə olunur. Burada qohumluq ata xətti ilə müəyyənləşdirilir. Bununla belə ana nəsli qalıqları güclü olur. Patriarxatizm isə ata xətti ilə qohum olan qan qohumlarının ittifaqıdır. Qərbi Avropa ədəbiyyatında "klan" termini ata nəsli termini ilə sinonim sayılır.

**NƏZARƏT** – bu termin sufi terminologiyasında orijinal adı ilə "mürakəbə" adlanır. Nəzarət Allah-təaladan qullara istiqamətlənən bir hal olduğu kimi, qulun da öz nəfsi üzərində nəzarəti mümkündür. Bunu həyata keçirən sufi, nəfsini daim nəzarət altında saxlayaraq, onu günah əməllərdən, şəhvani duyğu və düşüncələrin əsirliyindən azad edir. Qul nəfsini nəzarət altında saxlamaqla öz üzərində ilahi nəzaərti unutmur.

**NƏZƏRİ** [alm. Theoretisch; fr. Thèoretique; ing. Theoretic; yun. Theorikos – nəzəriyə ilə bağlı; theoretikos – gözləməni, tədqiq etməyi sevən;əs.tr. **نظر**] – nəzəriyyə ilə bağlı olan, teorik düşünmə ilə biliyə yönələn şey.

**NÜBÜVVƏT** – Peyğəmbərlik. İslam dininə etiqad edən müsəlmanların iman əsaslarından biri də peyğəmbərlərə imandır. Peyğəmbər insanla Tanrı arasında vasitəçidir. Peyğəmbərlərə iman, insanlara doğru yolu göstərmək üçün Allah tərəfindən seçilmiş şəxslərin göndərilməsinə və onların Allahdan gətirdiyi hər şeyin doğru və həqiqət olduğuna inanmaq, peyğəmbərlər

haqqında vacib, qeyri-mümkün və caiz olan şeyləri və xüsusiyyətləri bilib, beləcə təsdiq etməkdir.

**NÜMAYİŞ** [alm.=ing. Demonstration; fr. Dèmonstration; lat. Demonstratio; osm. tr. bürhan; tr. Tanıtlama; ər. برهان] – önə sürülən bir müdafiənin həqiliyini məntiqi metodla göstərmək, nəticənin doğruluğunu göstərmək üçün, doğru olaraq məlum olan yaxud da doğru sayılan ilkinlərə əsaslanaraq edilən mənalı göstəriş.

**NEÇƏLİK** [alm. Quanität; fr. Quanitè; ing. Quantity; lat. Quantitas; yun. Posofei; osm. tr. kemiyet; ər. كميَّة] – ölçülə bilən, azalıb çoxala bilən böyüklük, necə, nə qədər, nə böyüklükdə– kimi sualların qarşılığı.

**NECƏLİK** [alm. Qualität; fr. Qualitè; lat. Qualitas; yun. Poiotes; tr. keyfiyet; ər. **كيفيَّة**]

**NEQATİV** [alm. Negativ; fr. Nègati; ing. Negative; osm. tr. menfi; ər.] – pozitiv olmayan, pozitivin əksi, neqativ enerji, neqativ rəy və s.

**NEMƏT [**ər. **نعمة**]– müsbət sərvəti ifadə etmək üçün fəlsəfədə işlədilən ən geniş anlayış.

**NEOPOZİTİVİZM** – XX əsr fəlsəfəsinin cərəyanlarından biri, poztivizmin müasir forması.

**NƏFY** [alm.=ing. Negation; fr. Nègation; yun. Apophasis; lat. Negatio; osm. tr. nefiy] – irəli sürülən bir tezisi tanımamaq.

**NƏZƏRİYYƏ** [ər. **نزرية**] – gerçəkliyin bu və ya digər "**fr**aqmenti, parçası" haqqında səhih, dürüst birliyin ümumiləşdirilmiş sistemi; həmin parçanı təşkil edən obyektlərin müəyyən məcmusunu təsvir və izah edir.

**NƏTİCƏ** [alm. Schluss, schlussats, konklusion; fr.=ing. Conclusion; lat. Conclusio; ər. **نتيجة]-** verilən səbəblərdən çıxarılan hökmlər. Əgər səbəblər doğrudursa nəticələri də çox zaman doğru olur. Nəticə yalnışdırsa, səbəblər heç vaxt doğru ola bilməz.

**NİFRƏT** [alm. Hass; fr. Haine; ing. Hate; osm. tr. nefret; ər. **نفرة**] – nəyəsə istiqamətlənmiş hiss. Kiminsə pisliyini istəməyə istiqamətlənmiş hiss. Yox etmə istəyinə varan bir xatırlama.

**NİKBİNLİK** [alm. Optimismus; fr. Optimisme; ing. Optimism; osm. tr. nikbinlik] – ümumiyyətlə hər şeyi yaxşı tərəfindən görmə, hər vəziyyətdə yaxşı bir çıxış yolu uman dünyagörüşü. Ən yaxşı gələcəyə, xeyirin şər üzərində, ədalətin ədalətsizliyin üzərində təntənəsi imkanına etiqad və inamdır.

**NİRVANA** [sanskritcə, hərfən – sönmə] – budizmin [həmçinin çaynizmin] dini fəlsəfəsinin əsas anlayışı; bir növ “xilas” mənasını ifadə edir. İnsanın ruhi meyllərinin yüksək halını, son məqsədini bildirir. Bu səbəbdən insan bütün növ maddi ləzzətlərdən, zövqlərdən uzaq düşməlidir.

**NİTQ** [ər. **نطق**] – insanların bir-biri ilə ünsiyyətindən, bu və ya digər dilin vasitəsilə onun öz fikirlərinin ifadə etməsindən və başqalarına çatdırılmasından ibarət fəaliyyəti.

**NİHİLİZM** [alm. Nihilismus; fr. Nihilisme; ing. Nihilism; lat. Nihil – heç nə, heç şey; osm. tr. ademiyyun mezhebi] – ümumi olaraq var olan dəyərlərə, görüşlərə, sistemə qarşı çıxan, heç bir dəyər tanımayan görüşlərə verilən addır. Heç bir müsbət ideala bağlı olmayan mütləq nöqtəyi-nəzər.

**NİZAM** [alm. Ordung; tr. düzen fr. Ordre; ing. Order; osm. tr. nizam; ər. نظام]. Bəzi elementlərin daxilində hər birinin müəyyən bir yeri olan bir birlik qurmaq şərtilə az yaxud da çox sağlam bir formada bir yerə sığışması. Yaxud da çoxlarının bir yerə, bir məqsədə, bir amala görə yığışması.

**NYAYA** [sanskritcə, hərfən – qayda, qanun, ümumiyyətlə məntiq] – qədim hind fəlsəfəsinin ortodoksal sistemlərindən biri.

**NYU realizm** [alm. Neurealismus; fr. Nèo-rèalisme; ing. New realism] – zəmanəmizdə Kembricdə ortaya çıxan hər şeyi metafizik formada yorumlayan, baxışlarının böyük əksəriyyətinin metafizik idealizmdən qaynaqlandığı fəlsəfi təlim. Təbiəti əsas hesab edən nyu realistlər fəlsəfə problemlərini təbiət elmlərinin metodu ilə həll etmə yolunu seçirlər.

**Nyu idealizm** [alm. Neuidealismus; fr. Nèo-idèalisme; ing. Neo-idelaism] XIX əsrin ikinci yarısından sonra materializm, pozitivizm və naturalizmin hökmranlığı qarşısında – idealizmi yenidən canlandırmağa çalışan cərəyanlar.

**NYUKANTİZM** [alm. Neukantianismus; nèo-kantisme; ing. Neo-kantianism] – XIX əsrdə fəlsəfəni çökməkdən qurtarmaq üzrə xüsusilə də bilik tənqidçisi baxımından Kanta istiqamətlənən tədqiqatlar. Ən yüksək nöqtəsinə XX əsrdə çatmışdır.

**NOMİNALİZM** [lat. nomen – ad] – orta əsr fəlsəfəsində cərəyan; anlayışları ayrı-ayrı predmetlərin adı hesab etmişdir.

**NOOSFER** [yun. Nous – zəka, sphaira – sfera, sahə; zəka sferası] – planetimizin şüurlu insan fəaliyyəti ilə əhatə olunmuş sahəsi.

**NORMA** [alm. Norm; fr.=ing. Norme; lat. Norma; osm. tr. kaide, numune] – 1. Günahlandırma və dəyərləndirmənin özünə görə həyata keçirildiyi meyar. Tabe edilməsi vacib olan qayda, qanun. Fəlsəfədə əxlaq, estetik və məntiq normaları da mövcuddur. Buna görə də bu fəlsəfə sahələri normaları qoyan yəni normativlər adlanır.

**NOUMEN** [yun. Noumenon] – fenomenin əksinə olaraq yalnız ağılda dərk edilən mahiyyəti ifadə edən termin. Hisslər vasitəsilə dərk olunmayan, sırf əqllə qavranılan deməkdir.

**NOUS** [yun.=lat. Intellectus; əql] – Kainatı sistemləşdirən və qeyri maddi olan ideya. İnsanın ən yüksək bacarığı.

**NÖV** [alm. Art; fr. Espèce; ing. Species; lat. Species; yun. Eidos; ər. نوع; tr. Tür; osm. tr. növi] – bir-birindən törəyən və filoloji baxımdan əqraba olan canlı varlıqlar elementi. Öz daxilində bir forma olan və üzərində cins terminin olduğu məntiqi termin. Amma bu cins termini öz üzərində başqa bir cins varsa, yenidən növ anlayışını verir və bu beləcə davam edir.

**NÜFUZ** – müəyyən keyfiyyətlərinə, xidmətinə görə hər hansı bir şəxsin, baxışlar sisteminin və ya təşkilatın hamı tərəfindən etiraf edilən nüfuzu.

# O

**OBYEKT** – [alm. Objekt, gegenstand; fr. Object; lat. Object; lat. Objectum – göz önündə olan, qarşıya qoyulan şey] bax subyekt və obyekt.

**OBYEKTİV** [alm. Objektiv; fr. Objective; osm. tr. afaki; ing. Objective; ər. شيٌّ] – obyektlə əlaqəsi olan, onunla həmahəng olan. Fərdin şəxsi görüşündən asılı olmayan. Yaxud ümumiyyətlə hər növ düşüncə tərzinə uyğun gələn.

**OBYEKTİVLİK** [alm. Objectivität; fr. Objectivitè; ing. Objectivation; osm. tr. afakileştirme; tr. Nesnellik; ər. شيئيّة] – fəlsəfi mövqe; buna görə fəlsəfi idrak tədqiqatı tənqidi qiymətləndirməyə, dəyərlər haqqında mülahizələr söyləmək səviyyəsinə çatdırmağa qadir deyil, buna görə də həmin idrak bunlardan əl çəkməlidir.

**OLİQARXİYA** [tr. Takımerki; alm.=fr. Oligarchie; ing. Oligarchy; yun. Aligarkhia. Oligoi – bəzi, bir neçə. Arkhein - suverenlik] – bir neçə nəfərin suverenliyi, dövlət gücünün az saylı şəxslərin yaxud da ailələrin əldə olduğu dövlət forması.

**OKKAZİONALİZM** [occasio – təsadüf] – ruhun və bədənin qarşılıqlı təsirinin izah olunmazlığını aradan qaldırmağa çalışan XVII əsr dini-idealist doktrinası.

**OKKULTİZM** [occultus – gizli, məhrəm] – dünyada fövqəltəbii, elmi tədqiqata müyəssər olmayan fenomenlərin və qüvvələrin mövcudluğunu qəbul edən və onlara qarşılıqlı təsir

üçün [magiya, spiritizm] "əməli" üsullar işləyib hazırlayıb təlimləri ifadə edən termin.

**OPERASİONALİZM** [lat. operatio – hərəkət, təsir] – müasir fəlsəfədə öz təbiəti etibarilə məntiqi pozitivizmin və praqmatizmin sintezindən ibarət cərəyan.

**OPTİMİZM** - bax. Nikbinlik

**ORQANON** [yun.] – hərfi mənası vasitə, alət deməkdir. Aristotelin məntiqlə əlaqədar işlərin hamısına verilən ad. Lakin Aristotel sırf məntiq mənasında analitik terminindən istifadə edirdi. Aristotelə görə məntiq düzgün düşünmənin metodu və sənətidir.

# Ö

**ÖZLƏŞMƏ** – insan fəaliyyəti məhsullarının, həmçinin insanın xassələrinin və qabiliyyətlərinin insanlardan asılı olmayan və onlara hakim kəsilmiş olan nə isə bir şeyə çevrilməsi prosesini və bu çevrilmənin nəticələri.

**ÖZHƏRƏKƏT** – mənbəyi, səbəbi hərəkət edən şeyin özündə olan hərəkət.

**ÖZGƏLİK** [alm. Altruismus; fr. Altruisme; ing. Altruism; lat. Alter – başqası, özgə. osm. tr. diğerkamlik] – başqalarının yaxşılığını yaşamaq və mənimsəmək ideyasını ehtiva edən görüş.

**ÖZÜNDƏNLİK** [alm. Spontaneität; fr. Spontanèitè; ing. Spontaneity; lat. Spontaneus – özlüyündən; osm. tr. taviyet; ər. **طاوية**] – xaricdən bir təyinatla deyil, öz-özünə olan təsirlilik, birbaşa öz daxili ehtimalıyla təsirli olma qabiliyyəti.

**Özülüyündən var olan** [alm. Ens a se; ər. **قائِم بنفسه**]

**Özündə şey** [alm. Ding an sich; fr. Chose en soi; ing. Thing in itself] – bilən öznədən, şüurdan asılı olmayaraq öz başına var olan, təcrübənin xaricində olan şey. Bu mənada Aristoteldə və sxolastik fəlsəfədə maddə ilə eyni mənalı. Kantda – nomenlə eyni mənalı düşüncədən asılı olmayaraq var olan.

**ÖLÜM** orqanizmin həyat fəaliyyətinin geriyə dönməz şəkildə dayanması, canlı varlığın mövcudluğunun labüd təbii sonu.

**ÖLÇÜ** – predmetin və hadisənin keyfiyyət və kəmiyyət müəyyənliyinin üzvi vəhdətini ifadə edən fəlsəfi kateqoriya.

**ÖNGÖRMƏ** [alm. Ahnung; fr.=ing. Pressentiment; osm. tr. hissikablelvuku; tr. Önsezi; ər. **حسٌ قبل ألوقوع**] əsaslandırılmayan və izah edilməsi mümkün olmayan hiss. Verilməmiş olanın, bilinməyənin, xüsusilədə gələcəklə əlaqəli olanın əvvəldən hiss edilməsi, doğru kimi hesab edilməsi.

# Q

**QABİLİYYƏT** [ər. قابلية]– geniş mənada fərdin davranışını tənzim edən və onun həyat fəaliyyətini şərtləndirən psixi xüsusiyyəti.

**QAVRAYIŞ** [alm. = ing. Apprehension; r. apprèhension; lat. Apprehensia; osm. tr. tasavvur-i sazec; tr. kavrayış] – hər hansı bir dərk edilənin mahiyyətinin birbaşa qavranılması. Kantda isə idrak növlərinin eyni bir məcrada birləşməsinə deyilirdi. Maddi aləmin hiss üzvlərinə bilavasitə təsir göstərən predmet və proseslərinin xarici struktur xüsusiyyətlərinin hissi obrazı.

**QANUN** [alm. Gesetz; fr. Ioi; ing. Law; yun. Nomos; lat. Lex; tr. Yasa; osm. tr. kanun; ər. قانون] – hadisələrin mühüm daxili və sabit əlaqəsi olub, onların müəyyən qaydada dəyişilməsini şərtləndirir. Hadisələr arasında sistemli olaraq bir əlaqəni təyin edən və bir şeyin vacibliyini dilə gətirən ümumi hökm. Hadisələrin gedişatında fövqəladəliyə yer verməyən, dəyişməzlik və məcburilik göstərən qayda.

**QAYDA** [alm. Regel; fr. Règle; ing. Rule; lat. Regula – özü ilə doğru xətt izlənilə bilən]

**QEYRİ-müəyyən** [alm. Indefinit, unbestmmit. Fr. Idifinite; lat.indefinitus; osm. tr. qayri-muayyen. ər. غير معين]. 1.Sonu harda bitəcəyi naməlum olan, sonlu və ya sonsuz olduğu bilinməyən şey.

**QƏBİLƏ** [ər. قبيلة] – insanların ibtidai icmalarda iqtisadi münasibətlər zəminində meydana gəlmiş və qan qohumluğu əlaqələrinə əsaslanan birlik forması.

**QƏDƏR** [ər. قدر] – ərəb-islam fəlsəfəsində müxtəlif mənalarda işlədilən termin; islamın erkən dövründə ilahi buyruq, qüdrət, qismət mənasında, VIII əsrin əvvəllərindən isə həmçinin insanın öz əməllərinə ixtiyar olması, iradə sərbəstliyinin sinonimi kimi işlənirdi.

**QƏRAR** [alm. Enscgeidung; fr. Dèecision; ing. Decision; ər. قرارٌ]. – aralarında bir seçim etmə məcburiyyəti olan imkanlardan birini seçmək fəaliyyəti və bu fəaliyyətin nəticəsi yaxud da insan həyatının ayrı-ayrı mühüm nöqtələrində içinə düşdüyü sarsıntılı hal və bunun nəticəsi olanı seçmək.

**QNOSEOLOGİYA** [alm. Gnoseologie; fr. Gnosèologie; ing. Gnoseology; yun. Gnosis – bilik, məlumat, logos – təlim]. Bilik haqqında təlim. Yunan dilində gnosis kəlməsi əslində episteme sözü ilə eyni mənada işlənir. Qnoseologiya və epistemologiya ümumiyyətlə öz şərtləri və nəticələri daxilində bilik prosesini tədqiq edən, fəlsəfəni araşdıran sahədir.

**QNOSTİKLƏR** [alm. Gnostiker; fr. Gnostiques; ing. Gnostics; osm. tr. irfaniyan; yun. Gnosis – bilik, gnostikos – bilik haqqında] – dini-fəlsəfi cərəyanın Xristian teologiyasını Qədim Şərqin dinləri ilə, həmçinin neoplatonizm və pifaqorçuluqla birləşdirən nümayəndələri. I əsrdə dini fəlsəfə cərəyanlarına və təriqətlərinə verilən ad. Onlar xilas yolunu spekulyativ bilikdə axtarırdılar.

**QNOSTİSİZM** [alm. Gnostizismus; fr. Gnosticizme; ing. Gnosticism; yun. Gnostikoi – bilənlər. Gnosis – bilik, gnostikos – biliklə bağlı; osm. tr. irfaniye; ər. bilinirciler] – İnsanla Tanrı arasındakı əlaqəni spekulyativ biliklərlə bağlayan təlimlər.

**QRUP** [alm. Gruppe; fr. Groupe; ing. Group; tr. Öbek] – bir-birilə az və ya çox dərəcədə bağlılığı, əlaqəsi olan toplu. İctimai elmlərdən olan sosiologiyanın geniş istifadə olunan bir termini, qrup, qruplaşma və s.

**QÜRBİYYƏT** – Tanrı dərgahına yaxınlıq məqamıdır.

**QÜDRƏT** [alm. Macht; puvoir, puissance; ing. Power; osm. tr. iktidar, kudret; ər. **قدرة**] – fiziki güclə əlaqələndirilməyən ruhi, mənəvi və təsiredici güc.

**QURAN** [ər. **ألقرآن**]– Müsəlmanların müqəddəs kitabı.

# P

**PANTEİZM** [pantheisme] – Tüm Tanrıcılık Vücüdiyye: Allah ilə aləmi bir və eyni sayan fəlsəfi sənətlərin adı.

**PERİPATETİZM** [alm. Peripatetiker; fr. Peripatetician; ing. Peripatetics; es.tr. meşaiyun; ər. **مشّائيّون**] – Aristotelin tərəfdarları və tələbələri. Aristotelin fəlsəfi dərslərini və müzakirələrini ayaq üstə gəzinərək təlim etdiyinə görə belə bir ad götürülmüşdü. Peripatetikos piyada addımlamaq deməkdir. Ərəbcəyə də bu formada tərcümə edilən terminin lüğəti mənası piyada gəzənlər deməkdir.

**PROBLEMATİK** [alm. Problematisch; fr. Problematiquè / proposition; ing. Problematic/proposition; osm. tr. ihtimali hüküm; ər.**حكم إحتمالي**] – həlli yolu və vasitəsi qeyri-müəyyən olan, yaxud da doğru olma ehtimalı olsa da, əslində şübhə oyandıran, dəqiq olmayan şeydir.

**POLİTEİZM** [polytheisme] – Çok tanrıcılık: Bir çox məbuda inanıb, tapmaq.

**POZİTİVİZM** – müsbət münasibət, təsdiqedici olma, etimad göstərmə. **Pozitivizm** [alm. Pisitivismus; fr. Positivisme; ing. Positivism; osm. tr. ispatiye; tr. Olguçuluq; ər. **إسباتيّة**] – tədqiqatlarını aktlara, həqiqətlərə əsaslanan, metafizik açıqlamaları nəzəri olaraq imkansız, qaydasız, hesabsız edən, təcrübə ilə isbatlanmayan, problemləri sözdə problem olaraq xarakterizə edən fəlsəfi dünyagörüşü. Təcrübə ilə reallaşmamış olan hər şeyi rədd edib, faktlardan və onlar arasındakı dəyişməyən münasibətlərdən hərə-

kət edərək, real olmayan heç bir məlumat mövzusunu qəbul etməyən fəlsəfə məktəbi.

**PLÜRALİZM** [alm. Pluralismus; fr. Pluralisme; ing. Pluralism; ər. كثْرَتيّة; tr. Çokçuluq; osm. tr. kesretiye] – həqiqətin açıqlanmasında birdən çox prinsipin mövcud olmasını qəbul edən təlim, yəni fəlsəfədə həqiqətin növ-növ olduğunu, aləmi təşkil edən varlıq və əşyanın tək bir prinsipə və ya qanuna çevrilməyəcəğini, bir çox reallıqların mövcud olduğunu qəbul edən görüş.

**PANLOGİZM** [yun. Pan – hər şey, və logos – təlim, söz, fikir] – varlığın və təfəkkürün eyniyyəti haqqında obyektiv idealist doktrina; bu doktrinaya görə təbiət və cəmiyyətin bütün inkişafı dünya zəkasının, mütləq ideyanın məntiqi fəaliyyətinin həyata keçirilməsidir.

**PANPSİXİZM** [yun. Pan – hər şey və psyche – can] – idealist baxış; bu baxışa görə bütün cəmiyyət canlıdır, psixikaya malikdir.

**PANTEİZM** [yun.pan - Hər şey və theos – allah] – bu fəlsəfi təlimə görə allah təbiətin hüdudlarından kənarda yerləşməyib, onunla eyniyyət təşkil edən şəxssiz başlanğıcdır.

**PARADİQMA** [yun. Paradeigma – misal, nümunə] – məlum mərhələdə elmi praktikada təcəssüm edən, konkret elmi tədqiqatı müəyyənləşdirən nəzəri və metodoloji ilkin şərtlərin məcmusu.

**PARADOKSLAR** [məntiqin və çoxluqlar nəzəriyyəsinin paradoksları] [yun. Paradoxos – gözlənilməz] – mühakimənin məntiqi düzgünlüyü saxlanılmaqla məzmunlu çoxluqlar nəzəriyyəsində və formal məntiqdə meydana gələn formal məntiqi ziddiyətlər.

**PARALOGİZM** [yun. Paralogismos – səhv mühakimə] – məntiq qanunlarının və qaydalarının qərəzsiz pozulması; mühakiməni sübut gücündən məhrum edir və adətən yalnış nəticələrə gətirib çıxarır.

**PARAPSİXOLOGİYA** [yun. Para – yanında, kənarında] – hiss orqanlarının fəaliyyəti ilə izah oluna bilməyən hissiyyat formalarını, həmçinin canlı varlığın əzələ səyi olmadan onu əhatə edən hadisələrə təsir formalarını öyrənən tədqiqat sahəsi.

**PASSİV** [alm. Passiv; fr. Passif; ing. Passive; lat. Passivus; osm. tr. münfail; **منفاعل**]. Alıcı vəziyyətdə olan, təsirli olmayan, əksi aktiv kəlməsidir.

**PATRİARXAT** [yun. Patriarches – qəbilə başçısı] – ibtidai-icma quruluşunda qəbilə təşkilinin forması; ictimai istehsalda və qəbilə icmasının sosial həyatında kişinin üstün rolu ilə səciyyələnir.

**PERSEPSİYA** [lat. perceptio – qavrayış] – hiss orqanları vasitəsilə şeylərin şüurla hissi qavranılması, inikası.

**PERSONALİZM** [alm. Personalismus; fr. Personalisme; ing. Personalism; osm. tr. şahsiye mezhebi; lat. persona – şəxsiyyət] – İnsanı ən yüksək kainat ideyası hesab edən metafiziki təlim. Fərd olan Tanrıya inam gətirmə. Leybnitsin monadologiyasından gələn, XIX əsrin sonu və XX əsrin əvvəllərində fəlsəfədə yayılmış idealist cərəyan.

**PİS** [alm. Böse, uebel; fr. Mal; ing. Evil, wrong; osm. tr. şer;] – siz hesab etməyin, qınamağın, eyibləməyin mövzusu olan hər şey, istəyin qaydalara uyğun olan bir formada onun ziddinə çıx-

mağa və əlindən gəldiyi zaman dəyişdirməyə hüququ çatan hər şey.

**PESSİMİZM** [alm. Pessimismus; fr. Pessimisme; ing. Pessimism; lat. Pessimus – ən pis, osm. tr. bədbinlik] – ümumiyyətlə hər şeyi ən pis tərəfindən, hər vəziyyəti qaranlıq hesab edən və həmişə ən pis olanı gözləyən dünyagörüşü. Əksi optimizmdir.

**PLURALİZM** [lat. pluralis – çoxlu] – monizmə əks konsepsiya: mövcud olan hər şey eyni hüquqlu, bir-birindən təcrid olunmuş, vahid başlanğıca müncər edilməyən mahiyyətlərin çoxluğundan ibarətdir

**POLİSİLLOGİZM** – Mürəkkəb sillogizm [Sillogistika]; sillogizmlərin ardıcıllığını, zəncirini ifadə edir; bu ardıcıllıqla və zəncirdə əvvəlki sillogizmlərin nəticələri sonrakı sillogizmlərin müqəddimələrinin tərkibinə daxil olur.

**POLİTEİZM** [alm. Polytheismus; fr. Politheisme; ing. Polytheism; ər. **كثرة إلآهية** yun. Poly – çox, theos – alllah; tr. çoktanrıcılık] – çoxallahlılıq və təkallahlılıq, bir neçə allaha və ya bir allaha sitayiş edilməsi.

**POSTULAT** [alm.=fr. Postulat; ing. Postulate; lat. postulatum – tələb; osm. tr. mevzua] – müəyyən elmi nəzəriyyənin baçlanğıc nöqtəsi kimi qəbul edilən və bir qayda olaraq, həmin nəzəriyyə çərçivəsində isbat olunmayan prinsip və ya hökm.

**PROSTAVLIQ** [yun. Orthodoxia] – xristianlığın mühüm cərəyanlarından biri; başlıca olaraq Şərqi Avropa, Yaxın Şərq və Balkanlarda yayılmışdır.

**PRAQMATİZM** [alm. Pragmatismus; fr. Pragmatisme; ing. Pragmatism; yun. Pragma – iş, hadisə, faydalı; tr. pragmaçilik] –

düzgünlüyü və həqiqəti təktərəfli olaraq ancaq doğurduğu hərəkətlərin nəticələri və uğurları ilə dəyərləndirilən fəlsəfi təlim. müasir fəlsəfədə geniş yayılmış subyektiv idealist cərəyan

**PRAQMATİKA** Semiotikanın bölməsi.

**PARLAMENT** – (fransız parler, yəni danışmaq sözündən) – hakimiyyətin ali təmsilçi orqanıdır. Orta əsrlər Avropada yüksək təbəqələrin nümayəndələrindən formalaşan məşvərət və qanunverici orqan idi. Müasir mənasını XVII-XIX əsr burjua inqilablarından sonra almışdır. Parlamentarizm cəmiyyətin dövlət idarəçilik sistemidir. O, parlamentin başqa hakimiyyət qanadlarına münasibətdə üstün mövqeyə malik olması ilə yanaşı, qanunverici və icraedici funksiyaların dəqiq şəkildə müəyyənləşdirilməsi ilə xarakterizə olunur.

**PARTİYA** – "Partiya" termini, "pars" – hissə və ya "partire" – bölmək olan latın sözlərindən meydana gəlmişdir. Partiya adlandırılan siyasi birləşmələr hələ qədim zamanlardan məlum olsalar da, müasir dövrdə onların yeri və rolu bilavasitə demokratiyanın inkişafı və təmsili, hakimiyyət orqanlarının möhkəmlənməsi ilə bağlıdır.

**PATRONİMİYA** – Sinifsiz cəmiyyətin son dövründə, patriarxal ailələrin dağılması zamanı daha yaxın qohumluq telləri ilə bir-birinə bağlı olan ailələr vahid birlik təşkil edirdilər ki, bu cür ailə qrupları patronimiya adlanırdı. Nəsli və ya qəbiləni ağsaqqallar idarə edirdilər. Nəsli Şura nəslin tam bərabər hüquqlu üzvlərinin ümumi yığıncağı idi. Qəbilə Şurası isə qəbiləyə daxil olan nəsil ağsaqqallarının yığıncağı idi.

**PERSONALİZM** (latınca şəxsiyyət sözündəndir) müasir fəlsəfədə teistik istiqamətdir. Adından göründüyü kimi, burada şəxsiyyət ilkin yaradıcı reallıq və ali mənəvi sərvət hesab olunur. Şəxsiyyətin yaşadığı və fəaliyyət göstərdiyi dünya Ali şəxsiyyət – Allah yaradıcılıq fəallığının təzahürüdür.

**PROSES** – Latınca, irəliyə doğru hərəkət.

**POLİTOLOGİYA** Yunanca, politika – siyasət, loqos – elm. Cəmiyyətin siyasi həyatının müxtəlif təzahür formalarını tədqiq edir. **Politologiya** siyasət haqqında elmdir. Qədim Yunanıstanda **Politika** dövlət və hakimiyyət münasibətlərinin tənzimlənməsi, insanların, cəmiyyətin idarə olunması haqqında elm hesab olunurdu.

**PRAQSİOLOGİYA** [yun. Praktikos – fəal] – müxtəlif hərəkətlərin və ya hərəkətlər məcmusunun onların səmərəliliyinin müəyyən edilməsi baxımından nəzərdən keçirilməsi metodikasını öyrənən sosioloji tədqiqatlar sahəsi.

**PREDİKABİLİYALAR** [lat. praedicabilia] – Aristotel məntiqində xəbərin növləri.

**PREDİKAT** [lat. praedication] – ənənəvi məntiqdə hökmün iki terminindən biri. XIX əsrin sonuna qədər məntiqdə hökm subyekti, bir qayda olaraq, qrammatik mübtəda ilə, Predikat isə məs., sifətlə istifadə olunan qrammatik xəbərin adlıq hissəsi ilə eyniləşdirilirdi.

**PREDMETLİLİK** – hər hansı bir hadisənin, hərəkətin, vəziyyətin və s.-nin predmetlərlə bağlı olduğunu və ya bu hadisənin, hərəkətin və vəziyyətin özünün subyektin fəaliyyətinə cəlb edilməsi yolu ilə predmet kimi çıxış etdiyini ifadə edən anlayış.

**PRİNSİP** [lat. principium - əsas, ilk başlanğıc] – davranışın ilk başlanğıcı, rəhbər ideyası, əsas qaydası.

**PROBLEM** [alm.=ing. Problem; fr. Probleme; yun. Problema: pro – önə, ballein – atmaq; osm. tr. mesele; ər. مسألة] – elmi metodlarla həll etmək şərtilə ortaya atılan sual. Həllini tələb edən hər növ çətinlik, məsələ.

**PROBİDENSİALİZM** [lat. providentia – qabaqcadan görmə,bəsirət] – dini fəlsəfi baxış; bu baxışa görə bəşər cəmiyyətinin inkişafı [hərəkətverici qüvvələr mənasında, həm də məqsəd mənasında] əsrarəngiz, tarixi prosesə münasibətdə xarici olan qüvvələrlə-bəsirətlə, allahla müəyyən edilir.

**PROQNOZ** [yun. Prognosis – gələcək haqqında bilik, qabaqgörənlik] – elmi qabaqgörənliyin növlərindən biri. Hər hansı bir hadisənin perspektivlərinin xüsusi tədqiqi.

**PROLETARİAT** – Fəhlə sinfi.

**PROPEDEVTİKA** [yun. Propaideuo – qabaqcadan öyrədirəm] - əvvəlcədən məşq etmək, hər hansı bir elmə hazırlıq, müntəzəm və qısa formada şərh olunmuş giriş kursu.

**PROSES** [alm. Prozess; fr. Processus; ing. Process; lat. processus – keçmə, hərəkətetmə; osm. tr. vətirə; ər. وطيرة] – müəyyən bir nəticəyə varan düşüncə axışı. Hadisələrin yaxud da prosesin müəyyən bir nəticəyə doğru yol alması. Hadisənin qanunauyğun, ardıcıl dəyişməsi: bu hadisənin digər hadisəyə keçməsi (inkişaf).

**PROTESTANTİZM** [lat. protestans – protes, etiraz edən, açıq şəkildə sübut edən] – pravoslavlıq və katolizmdən sonra xristianlığın Reformasiya dövründə meydana gəlmiş cərəyanı.

**PRİNSİP** [alm. Prinzip; fr. Principle; ing. Principle; lat. Principium; yun. Arkhe; osm. tr. mebde, umde] – başlanğıc, ilk olan, özündən başqa bir şeyin çıxdığı təməl, əsas, ilk prinsip. İdeyalar təməl ideyalara və mənəvi ideyalar, metafizik ideyalar, obyektiv ideyalar, bilik ideyaları.

**PRİMİTİV - İBTİDAİ** [alm. Primitiv; fr. Primitif; ing. Primitive; lat. Primitivus; osm. tr. iptidal] – zaman baxımından ən köhnə olan, ilk olan. İnkişafın əsasını təşkil edən, hələ inkişaf etməmiş olan.

**PSİXİKA** [yun. Psyche – can, ruh] – canlı sistemin ətraf aləmlə siqnal şəklində qarşılıqlı təsirinin, əlaqəsinin məhsulu və şərti.

**PSİXOANALİZ** [alm. Psychoanalyse; fr. Psychanalyse; ing. Psychoanalysis; yun. Psykhe – ruh, analysis – həll etmək; osm. tr. tahlil-i ruhi; ər. **تحليل روحيٌّ**] - əsəb xəstəliklərinin və psixi xəstəliklərin Z.Freyd tərəfindən təklif olunmuş ümumi nəzəriyyəsi və müalicəsinin metodu, **fr**eydizmin nəzəri əsaslarından biri.

**PSİXOLOGİYA** [alm. Psychologie; fr. Psychologie; ing. Psychology; osm. tr. Ruhiyat; tr. Ruhbilim yun.psyche – can, ruh və logos – təlim, söz; ər. **روحيّات**] – insanın fəaliyyəti və heyvanların davranışı prosesində obyektiv reallığın psixi inikasının yaranması və fəaliyyət göstərməsi qanunları haqqında elm.

**PSİXOLOGİZM** [alm. Psychologismus; fr. Psychologisme; ing. Psychologism; osm. tr. ruhiyatçilik; tr. ruhbilimcilik] –

xüsusilə ruhi və mədəni hadisələri birtərəfli qaydada ancaq psixoloji baxımdan tədqiq etmə və açıqlama yaxud da psixologiyanı bütün elmlərin və fəlsəfənin əsası olaraq hesab edən dünyagörüşü.

**PUBLİSİSTİKA** [lat. publicus – ictimai] – geniş mənada, silsilə ictimai həyat məsələlərini işıqlandıran ədəbiyyat növü.

**R**

**RADİKALİZM** [alm. Radikalismus; fr. Radicalisme; ing. Radicalism; osm. tr. cezriye] – tədqiq etdiyi mövzunun son səbəblərinə, köklərinə qədər enən düşünmə forması. Həyat formalarını, həyat əlaqələrini tənqid edib kökdən dəyişdirmə təmayülündə sonuna qədər gedib çıxan görüş.

**RASİONALİZM** [lat. rationalis] – ağıllı – səhih biliyin məntiqi əlamətləri olan ən ümumilik və zərurilik təcrübədən və onun ümumiləşdirmələrindən əldə edilə bilməz; bunlar yalnız ağılın özündən, anadan olandan ağıla xas anlayışlardan, ya da ağlın yalnız püşeymləri, meylləri şəklində mövcud olan anlayışlardan hasil edilə bil**ər.**

**RASİONALİZM** [alm. Rationalismus; fr. Rationalisme; ing. Rationalism; lat. Ratio - əql, osm. tr. aklıye; ər. عقليّة; rasionalisme] – Akılcılık: əqli biliyə əsaslanan doğruluğun miqyasını hisslərdə deyil, düşünmədə və nəticələrdə görən təlimin ümumi adı. Bilik təlimində rasionalizm biliyin əqlə, təfəkkürə, düşüncəyə əsaslandığını irəli sürür. Hər kəsdə bərabər dəyişməyən ağıl və məntiqi qanunların doğuşdan olduğunu, onların təcrübədən müstəqil olduğunu, beləcə bəzi apriori və açıq-aşkar həqiqətlərin varlığını qəbul edən fəlsəfi görüş.

**REALİZM** [realisme] – Gerçəkçilik: Düşüncədən və ya bilən subyektdən ayrı, xarici aləmin və obyektlərin varlığını, onlar haqqında obyektiv məlumatın inkişafını qəbul edən fəlsəfi görüş.

**RASİX** – Sağlam, əsaslı, sağlam təməlli. Din fəlsəfəsində rasix çox dərin elmə malik olan bir şəxs kimi qəbul edilir. Bu termin öz əsasını səmavi kitab – Qurandan almışdır. Şərq filosofları dini və fəlsəfəni bilənləri bu cür adlandırırdılar (rasixun - را سخون).

**RİHLƏ** – Hədis axtaran insanların çıxdıqları səyahətlərə verilən addır.

**RİZA** – Razı olmaq, bəyənmək, icazə vermək. Riza təsəvvüf məqamlarından ən üstün olanıdır. Riza iki cür olur. Qulun Allahdan razı olması. b] Allahın quldan razı olması.

**REAKTOLOGİYA** [lat. re - əksinə və actio – hərəkət, təsir] – yüksək inkişaf etmiş heyvanların və insanın psixikasını xarici təsirlərlə cavabların hesabı məcmusu, cəmi kimi nəzərdən keçirən mexanistik konsepsiya.

**REALİZM** [lat. realis – gerçək, cismani] – incəsənətin obyektiv idraki və estetik-dəyişdirici təbiətini daha dolğun şəkildə təcəssümləşdirən bədii metod.

**REALLIQ** [alm. Wirkicheit; fr. Rèalitè; lat. Realitas; osm. tr. şeniyet; ər. ألحقيقة] – Həqiqi olan, var olan şeylərin hamısı. Bu mənada həqiqətin şüurdan, düşüncədən asılı olan və olmayan varlıqlar mövcuddur.

**REDUKSİYA** [alm. Reduktion; rèduction; ing. Reduction; osm. tr. irca; ər. إرجآء; tr. Indirgeme; lat. reductio – qayıtma, geriyə dönmə] – məntiqdə ikinci, üçüncü yaxud da dördüncü qisim fiqurlardan birinin [Baroco, Bocardo] birinci fiqurun dörd bağlayıcısından birinə geri qaytarması. Bir sıra məlumatların, vəzifələrin onların təhlili və ya həlli üçün əlverişli olan bir şəklə salın-

masından, həmçinin əvvəlki vəziyyətin bərpa edilməsindən, mürəkkəbin daha sadəyə çatdırılmasından ibarət olan məntiqdə, riyaziyatda, biologiyada, dilçilikdə tətbiq olunan metodoloji üsul.

**RELYATİVİZM** [lat. relativus - nisbi] – insan idrakının nisbiliyi, şərtiliyi və subyektivliyi haqqında idealist təlim.

**REFLEKSİYA** [lat. replexio – geriyə dönmə, geriyə nəzər salma] – idrak inikasını, tədqiqini bildirən təlim.

**REFORMASİYA** [lat. reformatio – yeniləşdirmək, islah etmək] – XVI əsrin birinci yarısında Avropada protestantizmin əsasını qoymuş geniş antifeodal və antikatolik hərəkatı.

**REFORMİZM** – Fəhlə hərəkatında sinfi mübarizənin, sosialist inqilabı və proletar diktaturasının zəruriliyini inkar edən siyasi cərəyan.

**RES** [lat. Res- şey] – Res cogitans – düşünən varlıq, nəfsi natiqə, düşünən öz; **res extensa** – məkan tutan varlıq.

**RƏY** [ər. رئي]– antik fəlsəfədə səhih bilikdən – həqiqətdən fərqli olaraq səhih olmayan, subyektiv bilik.

**ROMANTİZM** [fr. Romantisme; lat. romanus – Romaya aid] – mədəniyyətin ən müxtəlif sahələrini əhatə etmiş ideya hərəkatı və bədii hərəkat;XIX əsrin əvvəllərində klassisizmi əvəz etmişdir.

**REQRUTASİYA** – latınca, cəmiyyət üzvlərinin siyasi fəaliyyətə cəlb olunması.

**RESPUBLİKA** – (latınca republic – "dövlət işləri, ictimai işlər" deməkdir) elə idarəçilik formasıdır ki, burada dövlət başçısını seçmək və dəyişdirmək mümkündür, onun hakimiyyəti isə seçicilərin iradəsi və ya nümayəndələr qurumu tərəfindən müəy-

yən edilir. Prezidentli,, parlamentli və qarışıq formalı respublikalar var.

**RUH** [alç. Geist; fr. Espirit; ing. Spirit; lat. Spiritus; yun. Pneuma, nous – nəfəs; osm. tr. ruh; ər. روح] – Kainatın qanunu. Xüsusilə də stoa fəlsəfəsində kainat, əqli, kainat ruhu, təsir edən canlılıq verən, forma verən, canlandıran ideya.

**RUH** [alm. Seele; fr. Ame; ing. Soul; lat. Anima; yun. Psykhe – nəfəs alma, üfləmək, nəfəs dərmək ər. روح] – bədəni daima canlı qılan, ona həyat verən, yaşadan, lakin maddi olmayan varlıq. Dini fəlsəfədə ruh ölümsüz və insanın əbədi həyatını təmin edən varlıq. Aristotelə görə ruh təbii – canlı həyatın ideyasıdır. Sözün geniş mənasında ideal olanla, şüurla, maddi başlanğıcdan fərqli olaraq qeyri-cismani başlanğıcda eyniyyət təşkil edən anlayış; sözün dar mənasında təfəkkür anlayışı ilə eyni mənalıdır.

## S

**SABİT fikir** [alm. Fixe idee; fr. Idèe; ing. Fixed idea; lat. Fixus – sabit, dəyişməz olan; osm. tr. fikr-i sabit] – şüurun taxılıb qaldığı, xilas ola bilmədiyi və düzəldə bilmədiyi yalnış bir sistem.

**SAF** [alm. Rein; fr. Pur; ing. Pure; lat. Purus; osm. tr. sırf, saf, mahz] – içinə, daxilinə qərib başqa heç bir şey qarışmayan, ari. Tətbiq etməklə əlaqəsi olmayan elmlər. Saf intuisiya [alm. Reine Anschauung; fr. Intuition pure; ing. Pur intuition] isə Kantın fəlsəfəyə gətirdiyi bir termindir. Daxilində hisslərin nizama girdikləri sağ hiss, biliyin ilkin şərtidir.

Saf əql [alm. Reine Vernuft] – ilkin bilik qabiliyyəti, təcrübədən asılı olmayan qabiliyyəti üçün Kantın istifadə etdiyi termin. İçərisində hisslə əlaqədar heç bir şey olmayan əql.

**SANSÜALİZM** [sensualisme] – Duyumculuk: Sahib olduğumuz bütün məluatların əslində bir duyğunun nəticəsi olduğunu, ağıl qanunlarının və fikirlərinin duyğularla əldə edildiyini irəli sürən görüş.

**SAXTALAŞDIRMA** – Nəzəri müddəaların [hipotezlərin, nəzəriyyələırin] təcrübə nəticəsində alınmış emprik dəlillərə tutuşdurulması yolu ilə təkzib edilmələri vasitəsilə onların həqiqiliyinin yoxlanılması üsullarından biri.

**SAY** [alm. Zahl; fr. Nomre; ing. Number; lat. Numerous; yun. Arithmas; osm. tr. adet; ər. **عدد**] – bir çoxluğun bir qrupla təyini. Saymaq zamanla əlaqədar bir hadisədir, halbuki sayın özü heç bir

xarakterik təyinatı olmadığı halda zaman təyinindən sıyrılmışdır, zamanın xaricindədir.

**SAHƏ** [ər. ساحة] – Məkanın ölçülərini ifadə edən xarakteristikalardan biri.

**SENTİMENTAL** [alm. Sentimental; epmfindsam; fr. = ing. Sentimental; ər. ألحسيُّ; tr. Duygusal] – duyğuların və hisslərin ağır gəlməsi, həddindən artıq bir formada insana təsir etməsi halı.

**SENTİMENTALİZM** [santi + mental + ism alm. Emöfindsamket; sentimentalität; fr. Sentimentalitè, sensibilitè; ing. Sensibility, feeling; tr. duygusallık].

**SEPTİSİZİM** [scepticisme] – Şüphecilik: Həqiqətin yoxluğunu, ağlın qəti bir məlumatı əldə edə bilməyəcəyini, həqiqətin tapılsa belə tam və davamlı bir şübhə içində qalınacağını , mütləq çata bilməyəcəyini iddia edən fəlsəfi görüşdür.

**SEMANTİKA** – [yun. semanticos – anladan] Dilçilikdə işlənən termindir. Sözün, ifadənin, qrammatik formanın mənası. Semiotikanın bölməsi.

**SEMİOTİKA** [alm. Semiotik; fr. Sèmiotique, sèmiologie; ing. Semiotic; yun. Semeion – işarə, əlamət] – bildirmək, xəbər vermək məqsədilə istifadə edilən hər növ işarə sistemini və fəaliyyət prosesini tədqiq edən elm. Ən sadə siqnalvermə sistemlərindən tutmuş təbii dillərə və elmin formallaşdırılmış dillərinə qədər işarə sistemlərinin müqayisəli öyrənilməsi ilə məşğul olan fənn.

**SENSUALİZM** [alm. Sensualismus; ing. Sensualism; osm. tr. ihsasiye; fr. Sensualisme, lat. sensus – sözündən; hiss, duyğu; ər. حسيّة] – Bütün məlumatların sadəcə hisslərdən qaynaqlandığını, duyğu qavramalarına əsaslandığını irəli sürən təlim. Duyğunu

idrakın yeganə mənbəyi kimi qəbul edən qnoseoloji təlim. Sensualizm təlimini əsaslandıran filosof Lokk olmuşdur. Lokk iddia edirdi ki, daha əvvəl hisslərdə heç bir şey anlıqda yoxdur. 2. Bütün ruhi hadisələri duyğulara geri qaytaran anlayış. 3. Əxlaq fəlsəfəsi baxımından həyatın anlam və mühtəvasını hiss orqanlarında tapan təlimlər. Hissiyyatın ilk dönəmdə nümayəndələri, Kirene məktəbi və epikürçülərdir. Yeni dönəmdə isə xüsusilə Lokk və Kondillkdır.

**SEVGİ** [alm. Libe; fr. Amour; ing. Love; lat. Amor, caritas; yun. Philia, eros, agape; osm. tr. aşk] – ümumi olaraq xoşagələn bir şeyə münasibət, ehtirasa qədər vara bilən bur ruh vəziyyəti. Fərqli növləri vardır: qarşı cinsə duyulan sevgi, uşağa-ailəyə qarşı duyulan sevgi, hansısa liderə, cəmiyyətə qarşı hiss edilən sevgi və s.

**SƏBƏB** [alm. Ursache, grund; fr. Cause, raison; ing. Cause, reason; lat. Causa, ration; osm. tr. illet, sebep; ər. سبب] - həqiqi səbəb, bir hadisənin ortaya çıxmasında qaynaqlandığı şey, nəyəsə təsir edən, onu əmələ gətirən şey.

**SƏBƏBİYYƏT** [alm. Kausalität; fr. Causalitè; ing. Causality; lat. Causalitas; osm. tr. illiyyet] – səbəblə təsir arasındakı əlaqə. Bu baxışa görə hər hadisənin bir səbəbi vardır ki, bu da səbəbiyyət məsələsidir. Bu düşüncə tərzinə görə səbəblə təsir arasında əlaqənin vacibliyini dilə gətirir.

**SƏHV** – Səhv halı səkr halının ziddidir. Mənəvi sərxoşluq halından uzaq olmaq, yaxud belə bir sərxoşluğa düşmədən daima ayıq olmaq, təmkin və şüurlu olmaq.

**SƏHİH** [alm. Exakt; fr.ing. exact; lat. Exigere – bir şeyi tam olaraq həyata keçirmək, bir mizana, ölçüyə görə etmək; osm. tr. səhih; ər. صحيح] – sözün anlatmaq istəyilənə tam qarşılıq olması, tam uyğun düşməsi forması. Ölçünün ölçülənə çox az da olsa bir bölgü aparmadan birəbir uyğun gəlmə forması. **səhih:** sif. [ər.] Düzgün, doğru, gerçək, əsaslı, yalan olmayan. Səhih məlumat. Səhih söz.

**SƏKR** – mənəvi sərxoşluq halıdır. Mənəvi ayıqlıq və ağıllılıq halı olan səhv halından fərqli olaraq səkr halında sufidə müvəqqəti olaraq özündən keçmə halı müşayiət olunur. Hətta bəzən sufi bu vəziyyətdə özündən asılı olmayaraq bəzi sözlər deyə bilər.

**SƏMA** – eşitmək, dinləmək deməkdir təsəvvüf terminlərindən biri olan səma şer və ilahilərə qulaq asmaq surəti ilə vəcdə gələrək bəzi hərəkətlər etmək, rəqs eləməkdir.

**SƏMA** – hədis elmində müəllimin, yaxud təriqət başçısı olan şeyxin öz müridlərinə hədis öyərtdiyi zaman, hədisləri öz yaddaşından, yaxud yazılı bir mənbədən rəvayət edərək oxuması və tələbələri də bu hədisləri yazmayaraq, eşitdikləri şəkildə rəvayət etmələrinə səma deyilir. Hədis təhsilində imla yolundan fərqli olaraq səma yolu daha qədim olsa da etibarlılığı baxımından daha zəyifdir. Bu səbəbdən hədis tənqidçiləri səma yolu ilə rəvayət edən raviləri araşdırmış, onları şəxsiyyət baxımından tədqiq etmiş, yalançı hədislərin ortaya çıxmaması üçün ən xırda detallarına qədər araşdırmışlar.

**SƏNƏT** [alm. Kunst; fr.=ing. Art; lat. Ars; ər. فنّ] - yun. Tekhne ilə eyni mənalı yunan dilində tekhne kəlməsi, məqsədi bir

şey ortaya qoyma olan, yaratma olan, doğru bir plana görə istiqamətləndirilmiş bir davranış məqsədinə gəlir. Sənətin əsas növləri: memarlıq, rəsm, plastik sənətlər, musiqi, söz-yazı sənəti, teatr, kino və s.

**SƏNƏT fəlsəfəsi** [alm. Kunstphilosophie; fr. Philosophie del`art; ing. Philosophy of art; osm. tr. felsefe-i sanat] – sənəti, sənət incilərini və mənasını fəlsəfi yöndən problem kimi qarşısına qoyan fəlsəfi təlim. Estetikadan fərqi odur ki, sənət fəlsəfəsi daha geniş miqyaslıdır.

**SƏBƏBİYYƏT** [ər. شببية] –biri [səbəb] digərinin [nəticə və ya təsir] şərti olan hadisələrin zəruri genetik əlaqəsini ifadə edən fəlsəfi kateqoriya.

**SKEPTİSİZM** [alm. Skeptizismus; fr. Scepticisme; ing. Scepticism; yun. Skeptesthal – gözləmək, incələmək; osm. tr. hisbaniye, reybiye; ər. ريبيّة] – dəqiq bir vəziyyətdə olmamaq, qərar verməmək, qərarsız davranmaq.

**SKOLASTİK** [scolastique]: Birsifət olaraq, xüsusilə ruhani məktəblərində və Avropa universitetlərində təxminən XIII-XVII – illər arası oxunan xristian fəlsəfəsinə verilən ad.

**SPEKÜLATİF** [speculatif] – Nəzəri olan: Təcrübə edilməsi mümkün olmayan şeylərlə əlaqəli olan.

**SOFİZM** [sophisme] – Mugalata, safsatacılık: Başqalarını aldatmaq ucun irəli sürülən, ilk baxışda doğru, lakin əslində doğru olmayan dəlil və ağıl iddiasıdır.

**SPİRİTÜALİZM** [spiritualisme] – Ruhçuluq - Tinselcilik: İnsanda onun orqanik quruluşundan ayrı mənəvi bir prinsipin yəni, ruhun öz-özünə bir gərçək olduğunu, maddəyə icra edil-

məyəcəyini, əksinə onun maddəyə hakim olduğunu qəbul edən doktrina.

**SUFLİ** ərz [ər. سفلي] – yerə Aydan fərqli olaraq sufli, yəni aşağı olan, alçaq.

**SUFLİ** aləm – Ay altı aləmdir. Ruhani varlıqlara görə aparılan bu bölgüyə görə, ay altı aləm maddi varlıqların yaşadıqları məkandır. Ay üstü aləm isə ruhani və mələki varlıqların olduğu məkandır.

**SƏBƏBİYYƏT** [ər. شببية] –biri [səbəb] digərinin [nəticə və ya təsir] şərti olan hadisələrin zəruri genetik əlaqəsiniifadə edən fəlsəfi kateqoriya.

**SİVİLİZASİYA** [lat. civilis – mülki, dövlət] – cəmiyyətin maddi və mənəvi nailiyyətlərinin məcmusu.

**SİENTİZM = sayəntizm** [alm. Scientismus; fr. Scientisme; osm. tr. ilimcilik; ər. علمية lat. scientia və ing. Science – bilik, elm] – elmlə bağlı olan dünyagörüşü yaxud da elmi düşüncənin təktərəfli dəyərləndirilməsinə deyilir. Mədəniyyət sistemində, cəmiyyətin ideya həyatında elmin rolunun mütləqləşdirilməsindən ibarət konsepsiya.

**SİYASƏT** [ər. سيأسة] –siniflər, millətlər və digər sosial qruplar arasındakı münasibətlərlə bağlı, əsas məqsədi dövlət hakimiyyətinin ələ keçirilməsindən, əldə saxlanılmasından və istifadə olunmasından ibarət fəaliyyət.

**SİLLOGİZM** [alm. Syllogismus; fr. Syllogisme; ing. Syllogism; yun. Syllogismos; osm. tr. Kıyas; ər. قياس] ortaq bir terminlə bir-birinə bağlanan iki prinsipdən [iki prinsipdə müştərək bir terminin ortaya çıxması ilə] çıxarılan nəticə. Verilmiş iki

təklifdən bu təkliflərin ehtiva etdiyini daxilində mövcud olan daha bir üçüncü prinsipi çıxarma prosesi.

**SİLLOGİSTİKA** – sillogistik əqli nəticə haqqında təlim. Aristotel tərəfindən formulə edilmiş tarixən birinci məntiqi deduksiya sistemidir.

**SİMVOL** [alm.=ing. Symbol; fr. Symbole; yun. Symbolon; osm. tr. remz; ər. **رمز**; tr. simge] – hər hansı bir insan təbəqəsinin uzlaşma yolu ilə özünə müəyyən bir məna verdiyi işarə. Yaxud da bir şeyi göstərən, bir mənanı bir düşüncəni müşahidə edilə bilən qılan işarə.

**SİMVOLİK** [alm. Symbolisch; fr. Symbolique; ing. Symbolic; osm. tr. remzi; ər. **رمزي**] – bir simvol ilə dilə gətirilən, simvollarla istifadə edən yaxud simvollar qoyan. **Simvolika** [alm. Symbolik; fr. Symbolique; ing. Symbolic] – simvolların istifadə edilməsi, işarələr elmi. Simvolların mənası haqqında təlim elmi.

**SİMPATİYA** [alm. = fr. Sympathie; ing. Sympathy; yun. Sympateia; osm. tr. tecazüp; tr. Duygudaşlık; ər. **تجأزب**]. 1. Birgə hiss etmə, nəyisə birgə yaşama, kiminsə hisslərini paylaşmaq; 2. Kiminsə kiməsə özündə birbaşa, vasitəsiz olaraq bir təmayül hiss etməsi, ona qarşı yüksək etimad hiss etməsi.

**SİNİF** [alm. Klasse; fr. Classe; ing. Class; lat. classis] – müəyyən müştərək əlamətləri olan tək-tək obyektlərin daxil olduğu.

**SİNİFLƏR** [ər. **سنف**] – tarixən müəyyən ictimai istehsal sistemində tutduqları mövqeyə görə, istehsal vasitələrinə olan [çox vaxt qanunlarda möhkəmləndirilib rəsmiləşdirilən] münasibətlərinə görə, ictimai əməyin təşkilindəki rollarına görə, deməli,

ictimai sərvətdən malik olduqları payı almaq üsuluna və bu payın miqdarına görə fərqlənən böyük insan qrupları.

**SİNİFLƏNDİRMƏ** [alm. Klassifikation; fr.=ing. Classification; əs.t. tasnif] – mövzuları və anlamları nizamlı olaraq təsnif etmə və sıraya düzmə. Dilimizdə daha çox təsnifat sözü işlədilir.

**SİNTEZ** [Alm. Synthese, sinthesis; fr. Synthese; ing. Synthesis; yun. Synthesis; osm. tr. terkip; ər. تركيب]. Nələrisə bir yerə cəm edib toplama, birləşdirmə, bir araya gətirmə. Müəyyən prinsiplərdən qaynaqlanaraq onların məntiqi nəticəsi olaraq digər prinsiplərə varma metoduna sintetik metod deyilir.

**SİNTETİK** [yun. Synthesis – birləşmə, uyğunlaşma] – təkliflərin [mülahizələrin] həqiqiliyinin müəyyənləşdirilməsinin müxtəlif üsullarını ifadə edən anlayışlar.

**SİNTOİZM** [yaponca sinto, hərfi mənası – allahların yolu] - ibtidai icma quruluşunda Yaponiyada meydana gəlmiş və öz inkişafında xeyli dəyişikliklərə uğramış din.

**SİRR** [alm. Mysterium, Geheimnis; fr. Mystère; ing. Mystery; yun. Mysterion; osm. tr. sırr; ər. سِرٌّ] – hisslərin xaricində olan, əqlin təbii seyrini tabe olmayan, varlığı və özü bizə qapalı olan, gizli-saxlı olan şey. Fövqəltəbii inamın həqiqətləri [əslində olmayan həqiqətlər].

**SİSTEM** [alm. System; fr. Systeme; ing. System; osm. tr. manzume, meslek, tr. Dizge; ər. منظومة yun. Systema – synestanai - birlikdə yerləşdirmək, bir yerə toplamaq. Cəm etmək. yun. System – bütöv, tam hissələrdən təşkil olunmuş, birləşdirilmiş] – öz aralarında müəyyən münasibətdə və əlaqədə olan, müəyyən bütövlük, vəhdət əmələ gətirən ünsürlərin məcmusu yaxud öz

daxilinə qapalı, sistemli formada olan tam. Bir ideyaya yaxud da dünyagörüşünə görə sistemlənmiş fikirlər, məlumatlar, təlimatlara da sistem deyilir. Bir-biri ilə əlaqəli, bağlı olan elmi yaxud fəl-səfi ideyalara və fikirlərə də sistem deyirlər.

**SİYASƏT** – "Siyasət" termini ilk dəfə qədim yunan mütə-fəkkiri Aristotel istifadə etmişdir. O, bu termini dövləti idarə etmək sənəti kimi müəyyən edirdi. Hələ qədim zamanlarda siyasət haqqında belə bir fikir formalaşmışdır ki, "onun haqqında hamı düşünə bilər, lakin onu yaratmaq seçmə insanlara məxsusdur". Müasir elmdə "siyasət" anlayışı hələ də birmənalı qəbul edilmir. Siyasi sistem – siyasi təsisatların, birliklərin və onlar arasında qarşılıqlı əlaqə formalarının məcmusu. Sosial siyasət insan üçün insani şərait yaratmaq deməkdir.

**SOSİALİZM** ideologiyasının kökləri çox qədim zaman-lardan müşahidə edilib. Az-çox sistemli şəkildə sosializm ideya-ları böyük utopistlər T.Mor və Kampanellanın, sonralar isə Sen-Simon, Furye və Ouenin əsərlərində şərh edilib. J.J.Russonun və F.Babyöfün da xidmətləri az olmayıb. Əsas ideya bərabər, ədalətli, xoşbəxt, istismarsız cəmiyyət qurmaqdır.

Stereotip – Sosial psixologiyadan stereotip anlayışı da qəbul edilmişdir (yunanca "stereos"-möhkəm, "tipos"-iz,şəkil). Bu anlayış etnoqrafiyada, etnik birlik daxilində nəsildən-nəslə keçirilərək saxlanılan, gündəlik həyat təcrübəsi ilə möhkəm-ləndirilən davranış normalarını xarakterizə edərkən işlədilir. Traybalizm – Müasir siyasi mətbuatdan etnoqrafiyaya traybalizm termini də keçmişdir (ingiliscə "trayb"- qəbilə deməkdir). Traybalizm gənc Asiya və Afrika dövlətlərində müasir dövrdə

qəbilə xüsusiyyətlərinin saxlanılmasına deyilir ki, bu qalıqlar qəbilələr arasındakı münasibətlərə mənfi təsir göstərir. Siyasi ədəbiyyatda traybalizm millətçiliyin sinonimi kimi işlədilir.

**SİVİLİZASİYA** [alm. Zivilisation; fr. Civilisation; ing. Civilization; lat. Civis – yurddaş, kəndçi; osm. tr. medeniyet; ər. ثقافة; tr. uygarlık] – barbarlıq halından çıxıb ənənələrə bağlı olaraq müəyyən bir yurd daxilində yaşamaq. Böyük bir cəmiyyətin bütün fəsillərində müştərək olan, dini, əxlaqi, etstetik, texnik və elmi xarakterdəki sosial hadisələrin bir bütünü.

**SIÇRAYIŞ** – predmetin və ya hadisənin əsaslı keyfiyyət dəyişməsi, kəmiyyət dəyişmələrinin nəticəsində köhnə keyfiyyətin yeni keyfiyyətə çevrilməsi [ Kəmiyyət dəyişmələrinin keyfiyyət dəyişmələrinə keçməsi qanunu].

**SKEPTİSİZM** [alm. Skeptizismus; fr. Scepticisme; ing. Scepticism; yun. Skeptesthai; yun. Skeptihos – nəzərdən keçirən, tədqiq edən, tənqid edən] – obyektiv gerçəkliyin dərki imkanını şüphə altına alan fəlsəfi konsepsiya. Dəqiq bir mövqedə olmamaq, qərarsız qalmaq, şübhələnmək, şübhə ilə yaxınlaşmaq.

**SOLİPSİZM** [lat. solus – tək, yeganə və ipse – özüm] – subyektiv idealist təlim. Təlimə görə ancaq insan və onun şüuru mövcuddur, obyektiv aləm isə, o cümlədən insanlar yalnız fərdin şüurunda mövcuddurlar.

**SONSUZ** [alm. Unendlich; fr. Infini; ing. Infinite; lat. Infinitus; osm. tr. namütenahi; ər. أبدي] – sonunun düşünülməsi çətin olan. Sərhədləri qoyulmayan, verilmiş olan hər böyüklükdən daha böyük olan.

**SORİT** [yun. Soros – topa, dəstə] - əvvəlki solligizmin nəticəsinin ondan sonra gələn sillogizmin müqəddimələrindən biri kimi çıxış etdiyi və bu halda müqəddimələrdən birinin aydın formada ifadə olunmadığı sillogizimlər zənciri.

**SOSİALİZM** [alm. Sozialismus; ing. Socialism; osm. tr. iştirakiyun mezhebi; ər. إشتراكيون fr. Socialisme, lat. socialis – ictimai] – ictimai iqtisadi formasiya. Geniş mənada insanların birlikdə yaşayışlarında sosial ədalətin təmin edilməsi üçün göstərdikləri hər növ fəaliyyət. Nəzəri mənada isə insana yaraşan bir həyat təmin etmək barəsində insanlaar və siniflər qarşısında cəmiyyətə üstünlük tanıyan görüşlər. İstehsal vasitələri üzərində ictimai mülkiyyətə əsaslanır.

**SOSİALLAŞMA** – fərd tərəfindən sosial-mədəni təcrübənin toplanılan və nəsildən nəslə verilən əmək vərdişlərinin, biliklərinin, normaların, dəyərlərin, ənənələrin mənimsənilməsi və daha da inkişaf etdirilməsi, fərdin ictimai münasibətlər sisteminə daxil olması və sosial keyfiyyətlərin formalaşması prosesi.

**SOSİAL FƏLSƏFƏ** [alm. Sozialphilosophie; fr. Philosophie sociale; ing. Social philosophy; osm. tr. cemiyet felsefesi; tr. Toplum felsefesi; ər. فلسفة ألجميّة] -

**Sosial Stereotip** – şüurda istər şəxsi həyati təcrübə əsasında və istərsə də müxtəlif informasiya mənbələrinin köməyilə əmələ gələn təsəvvürlərin sabit məcmusu.

**Sosial Stratifikasiya** – cəmiyyətin strukturu haqqında sosioloji nəzəriyyə. Nəzəriyyəyə görə cəmiyyət sosial təbəqələrə və ya stratlara [lay, pillə] bölünür.

**Sosial Struktur** – biliklər və onlar arasındakı məhsuldar qüvvələrin və istehsal münasibətlərinin inkişafının müvafiq səviyyəsi, ictimai əmək bölgüsü ilə şərtlənən sabit münasibətlərin məcmusu.

**SOSİOLOGİYA** [lat.societas – cəmiyyət və yun.logos – təlim, söz] – istər qlobal [bütövlükdə cəmiyyət] və istərsə də xüsusi sosial sistemlərin inkişafı və fəaliyyət qanunauyğunluqları haqqında elm.

**SOSİOBİOLOGİYA** – insan da daxil olmaqla bütün canlı varlıqların davranışının bioloji əsaslarının elmi tədqiqi ilə məşğul olan istiqamət, insanın həyat fəaliyyətində bioloji amillərin əhəmiyyətini şişirdən və ya mütləqləşdirən müasir sosial biologizmin növlərindən biri.

**SOFİZM** [yun. Sophisma – fənd, yalan, başsındırma] – ümumi qəbul olunmuş təsəvvürlərə zidd hər hansı cəfəngiyyatı, yaxud paradoksal müddəanı əsaslandıran mühakimə və ya nəticə.

**SOFİSTİKA** [yun. Sophistike – mübahisəni fəndgirliklə aparmaq bacarığı] – mübahisədə və ya sübutlarda səhv dəlillərin, sofizmlərin, yəni xarici, formal düzgünlüklə pərdələnmiş hər cür fəndlərin şüurlu tətbiqi.

**SOFİSTLƏR** [yun. Sophistes – mahir, aqil, müdrik adam] – "müdriklik" və "natiqlik" sahəsində peşəkar müəllimlər rolunda çıxış etmiş qədim yunan filosoflarını belə adlandırmışlar [e.ə. 5 əsr].

**SOLLİPSİZM** [alm. Sollipsismus; fr. Sollipsisme; ing. Solipsisç; lat. Solipsism; lat. Solus – yalnız, tək. Ipse - ben] – "Yalnız mən varam, məndən başqa hər şey ancaq mənim

ideyamdır" deyən obyektiv məni şüurlu mahiyyəti ilə birlikdə ancaq bir reallığı, yeganə varlıq olaraq qəbul edən fəlsəfi görüş.

**SPEKULYATİV Fəlsəfə** [lat. speculativus, lat. speculor – seyr edirəm, mübahisə edirəm] – biliyin qurulmasının, təşkilinin spekulyativ tipinə, yəni praktikaya müraciət etmədən refleksiyanın köməyi ilə yaradılmış fəlsəfi sistemlə**r.**

**SPİRİTUALİZM** [alm. Spiritualismus; fr. Spiritualisme; ing. Spiritualism; lat. Spiritus – ruh; ər. روحيّة; lat. spiritus – ruh] – bütün reallığın və həqiqətlərin əsasının ruhun təşkil etdiyini, hər bir gerçək olanın ruhi olduğunu və maddi olanın ancaq ruhi reallığın təzahürü olduğunu yaxud da saf bir ideyadan ibarət olduğunu irəli sürən metafizik təlim. Dünyanın mənəvi ilk əsası haqqında idealist təlim. Spiritualistlərin bəzilərinin nəzərində maddi aləm allahın və onun qabiliyyətlərinin təzahür üsuludur, digərlərinə görə insan şüurunun illuziyasıdır.

**SPONTANLIQ** [lat. spontaneus – öz-özünə baş verən] – öz-özünə baş verməklik; xarici təsirlərlə deyil, daxili səbəblər nəticəsində meydana gələn proseslərin xarakteristikasıdır; həmçinin özfəaliyyətdir, daxili meyllərin təsiri altında fəal təsir göstərmək qabiliyyəti, bacarığı.

**STOASİZM** [alm. Stoizismus; fr. Stoicisme; ing. Stoicism; osm. tr. revakiye] - əqlin hökmranlığını, təbiətə uyğun yaşamağı, ruhun sarsılmazlığını hissiyyatsızlığı və dünya yurddaşlığı ideyasını qayə olaraq qoyan Kipirli Zenonun fəlsəfi məktəbi.

**STOİKLƏR** – e.ə. IV əsrin sonunda Ellin mədəniyyəti zəmnində kosmopolit və fərdiyyətçilik ideyalarının və riyazi

biliklər əsasında texnikanın inkişafı ilə əlaqədər meydana gəlmiş fəlsəfi təlimin nümayəndələri.

**STRUKTUR** [os. Tr. Bünye; lat. struktura – quruluş; ər. بنية] – sistemin təşkilinin ünsürləri arasındakı sabit qarşılıqlı əlaqələrin, bu əlaqələrin qanunlarının vəhdəti kimi çıxış edən quruluşu və daxili forması.

**STRUKTURALİZM** [alm. Sturkturalismus; fr. Structuralisme; ing. Structuralism; lat. Structura – struktur, bünövrə] – Son illərdə xüsusilə də Fransada inkişaf edən, əsas bir həqiqət olaraq sturktura əsaslanan struktur üzərində qurulan elm qaydası. Obyektlərin strukturun aşkara çıxarılmasını elmi tədqiqatın vəzifəsi kimi irəli sürən konkret elmi-metodoloji istiqamət.

**SXOLASTİKA** [alm. Scholastik; fr. Scolastique; ing. Scholastic] – iman ilə elmi, kilsə təlimi ilə Aristotel fəlsəfəsini bir-birinə uyğun formada birləşdirməyə çalışan orta əsrlər fəlsəfəsi. **Sxolastika** tərəfdarları bir tezisdən çıxış edirlər ki, inam ağıldan üstündür. [yun. Scholasticos – məktəb, məktəbə aid] orta əsr "məktəb fəlsəfəsi". Sxolastlar xristianlıq dini etiqadını rasionallıqla əsaslandırmağa və sistemləşdirməyə çalışmışlar.

**SUBYEKT** [alm. Subjekt; fr. Sujet; ing. Sunject; lat. Subjectum; yun. Hypokeimenon; osm. tr. fail, mevzu; ər. جوهر] – Subyekt termini Aristotelə görə sonra da Orta əsrlərdə cövhər mənasında işlədilirdi. Bugünkü mənasında isə XVII əsrdən sonra işlədilir. Fəlsəfi kateqoriya. Subyekt anlayışı ilk əvvəl [məs., Aristoteldə] xassələrin, vəziyyətlərin, hərəkətlərin daşıyıcısını bildirmişdir və bu mənada substansiya anlayışı ilə eyniyyət təşkil etmişdir.

**SUBYEKTİV** – [alm. Subjektiv; fr. Subjektif; ing. Subjective; lat. Subjectivus; osm. tr. enfusi] – subyektlə bağlı olan, subyektdə əsaslandırıla bilən, subyektlə müəyyənləşmiş olan, subyektə bağlı olan. Antonimi obyektivdir.

**SUBLİMASİYA** [lat. sublimo – yüksəldirəm, ucaldıram] – enerjinin sosial cəhətdən əlverişli olmayan [aşağı] məqsədlərdən və obyektlərdən [yüksək, ülvi] məqsəd və obyektlərə keçirilməsi.

**SUBSTANSİYA** [alm. Substanz; fr.=ing. Substance; lat. Substancia; yun. Hypostasis, hypokeimenon – aşağıda olan; osm. tr. cevher; tr. Töz; ər. جوهرٌ; lat. substantia – mahiyyət] – bax: cövhər; özünün bütün formalarının, insan və onun şüuru da daxil olmaqla təbiət və tarix hadisələrinin daxili vəhdətində götürülmüş obyektiv reallıq və buna görə də elmi idrakın, konkretin nəzəri inikasının əsaslı kateqoriyası [Mücərrəd və konkret].

**SUBSTANSİALİZM** [alm. Tözçülük; fr. Substantialisme; ing. Substantializm; osm. tr. cevheriye; ər. جوهرية] – bir ya da çox substansiyanın varlığını qəbul edən təlimlər. Ruhun bir substansiyası olduğunu qəbul edən təlim.

**SUBSTRAT** [lat. sub – altında və stratum – tikinti, tikili, qurğu] – müxtəlif predmetlərin və ayrıca, təkcə predmetin, şeyin müxtəlif xassələrinin və onların məcmusunun vəhdətinin, eyniyyətinin əsası [bax həmçinin Substansiya].

**SÜBUT** [ثبوت] – Sübutun tezisi olan hər hansı fikrin həqiqiliyini [yaxud yalanlığını] əsaslandırmaq məqsədi daşıyan mühakimə. Kökü ərəbcədəki səbutə-dən [ثبت] götürülmüşdür.

**SÜNNƏ** [ər. سنة] – [ər. Adət, ənənə, qanun] – Məhəmməd Peyğəmbər və onun kəlamları haqqındakı hədisləri təşkil edən

“müqəddəs rəvayətlər” məcmusu, sünnilik məzhəbinə etiqad edən müsəlmanların müqəddəs kitabları.

**SÜNNİLİK** – islam dinində ən geniş yayılmış ortodoksal təriqət. VII-VIII əsrlərdə xilafət daxilində gedən dini-siyasi mübarizə şəraitində meydana gəlmiş, IX əsrdə tam formalaşmışdır.

## Ş

**ŞAMANİZM** – ibtidai-icma quruluşunda bəzi xalqlarda yaranmış erkən din. Şamanın [kamın] ruhlarla ünsiyyətinə inama əsaslanır.

**ŞAFİLİK** – sünni məzhəblərindən biri; banisi islam hüququnun dərin bilicisi, fakih və mühəddisi, Fələstinin Qəzzə şəhərində anadan olmuş Məhəmməd bin İdris əş-Şafildir.

**ŞEY** [alm. Ding; fr. Chose; ing. Thing; lat. Res, ens; ər. شيء] – hər hansı bir düşüncəni dilə gətirən naməlum termin. Həqiqi olan, şüurun xaricində öz başına var olan yeganə obyekt [ens reale]. Nesne-Obje: Ümumiyyətlə qarşımızda olan, şüurun özünə yönəldiyi, özünə yönəldilən, düşünülüb hazırlanan şey. Şey – maddi aləmin nisbi müstəqil mövcudluğa malik hissəsi. Bir şey o biri şeydən özünün keyfiyyət müəyyənliyi ilə fərqlənir.

**ŞEYXİLİK** – XIX əsrin birinci yarısında şiəlik əsasında yaranmış dini-siyasi cərəyan. Şeyx Əhməd Əhsai [1744-1827] yaratmışdır.

**ŞƏRAİT** [**شرائت**] – predmeti əhatə edən və predmetin onlarsız mövcud ola bilmədiyi xarici hadisələrə münasibətini ifadə edən fəlsəfi kateqoriya. Predmet özü şərtlənmiş bir şey kimi, şərait isə obyektiv aləmin predmet üçün nisbi xarici olan rəngarəngliyidir.

**ŞƏRƏF** [alm. Würde, menschenwürde; fr. Dignitè, humaine; ing. Dignity; dignitas; osm. tr. haysiyet; tr. Onur; ər. شرف] – insanın duyan, düşünən və azad bir varlıq olaraq özündə daşıdığı dəyər, insaniyyətinin dəyəri. Kant belə düşünürdü ki, şərəfli bir

varlıq olması səbəbilə insan heç bir zaman vasitə kimi istifadə edilməməlidir. Əxlaqi-şüur anlayışı və etik kateqoriya; məzmununa görə ləyaqət anlayışına oxşardır. Fərdin özünün-özünə və cəmiyyətin fərdə münasibətinin təzahür forması olan şərəf [eləcə də ləyaqət] insanın davranışının və başqalarının ona münasibətini münasib şəkildə tənzimləyir.

**ŞƏRİƏT** [ər. "yönəltmək" qanun vermək] – müsəlman qanunlarının sistemləşdirilmiş toplusu. Şəriətdə bütün qeyri-dini və dini problemlər islam baxımından işıqlandırılır; təsərrüfat həyatı, əxlaqi və etik normalar, adət, ənənə və bayramlar, qadağan olunmuş, bəyənilmiş, yaxud təqdirəlayiq hərəkətlər, hətta dindarın həyatının ən intim sahələrini də əhatə edən qayda və qanunlar islam dini baxımından vahid sistem şəklində birləşdirilmişdir.

**ŞƏRT** [alm. Bedingung; fr.=ing. Condition; lat. Conditio; osm. tr. şart; ər. شرت] – bir başqa şeyin özünə bağlı olduğu, bir başqa şeyi imkanlı qılan şey. **Şərtli imperativ** [alm. Hyporthotischer imperativ; fr. Impèratif hyporthètique]

**ŞƏXS** [ər. شخص; alm. Individium; fr. Individu; ing. Individual; lat. Individium; tr. Birey; osm. tr. şahıs, fert] mənası bölünməyən, parçalanmayan deməkdir. Latıncadakı devidere sözündən törəmişdir = a-tomon – bölünməyən, özlüyündə hissələrə ayrılmaz olan varlıq. Ümumiyyətlə götürdükdə isə hər var olan bir şəxs olduğu kimi, müstəqil olaraq hər hansı bir insan da bir şəxsdir. Azərbaycan dilində bu termin latın dilindəki ifadə variantından daha çox ərəbcədəki versiyası işlənir. Ərəbcədə bu sözün cəmi əşxas-dır [أشخاص]. Müşəxxəs, təşxis və s.kimi eyni kökdən olan bu qəbil sözlər də dilimizdə işlənməkdədir. Şəxsiyyət [شخصيّة] –

tarixən konkret fəaliyyət növləri və ictimai münasibətlər prosesində formalaşan sosial keyfiyyətlər aspektində götürülmüş insan fərdi.

**ŞOVİNİZM** [fr. Chauvinisme] – millətçiliyin ifrat, mürtəce formalarından biri. Başqa millət və xalqlara nifrət və ədavəti qızışdırmağa yönəldilmiş şovinizm siyasəti guya "ikinci dərəcəli" millət və irqlər üzərində hökmranlıq etməli olan bir millətin milli müstəsnalığını təbliğ edir.

**ŞÜUR** [alm. Bewusstsein; fr. Conscience; ing. Consciousness; lat. Conscientia; yun. Syn-eidesis = birlikdə bilmə; osm. tr. şüur; ər. شعور] – 1. Insanın özü, yaşadıqları və dünya haqqındakı məlumatı. Bundan başqa düşünmək və özünü tanımaq qabiliyyəti. Fəlsəfi ensiklopediyada qeyd olunur ki, şüur obyektiv gerçəkliyin yalnız insana xas yüksək formasıdır və insan tərəfindən obyektiv aləmin və öz xüsusi varlığının başa düşülməsində, dərk edilməsində fəal iştirak edən psixi proseslərin vəhdətindən ibarətdir. **Şüursuzluq** – Səbəbi şüura hələ gəlib çatmamış [məs. müdafiə reaksiyası və s.] həmçinin şüur təbii və ya süni olaraq dayandırıldıqda [yaxud, hipnoz altında, möhkəm sərxoş olduqda, lunatizm zamanında və s. hallarda] avtomatik, qeyri-ixtiyari baş verən fəaliyyət.

## T

**TABU** [polineziya dilində] Qeyri-normal gücə sahib olan bir nəsnə, insan və ya söz **tabu** syıla bilər.

İbtidai xalqlarda: əfsanəvi etiqadlara, mövhumi təsəvvürvə – zehniyyətlərə görə işlənməsi (dilə gətirilməsi) mütləq bədbəxtliyə səbəb olacaq və buna görə də söylənməsi qadağan olunmuş söz. Müasir dildə: senzura tərəfindən işlənməsi qadağan edilmiş söz, yaxud qaba, ədəbsiz sayıldığına görə işlənməsi qeyri-münasib hesab edilən söz.

**TALE** – insanların həyatında bütün hadisələri qabaqcadan müəyyən edən fövqəltəbii qüvvə haqqında dini-idealist təsəvvürü ifadə edən anlayış.

**TANRI** [alm. Gott; fr. Dieu; ing. God; lat. Deus; yun. Theos; osm. tr. Allah; ər. ألله] – Dini iman sistemində fövqəltəbii və fövqəladə xüsusiyyətləri, yetişkin bir əsas olaraq ən yüksək varlıq. **Tanrı haqqında elm –** [alm. Theologie; fr. Thèologie; ing. Theology; osm. tr. ilahiyat; ər. إلآهيّت] – ümumiyyətlə Tanrı və tanrılar haqqında, dini olan haqqında təlimlər. Konkret anlamda isə dini təfsirlərə əsaslanan Tanrı haqqında təlim. *Bax: Allah maddəsi.*

**TANTRİZM** – Qədim Hindistanın dini-fəlsəfi təlim. İlk əvvəl qadın allahlar ayini ilə və məhsuldarlığın təmin edilməsinə yönəldilmiş cadu mərasimləri ilə bağlı olmuşdur.

**TEİZM** [alm. Theismus; fr. Thèisme; ing. Theism; yun. Theos – Tanrı; osm. tr. ilahiye; ər. إآهيّة] – Bir Tanrıya iman gətirmək

**TELEOLOGİYA** [yun. Teleos – məqsəd, logos – təlim, söz] – aləmdə obyektiv, insan fövqündə duran məqsədlərin və məqsədəuyğunluğun mövcudluğu haqqında dini-fəlsəfi təlim.

**TEOQONİYA** [yun. Thheos – allah və goneia – anadan olma, doğulma] – allahların mənşəyi haqqında dini miflər sistemi; allahların şəcərəsi.

**TEODİSEYA** [yun. Theos – allah və dike – hüquq, ədalət] – Allaha haqq qazandırılması; nəyin hesabına olursa olsun qüdrətli, aqil və adil allaha etiqadla dünyada şər və ədalətsizliyin mövcudluğu arasındakı aşkar və barışmaz ziddiyyətə haqq qazandırmaq məqsədi güdən dini fəlsəfi traktatların adı.

**Teoloji etika** – hər hansı teoloji sistemə əsaslanan etika. Teoloji etikanın nüfuzlu-təsirli cərəyanları üç əsas dinin; xristianlığın, islamın, buddizmin etik təlimləridir.

**TEORİYA** [alm. Theorie; fr. Thèorie; ing. Theory; yun. Theoria, theorin – gözləmək, baxmaq; osm. tr. nazeriye] – faydalanmağı yaxud da tətbiq etməyi məqsəd güdən sırf bilik. Müəyyən həqiqətləri açıqlamaq, izah etmək yaxud da müəyyən etmə formasında ortaya çıxan, təcrübələri sınaqdan çıxmamış, yalnız düşüncə ilə qurulmuş əsaslar üzərində otuzduran, amma hadisələrə sahib olaraq yeni faktları tapıb ortaya çıxarmaq yolunu göstərən elmi təlim.

**TEOSOFİYA** [yun. Theos – allah və sophia – müdriklik, bilik; hərfən – allahın dərk edilməsi] – teologiya ilə [məs. "Areopagitiklərdə] və ya mistikanın dini etiqaddan kənar formaları ilə eyniləşdirilən anlayış.

**TEXNOKRATİYA** [ yun. Techne – sənət, peşə, kratos – hakimiyyət, dövlət] Müasir cəmiyyətlərdə hakim sinfə mənsub dövlət inhisarçı istehsalın yüksək rəhbərlərindən ibarət sosial təbəqə.

**TEİZM** [heisme] – Tanrıcılık: Aləmin səbəbi olan lakin, aləmdən ayrı olan bir Alahın varlığına inanan fəlsəfi doktriya.

**TEOLOGİYA** [alm. Teleologie; fr. Tèlèologie; ing. Teleology; osm. tr. mebhas-i gayat; ər. حيات مبحاث] – 1. Kainatı, bütün mövcudatı qayələrlə vasitələr arasında əlaqələr bütünü olaraq görən fəlsəfi təlim. 2. Ancaq insan fəaliyyətinin deyil, tarix və təbiət hadisələrinin də, tamamının olduğu kimi tək-tək hadisələrin də məqsədlərlə təyin edilmiş və istiqamətlənmiş olduğunu qəbul edən təlim.

**TEZİS** [alm. These, thesis; fr. Thèse; ing. Thesis; yun. Thesis] – ortaya qoyulan müddəa, hökmlər, qaydalar, önə sürülən prinsip.

**TƏBİƏT** [ər. طبيعط] – bax: **natura**. Azərbaycan dilində çox işlənən bu söz فعل [fə`ələ] modelində b [tabə`a] felinin فعيل [fə`iilun] modelində طبيع məsdərinin müənnəs [qadın cinsində] cinsdə ifadəsidir. Müənnəs cinsdə ətun [ةٌ] şəkilçisi artırılır. **Təbiət elmləri** [alm. Naturwissenschaften; fr. Sciences naturalies; osm. tr. tabii ilimler; tabiat ilimleri; ər. علوم طبيعة] – obyektivlik qaydasına əsaslanmaları, məntiqi quruluşları, dəyərləmə aparmayan ümumiləşdirici metodu ilə mədəni elmlərdən ayrılan, təbiəti tədqiq etməyə istiqamətlənmiş elmlərə deyilir. Təbiət elmləri: 1.Üstünə götürdüyü vəzifəsinə görə; sırf tətbiqi təbiət elmləri; 2.Metodlarına görə; riyazi və eksperimental araşdırmalar; 3.Mövzularına görə; canlı və cansız təbiətin elmləri. **Təbiət fəlsəfəsi = naturfəlsəfə** [alm. Naturphilosophie; fr. Philosophie

de la nature; osm. tr. tabiat felsefesi; ər. فلسفة ألطبيعة] – Təbiət üzərində: təbiətin özü, formaları və reallıqlarını tədqiq edən fəlsəfənin bir qolu.

**TƏCƏLLİ** [تجلي] – ortaya çıxmaq, görünmək, təzahür etmək. Təsəvüf istilahı olan təcəlli Allahın ilahi qüdrətinin hər şeydə ortaya çıxması, görünməsi deməkdir. Təbii ki, bunu görmək, sezmək və müşahidə etmək yalnız haqqın istəkli qullarına nəsib olur. Qeybdən gələn, qəlbdə zahir olan nurlara da haqqın təcəlisi deyilir. Təcəlli necə olduğunu yəni Onun mahiyyətini Tanrıdan başqa heç bir varlıq bilə bilməz. Təcəlli iki cürdür. Ruhani təcəlli – Tanrının hüdus sifəti ilə təzahür edən təcəllidir. Rəbbani təcəlli isə fani olan varlığın fəsad aləminə transfer etməsidir. Tanrının zati təcəllisi isə ilahi zatının təcəllisi deməkdir.

**TƏFSİR** [alm.=ing. – interpretasiya; fr. Interprètation; lat. Interpretare – izah etmək; ər. تفسير; tr. tefsir] – bir mətnin anlamı haqqında açıqlama.

**TƏHSİL** [alm. Erziehung; fr.=ing. Education; osm. tr. terbiye; tr. Eğitim; ər. ألتحصيل]. Ümumi mənada insanın qabiliyyətlərinin xüsusilədə əxlaqi vəsflərinin inkişaf etdirilməsi üçün yön və istiqamət verilməsi, metod öyrədilməsi, bilik və bacarığın aşılanması və bu sahədə aparılan şüurulu yaxud şüursuz bütün təsirlərə verilən addır. Məhdud anlamda isə insanın inkişafının sistemli, şüurlu olaraq istiqamətlədirilməsi və təsirlənməsi. **Təhsil elmi** [alm. Erziehungwissenschaft; fr. Science de l`education; osm. tr. ilm-i terbiye; ər. **علم آلتربية**; tr. Eğitimbilim.] Bilavasitə təhsili və onun əsaslarını, metodlarını, prosesini və istiqamətlərini tədqiq edən elm sahəsidir. Ümumiyyətlə, müəyyən bir sistem içərisində

şüurlu təhsilin elmi olan təhsil elmindən [pedaqogikadan] daha çox ehtivaedicidir.

**TƏKAMÜL** [alm. Enwicklung; evolution; fr. Evolution; ing. evolution ər. تكأمل; tr. Evrim] –geniş mənada varlıq və şüurun istər kəmiyyət və istərsə də keyfiyyət dəyişmələrini özündə birləşdirən dəyişmə kimi başa düşülür. [bu mənada Təkamül anlayışı məzmunca inkişaf anlayışına yaxındır].

**TƏKAMÜLÇÜLÜK** [alm. Evolutionismus; fr. Èvolutionisme; ing. Evolutionism; ər. تكاملية] –Təkamül nəzəriyyəsi. Hər şeyi, bütün yaradılışı təkamül baxımından dəyərləndirən dünyagörüşü.

**TƏKLİF** [alm. Satz; fr.=ing. Proposition; lat. Propositio; osm. tr. kaziye; ər. قآضية] – ittihamın sözlərlə dilə gəlməsi, doğru yaxud da yalnış ola bilən bir izah.

**TƏLƏBAT** [ər. طلبأت] –orqanizmin normal həyat fəaliyyəti üçün lazım olan zəruri tələblərin ödənilməsi ilə bağlı və bu ödənilmənin aradan qaldırılmasına yönəldilmiş vəziyyət.

**TƏƏSSÜRAT** [alm. Eindruck; fr.=ing. Impression; lat. Impressio; osm. tr. intiba] – vasitəsiz olaraq alınan şüur.

**TƏMAYÜL** [alm. Neigung; fr. = ing. Inclination; lat. Inclinatio; osm. tr. temayül]. Bir obyektə bir varlığa qarşı hiss edilən duyğuların təyin etdiyi vəziyyət. Hisslərin təsiri altında müəyyən bir məqsədə yönəlmə.

**TƏNQİD** [alm. Kritik; osm. tr. tenkit; ər. تنقيد; fr. Critique; ing. Critical; yun. Kritike[tekhne] ayırd etmək, qanun qarşısına çıxarmaq, tənqid etmək, günahlandırmaq]. Ümumi mənada kimisə, nəyisə, hər hansı bir mövzuda doğru və yaxud səhv tərəflərini araşdırıb ortaya çıxartmaq. Fəlsəfədə isə xüsusilə

biliyin əsaslarını və doğruluq dərəcəsini tədqiq edib araşdırmaq, sınamaq, günahlandırmaq. Kanta görə isə əqlin günahlandırılmasıdır. Ərəb dilində olan bu kəlmə fə`ələ فعل modelində nəqədə نقد felinin II babda fə`ələ فعَّل modelində nəqqədə نقَّد felinin məsdəridir.

**TƏRİF** [alm.=ing. Defintion; fr. Dèfinition; lat. Defintio; yun. Horos, horismos; osm. tr. tarif; ər. تعريف] – [definisiya] – bir anlamın yaxud da bir şeyin məhdudlaşdırılması, müəyyənləşməsi, anlamın ehtivasını təşkil edən təyinlərin göstərilməsi. Müəyyən obyektiv fərqləndirməyə, axtarıb tapmağa, təşkil etməyə, elmə yeni gətirilən terminin mənasını formulə etməyə və ya mövcud olan terminin mənasını dəqiqləşdirməyə imkan verən məntiqi üsul.

**TƏSADÜF** [alm. Zufail; fr. Hasard; ing. Chance, hazard; osm. tr. tesadüf; tr. Raslantı; ər. تصأدف] – gözlənilməyən, planda olmayan, əvvəlcədən proqnozlasşdırılması mümkün olmayan hal və hərəkətlər. **Təsadüfi** [alm. Akzidentell; fr. Accidental; ing. Accidental; osm. tr. arazi; ər. تصأدف] – dəyişən, rastlanmış olan, təsadüflə bağlı olan, özlə əlaqəsi olmayan.

**TƏSVİR** [Alm. Beschreibung; fr., ing. Description; lat. Descriptio; osm. tr. tasvir ər. تصوير] – tədqiqatın elmdə qəbul olunmuş müəyyən işarələr sisteminin köməyilə eksperimentin və ya müşahidənin məlumatlarının qeyd edilməsindən ibarət mərhələsi.

**TƏSƏVVÜR** [ər. Vorstellung; fr. Reprèsentation; ing. Representation; lat. Repreaesentio; osm. tr. tasavvur; tr. Tasarım; **ər**تصور] gerçəkliyin predmet və hadisələrinin predmet və hadisələrin özlərinin hiss orqanlarına bilavasitə təsiri olmadan da şüurda

saxlanılan və yenidən canlandırılan hissi-əyani, ümumiləşdirilmiş obrazı.

**TƏSƏVVUF** [ər. طصوف] –bax Sufilik.

**TƏFƏKKÜR** [alm. Denken; fr. Pensèe; ing. Thought; lat. Cogitare, cogitatio; yun. Noein, diaonoia; osm. tr. tefekkür, fikir; ər. تفكُّرٌ] yaxud düşünmə, fikrə dalmaq – obyektiv aləmin anlayışlarda, mühakimələrdə, nəzəriyələrdə və s. əks olunmasından ibarət, bu və ya digər məsələlərin həlli ilə bağlı fəal proses, xüsusi qaydada təşkil olunmuş materiyanın – beynin ən yüksək məhsulu. Təfəkkür insanı digər canlılardan fərqləndirən ən birinci xarakterik xüsusiyyətdir. İnsan bu qabiliyyəti vasitəsilə hər hansı bir şey haqqında mühakimə yürüdür, müqayisələr aparır, bir-birindən fərqləndirir, ayırır, bölür, bağlantı qurur və s. bütün bu proses şüurun məhsuludur. Təfəkkür kəlmə etibarı ilə dilimizə ərəbcədən keçmişdir.

**TƏXƏYYÜL** [tr. Imgelem; alm. Einbildungskraft; fr.=ing. Imagination; lat. Imaginatio; yun. Öhantasia; osm. tr. mühayyile; ər. تخيل] – bir obyekti, o obyekt qarşımızda olmadan proqramlaşdırmaq bacarığı. Gerçəklikdən alınmış təəssüratların yenidən dəyişdirilməsi əsasında insan şüurunda yeni hissi və ya fikri obrazlar yaratmaq qabiliyyəti.

**TƏHTƏLŞÜUR** [ər. تحت آلشعور] — müəyyən anda şüurun məna fəaliyyətinin mərkəzi olmasa da, şüurlu proseslərin gedişinə təsir göstərən fəal psixi proseslərin xarakteristikası. Ərəb dilindən hərfi mənada şüurun altındakı deməkdir.

**TƏCRÜBƏ** [ing. Experiment; fr. Expérience; ru. Опыт; ər. تجربة] –fəlsəfədə ənənəvi mənada xarici aləmin hissi empirik

inikası. Təcrübə hər cür biliyin yeganə məmbəyidir [Empirizm, Sensualizm]. Təcrübə, sınaq və türkiyə türkcəsindən yeni daxil olan deneyim kəlmələri dilimizdə demək olar ki, eynihüquqlu sözlərdir. Təcrübə sözünün fəlsəfi terminologiyada eksperiment kimi xarici ekvivalenti də mövcuddur.

**TƏQLİD** [alm. Nachahmung; fr.=ing. Imitation; lat. Imitatio; yun. Mimesis; osm. tr. taklit; ər. تقليد] – Nəyinsə, kiminsə roluna, obrazına girmək. Yaxud onun izindən getmək, özünü ona bənzətmək. Təqlid sadəcə bir kəsin xarakterik xüsusiyyətlərini və mimikasını deyil, eləcə də hansısa şəxsiyyətin yolunu, filosofun məktəbinin və ideyalarını davam etdirməyə də deyilir. Bu anlamda təqlid edən şəxs *müqəlləd* adlanır.

**TƏVİL** – xüsusi izah yoludur. İslam məzhəblərində və Şərq peripatetik fəlsəfəsində Quran ayələrini əqlin prinsiplərinə əsaslanaraq izah etməkdir. Təfsir və şərh anlamlarını da verir, yalnız bir xüsusiyyəti vardır ki, təvil adətən məhz Quran ayələri üçün işlədilir, təfsir və şərh isə hər hansı bir məsələ üçün işlədilə bilər.

**TƏŞƏKKÜL** [alm. Bildung; fr.=ing. Formation; osm. tr. oluşum; tr. Oluşum; ər. **تشكل**] – insan ruhu və fikrinin mədəni dəyərlərə böyük bir məna verərək qoşulacaq formada mənəvi inkişafı və formalaşması. şeylərin və hadisələrin öz-özünə dəyişməsini – onların digər şeylərə və hadisələrə fasiləsiz çevrilməsini ifadə edən fəlsəfi kateqoriya. Təşəkkül sözündən düzəlmiş *mütəşəkkil* sözü də dilimizdə işlənir. Təşəkkkül hərfi mənada əslində yaranmaq, ortaya çıxmaqdan daha çox təşkilatlanmaq kimi də başa düşülə bilər. Mütəşəkkil sözü də bu anlamda təşkilatlanmış kimi hərfi tərcümə olunur.

**TƏZAD** [alm. Gegansatz, opposition; fr.=ing. Opposition; lat. Oppositio; osm. tr. tezat, tekabül, mühalefet] – bir-birinin qarşısında olan, bir-birini qarşılıqlı olaraq bayıra atan iki kəlmə, yaxud da qərar arasındakı bağlantı. Təzadlar fəlsəfədə mühim hesab olunur. Təzad və ziddiyyətin dialektik materialimzdə inkişafın əsas qanunauyğunluqlarından hesab olunurdu.

**TOVHİD** [ər. توحيد] – [birləşdirmə, birləşmə, təkalllahlılıq, monteizm mənasındadır] – islam dinində allahın yeganəliyi və təkliyini [“La ilahə illəllah”] təbliğ edən dini-siyasi təlim. Tövhid islamın əsas şərtlərindən hesab olunur. Bəzən islama təkallahlı din kimi tövhid dini də deyirlər. Tövhid həm də bu dini qəbul etmənin əsasını təşkil edir, çünki onun ziddi Tanrıya şərik qoşmaqdır ki, bu da əsla qəbul olunmur və dindən çıxmış hesab olunur.

**TOMİZM** [alm. Thomismus; fr. Thomisme; ing. Thomizm tr. Thomasçilik] – katolik fəlsəfsində Foma Akvinalının əsaslandırdığı və onun ardıcıllarının əsaslandırdığı aparıcı cərəyan. Tomizm dominikan ordeninin müxtəlif məktəblərində məşhur idi. Tomizmə görə insan iradəsi ilə Tanrının əvvəldən təyinatını təbii-fövqəladə bir varlıq sistemi içərisində birləşdirən, əqlin üstünlüyünü istək və və iradə üzərindəki suverenliyini önə sürən bir təlimdir.

**TOTALİTARİZM** [lat. totalis – bütün, tam, bütöv] – avtoritar bürokratik dövlətin ictimai orqanizmin bütün həyat fəaliyyəti sahələrinə və ayrı-ayrı şəxsiyyətlərin həyatına hər şeyi əhatə edən despotik müdaxiləsilə səciyyələnən ictimai-siyasi quruluş.

**TOTEMİZM** [alm. Totemismus; fr. Totèmisme; ing. Totemism; tr. Totemcilik; “ototeman” sözündən olub Şimali Amerika

hindi tayfası olan ocivelərin dilində – onun tayfası, qəbiləsi deməkdir] – ibtidai cəmiyyətin ən erkən dini formalarından biri.

**TRANSSENDENTAL** [alm. Transzendental; fr.=ing. Transcendental; lat. Trancendere – aşmaq, üstündən ötüb keçmək; osm. tr. müteal; ər. متعال] – əqli tənqid etmə metodu.

**TRANSANDANS** [fr. Trancendence; tr. Aşkın ər. متاعل] – fövqəl olma: Görünüş və hadisələrin arxasında və üstündə davamlı olan cövhərlərin varlığına inanan görüş.

**TRANSSENDENT** [alm. Tranzsendent; fr. Transcendant; ing. Transcendent; osm. tr. müteal; ər. متعال lat. transcendere – üstündən adlayıb keçmək, pozmaq] – 1. Bir sistemin xaricinə yüksələn, var olan bir həddi keçən. 2. Üstün olan, bəşəri olanlardan yüksəkdə dayanan [Tanrı kimi]. 3. Kanta görə ola biləcək hər növ eksperimentin kənarına çıxan, şüurun xaricinə adlayan. 4. Təbiətdən kənarda olan və onun sərhədlərini aşan, fövqəlbəşəri olanlara deyilir. İmmanent termininin əksinə olaraq şüurun və idrakın hüdudlarından kənarda olanı ifadə edən termindir.

**TRADİSİONALİZM** [alm. Traditionalismus; fr. Traditionalisme; ing. Traditionalism; tr. Gelenekçilik; osm. tr. ananeviye; ər. عنعنوية] - ənənələrə ifrat dəyər vermə təmayülü, köhnəlmiş olana, vərdişlərə, köhnə inanclara yaxınlıq duyan həyat tutumu. XIX əsrdə Fransada katolik ruhaniləri maarifçiliyə qarşı inkişaf etdirdikləri, doğruluğun ənənəylə, xüsusilə kilsə ənənəylə bilinə biləcəyini önə sürən təlim.

**TRANSSENZUS** – subyektivdən obyektivə keçid, şüur sahəsindən obyektiv aləm sahəsinə insan praktikasının gedişində

həyata keçirilən, subyektiv idealistlər və aqnostiklər tərəfindən qadağan edilən, yol verilməyən çıxış.

**TRANSFORMASİYA** [alm. Transformationstheorie; deszendenztjeorie; transformisme; ing. Transformism; osm. tr. istihaliye; ər. إستخالية] yaşayan növlərin, sıf formalardan qarışıq formalara doğru kainatla inkişaf edərək ortaya çıxdığını önə sürən təlim.

**TRİADA** [yun. Trias – üçlük] inkişafın üçpilləliliyi. "Triada" anlayışını ilk dəfə Platon və neoplatoniklər [xüsusilə Prokl] işlətmişlər; alman klassik fəlsəfəsində, xüsusilə Hegeldə geniş inkişaf etdirilmişdir.

**TUTARLI** [alm. Konsequent; fr. Consèquent; ing. Consequent; lat. Consequens; osm. tr. insicamlı] – məntiq qaydalarına uyğun olan əqli əsas gətirmə. Əsaslı, yənin məsələnin bütün əsaslarını əhatə edəcək qədər ehtivalı arqument. Misal üçün *tutarlı dəlil*. **Tutarsız** [alm. Inkonsequent; fr. Inconsèquent; ing. Inconsequent; osm. tr. insicamsız] –düşünmədə məntiqi əksiklik, davranışlarında öz-özü ilə uyğunluq qurmaq. İki prinsip arasındakı əlaqədə ikinci birincinin sonuncu kimi göstərilir, halbuki həqiqətdə birincidən belə bir nəticə çıxarılmaz.

**U**

**UNİVERSAL** [alm.=ing. Universal; fr. Universel; lat. Universalis; osm. tr. külli; tr. Tümel; ər. كلّي] – müəyyən bir sinifə bağlı fərdlərin hamısını ehtiva edən. Bütün mühtəvası ilə alınmış olan prinsip. Bir prinsipin universallığını "bütün" yaxud da "hər" sözü ilə göstərilir. Ümumilik bir termin ehtivasını, küllilik prinsipində mövzunun bütün ehtivası ilə alındığını göstərir.

**UNİVERSALİLƏR** [lat. universalis – ümumi] – orta əsrlər fəlsəfəsində ümumi ideyaların adı. Ərəb dilli fəlsəfədə bu termin *küllilər* olaraq keçirdi.

**URUC** [ascention] – yüksəlmə, yüksəliş: Uruc, sudur ilə birlikdə hər şeyin Tanrıdan doğulduğunu və yenə ona qayıdacağını ifadə edən qavramdır.

**UTİLİTARİZM** [lat. utilitas – fayda] – davranışın faydalılığını onun əxlaqiliyinin meyarı kimi qəbul edən estetik nəzəriyyə.

**UTOPİYA** [yun. U – yox, və topos – yer, hərfən – "mövcud olmayan yer"] – uydurulmuş və çox vaxt stastik, durğun sosial idealın təcəssümü olan cəmiyyət.

**UYĞUNLAŞMA** [fr. Coincidence; ing. Coincidence; lat. Coincidenta; tr. Örtüşme; osm. tr. tetabuk; ər. تطآبق] – iki şeyin bir-biri ilə tam mənasında uyuşması, oxşar olması. Sözün kökü tabəqa [طبق]-dan gəlir. Uyğunlaşma hər hansı bir məfhuma aid ola bilər. Burada əsas olan subyektin insan olması deyil. İnsan, yaxud, hər hansı bir əşya düşdüyü mühitə, və ya nəyəsə uyğunlaşa bilər.

**UYDURMA** [alm. Fiktion; fr. Ing. Fiction; lat. Fictio; osm. tr. Tasni; ər. تصنيع] – Yalan, boş, həqiqəti olmayan. Həqiqətlə tərs düşdüyünü, həqiqətlə uyğun gəlmədiyini hazırlamaq.

**UYUM** [əs.tr.] – uyğunluq, münasiblik, oxşarlıq, bərabərlik, harmoniya, ahəngdarlıq və s.

**UZAY** [əs.tr.] – Fəza, göy boşluğu, uzanmış, genişlənmiş, geniş və s.

**UZDU** [əs.tr.] – Əzəli olan, əvvəli bilinməyən, çox əski, qədim.

## Ü

**ÜGE** – [Üyge] məşhur, tanınmış, ünlü və s.

**ÜLƏMA** (ər. علماء) – ərəbcədən tərcümədə “alimlər” deməkdir, müsəlman dünyasında istər dünyəvi elmlərlə məşğul olanlara, istərsə də dini elmlərlə məşğul olanlara verilən xüsusi ad. Üləma sözü indidə dilimizdə az hallarda işlədilməkdədir. Belə ki, üləma yaxud əllamə sözləri bəzi hallarda işlədilərkən ironi-kanlamlar da ehtiva edir. Orta əsrlərdə islam mədəni bölgəsinin bir hissəsi kimi, Azərbaycanda da mədrəsə üsulu tədris edilirdi və buranı bitirənlərə həm dini, həm də dünyəvi təhsil verilirdi.

**ÜLKÜ** [tr. idea, eng. idea] – ideal, hədəf. Ülkü bəzən olmasına inanılan şey mənasında da anılırdı. Bundan başqa prinsip, adət və hətta pay, ortaqlıq mənasını da verirdi.

**ÜMUMİ** [alm. Allgemein; fr. Gènèral; ing. General; lat. Generalis; tr. Genel; ər. عموم] – Cinslə, növlə bağlı olan, bir cinsin bütün növlərini daxilində toplayan, bir növün aid olduğu hər şeyi toplayan. Təkcədən ümumiyə, daha az ümumi bilikdən daha çox ümumi biliyə keçiddən ibarət məntiqi proses [məs., “istilik” anlayışlarından “enerji” anlayışına, Evklid həndəsəsindən Lobaçevski həndəsəsinə keçid], həmçinin bu prosesin nəticəsi: ümumiləşdirilmiş anlayış, mühakimə, elm qanunu, nəzəriyyə.

**ÜNSİYYƏT** (ing. Sociality; أنسيّة; ru. общительность) – subyektlərin səciyyəvi qarşılıqlı münasibətlər üsulu, digər insan-larla qarşılıqlı əlaqədə insanın mövcudluq üsulu. Ünsiyyət vasitə-silə insan sosiallaşır, həyata bağlanır, dostluqlar qurur, ətrafın-

dakılarla sosial kontakta girir və öz yaşayışını təmin edir. Ünsiyyət insanın bəşəri sosiallaşma ehtiyacıdır. İnsan təkbaşına var ola bilməz, o sosial bir varlıq olduğu üçün cəmiyyətin yaşam qanunları əsasında doğlulmalı, yaşamalı və ömrünü başa vurmalıdır.

**ÜNSÜR** [element]: Ümumiyyətlə mürəkkəb bir şeyin, ən sadə parçalarindan biri.

**ÜRÜNG** [əs.tr.] – mənəviyyət, mənəvi güc. Qədim oğuz dillərində təmiz, pak, qəlbən saf adamlara da deyilirdi.

**ÜSLUB** [ər.أصلوب; tr. teknik; ing. method] – bədii ifadəliliyin obrazlı sistminin, vasitə və üsullarının ideya-estetik və ictimai-tarixi məzmununun vəhdətindən asılı olaraq tarixən təşəkkül tapmış ümumiliyi.

**ÜSUL-İ CƏDİD** yeni üsul – Azərbaycanda 1920 - ci ilədək məktəb və mədrəsələrdə tətbiq edilən yeni tədris üsulu, mütərəqqi pedaqoji cərəyan. “Üsul” ərəbcədən tərcümədə qayda, metod, üsul; “cədid” isə yeni, təzə mənalarını verir.

**ÜZLƏT** [ər. عزلة, tr. inziva, uzlet] – inzivaya çəkilmə, asketizm. Sufilərin xəlvətə çəkilmələri, cəmiyyət həyatından uzaqlaşmalarıdır. Sufilər ruhi tərəflərini gücləndirmək, cəmiyyət həyatından uzaqlaşmaq, nəfsani şəhvət duyğu və hisslərini tərk etmək və mənəvi xəstəliklərdən arınaraq Tanrı dərgahına daha da yaxınlaşmaq arzusundadırlar.

**ÜZLÜNÇÜĞ** [əs.tr.] – fövqəladə, qeyri-təbii, yaxud qeyri-adi olan hal və hadisələrlə əlaqəfar işlədilirdi və əski türkcəyə aiddir.

## V

**VARLIQ** [alm. Sein; ètre; ing. Being; lat. Ens, esse; yun. To on, einai; əs.t. mevcudiyet; ər. وجود] - Şüurdan asılı olmayaraq mövcud olan obyektiv aləmin, materiyanı ifadə edən fəlsəfi anlayış. Fəlsəfənin əsas anlayışlarından biri, ilk dəfə Parmenid tərəfindən istifadə edilmişdir. Var olan şey, var olduğu söylənilən şey. Var olanın var olması. Aristoteldə var olanların varlığı mənasında işlənirdi. Yoxluğun əski. Qalıcı olan və müvəqqəti olmayan. Təzahürün qarşılığı olaraq reallıqda var olan. **Varlığın Analogiyası** [lat. analogiya, entis] – katolik fəlsəfəsində [Hetomizm, Sxolastikaoma, Tomizm, Foma Akvinalı] mərkəzi metodoloji anlayış. **Varlıq haqqında elm** [alm.= fr. – ontologie; ing. Ontology; lat. Ontologia; yun. On, entos – varlıq; osm. tr. mebhas-i vücut] – var olan olaraq var olan haqqında təlim. Var olanın varlığı və ümumiyyətlə varlıq ideyaları haqqında XVII əsrdən bəri istifadə edilən anlam. Mövzu olaraq yunan fəlsəfəsindən bəri və ələ alınan və Aristotelin "ilk fəlsəfə" adını verdiyi var olanların özü haqqında elm. *Mövcudiyyət* [alm. Dasein, existenz; fr.=ing. Existance; lat. Existentia; osm. tr. vücut, mevcudiyet; ər. موجوديةّ] – var olan, həqiqətə əsaslanan varlıq, bir şeyin nə olduğu, necə olduğu deyil, var olduğu faktı. Belə yaxud da belə bir forma almış hər növ xüsusiyyətlərin xaricində qalmaq, xasiyyətcə müəyyənləşməmiş sırf var olma faktı.

**VASİTƏ – (**ing. Mean; tr. Araç**)** vasitə sözünün anlamları çoxdur. Ərəb mənşəlidir. *Vəsət* sözündən törəmişdir. Cəmi isə

*vəsait* – dir. Fəlsəfi anlamda isə hər hansı bir məqsədə, mərama çatmaq üçün, yaxud fikir bəyan etmək üçün istifadə olunan və işin – prosesin gedişatına kömək edən müəyyən əlavələrdir. Vasitə sözü dilimizdə çox geniş işlədilməkdədir. **Vasitəsizlik**– sübutun köməyi olmadan alınmış bilik, həmişə nəinki təcrübənin məlumatları ilə, eyni zamanda məntiqi düşüncə ilə vasitələnən diskursiv və demonstrativ bilikdən fərqli olaraq həqiqətin bir başa seyri.

**VACİB** [واجب] – dəlil cəhətindən fərz qədər qəti olmayan, lakin yerinə yetirilməsi yenə vacib olan ibadətlərdir. Qurban kəsmək vacibdir, ancaq fərz deyil. Vacib sözü dində və fəlsəfədə xeyli anlamlar ifadə edir. Misal üçün, fəlsəfədə varlığın mümkün forması ilə birlikdə vacib formasından da sözhbət açılır, bununla belə dində də şəri hökmlər vacib yaxud fərz və ya müxtəlif ifadələrlə edilməsinin qətiliyi dərəcələrlə şərtləndirlir. Fəlsəfədə vacib varlığa *vacib əl-vücud* deyilir.

**VERBALİZM** [alm. Verbalismus; fr. Verbalisme; ing. Verbalism; lat. Verbum – söz, kəlmə; osm. tr. lafziye; ər. **لفظية**] – sözəbasma, sözlərlə oynama, Əsas məqsədi və məramı olmadan sözlər söyləmək. Yaxud da kiminsə bilmədiyi mövzuda boşuna sözlər söyləyib, çərənçilik etməsi. Latın mənşəlidir. Fəlsəfədə verballıq hər şeydən danışıb əsas məqsədin üzərinə gələ bilməməkdir.

**VƏRDİŞ** [fr. Habitude; alm. Gewohnheit; ing. Habit; yun. Heksis, əs.trk. itiyat; trk. alışkanlık] - Bir şeyə alışmış olma vəziyyəti, xasiyyət; daxili və xarici təsirlərlə hərəkət və davranışların təkrarlanılması, həmişə eyni şəkildə reallaşması

nəticəsində meydana çıxan, şərtlənmiş davranış halıdır. Bəzən asılılıq, düşkünlük, narkomanlıq kimi, yaxud yaxınlıq, yoldaşlıq, ünsiyyət kimi də xarakterizə olunur. Alışqanlıq, daxili, xarici təsirlərlə iş və davranışların yenilənməsi, həmişə eyni formada reallaşması gözlənilən, şəraitə uygunlaşmış davranış və ya təsir formaları. Bəzən vərdişlərinin məcmusu insanın xasiyyətini ortaya qoyur, onun haqqında təsəvvür formalaşdırır.

**VƏCD** [ing. Extase; ər. وجدٌ] – Cezbe-İstiğrak-Kendinden geçme: Allahla birləşmə duyğusu içində özündən keçmək. Vəcd – sufilərə məxsus haldır. Bu halda sufi Allahla "birləşdiyini" iddia edər. Bu halda sufi hiss və duyğu orqanlarını fəaliyyətini sanki hiss etmir. Bu vəziyyət onda uzun müddətli deyil, təkrar olunandır və şəxsidir. İrrasionalistlər vəcdi ilahi mənşəli ezoterik bilik növlərinə aid edirlər. Vəcd ruhi, mənəvi bir haldır. Ancaq təsvir ilə izah edilə bilər. Vəcd halında insanın mənliyi yoxdur. Hisslər aləmindən ayırlır. Hisslər, duyğu orqanları, nəzəri ağıl ortadan qalxmışdır. Xatirələr və iradə yox olar. Vəcd halında insan öz özünə sahib olar və onunla birlik qurar. Vəcd sırf eşqdən ibarətdir. Hər cür diqqət, nəfsə aid hər cür şüur müvəqqəti olaraq yox olur deyilə bilər.

**VƏHM** [وهمٌ] – insanın bir inancı və yaxud öz xəyalında qurduğu bir fikri, həqiqətə uyub-uymadığına əhəmiyyət vermədən israrla müdafiə etmək, yaxud var olmayan bir şeyi var olaraq qəbul etmək deməkdir. Vəhmin əsas qaynağı insanın öz nəfsidir. İslam dininiə görə isə insan vəhmdən mümkün olduğu qədər uzaq durmalıdır. Sufilər arasında da vəhmin bir müridin sülukuna böyük maneə olması görüşünün tərəfdarları əksəriyyət təşkil edir.

**VƏZİFƏ** [alm. Pflicht; fr. Devoir; ing. Duty; yun. Deon, katheteon; tr. görev; lat. Officium; osm. tr. Vazife; ər. **وضيفة**] – etməyə məcbur olduğumuz, etməmiz lazım olan şey, əxlaqi məsuliyyət olduğumuz şey. Vəzifələrə qarşı məcburiyyət hissi. Vəzifə insanın etməsini üzərinə götürdüyü hər hansı bir məsuliyyətdir. Vəzifə iki anlamda götürülə bilər: Hər hansı bir məmur pozisiyası, yaxud üstləndiyi məsuliyyət.

**VƏZİYYƏT** [alm. = fr. = ing. Situation; ər. وظية; tr. Durum; lat. Situs = məskunlaşmış olan, oturuşmuş olan] – ümumiyyətlə müəyyən bir zaman kəsiyində, müəyyən bir məkanda müəyyən bir ortamda olma. Bir insanın ətrafı ilə konkret əlaqəsi. Aristotel fəlsəfəsində on kateqoriyadan biri hesab olunurdu. Aristotelə görə insanın içində olduğu hala deyilirdi. Müasir baxımdan isə insanın müəyyən bir zamanda və yaxud məkanda konkret vəziyyətidir.

**VİTALİZM** [lat. vita – həyati; alm. Vitalismus; fr. Vitalisme; ing. Vitalism; osm. tr. hayatiye; tr. Dirimselcilik; ər. حياتية] Baş verənləri fiziki, kimyəvi baxımdan deyil, əksinə xüsusi bir həyatda qalma amalı, ideyası ilə açıqlayan fəlsəfi təlim. Bu görüş, bütün üzvi fəaliyyətlər əhatə edir. Vitalizm həm animizmə və xüsusilə ruh ilə bədən arasında vasitəçi bir güc qəbul etdiyi üçün Van Helmontun animizmi, digər tərəfdən isə vəhdətlə və ya bioloji monizmlə əlaqələnir. Çünki həyati qüvvət, nə mütləq ağla uyğun, nə də mütləq əbədidir; beləcə təbiətin digər gücləri ilə eyni dəyərdə sayıla bilər.

**VOLYUNTARİZM** [alm. Voluntarismus: fr. Voluntarisme; ing. Voluntarism; lat. Voluntas – iradə; lat. voluntas – iradə] – əqlə və biliyə deyil, əslində istəyə, iradəyə üstünlük verən,

mənəvi hadisələrin və bilik prosesinin əsasında əsas olaraq iradəni görən fəlsəfi təlim. İdealist fəlsəfənin xüsusi cərəyanı, iradəni bütün mövcudatın əsası hesab edir. Avqustin bütün ruhi qabiliyyətlərdə iradənin əsas olduğunu önə çəkir. Duns Skot isə belə hesab edirdi ki, istək təfəkkürdən üstündür.

**VULQAR MATERİALİZM** [lat. vulgaris – sadə, ali] – XIX əsrin ortalarında materializmin əsas prinsiplərini bayağılaşdıran və kobudlaşdıran fəlsəfi cərəyan. **Vulqar Sosiologizm** – ictimai hadisələrin ictimai inkişafın ayrı-ayrı amillərinin: texnikanın, istehsalın təşkil formalarının, iqtisadiyyatın, siyasətin, ideologiyanın rolunun birtərəfli şişirdilməsi yolu ilə tarixi materializmin təhrif edilən bayağı izahı.

## X

**XALQ** [fr. Peuple; ing. People; ru. народ; tr. Toplum; ər. شعبٌ] – adi mənada dövlətin, ölkənin əhalisi; elmi mənada isə insanların tarixən dəyişməkdə olan birliyi; bu birliyə əhalinin obyektiv vəziyyətinə görə müəyyən dövrdə müəyyən ölkənin mütərəqqi, inqilabi inkişafı vəzifələrinin həllində birlikdə iştirak etməyə qadir olan hissəsi, təbəqələri, sinifləri daxildir.

**XARAKTER** [alm. Charakter; fr. Caractère; ing. Character; yun. Kharakter – oyulmuş, cızılmış, qəliblə basılmış – kharassein – yarmaq, oymaq, cızmaq; osm. tr. seciye, hasisa] – bir obyektin, bir fərdin özünə xas strukturu; insanın sabit psixi xüsusiyyətlərinin məcmusu. Bu xüsusiyyətlər onun genetik xüsusiyyətlərindən asılıdır. Həyat şəraiti ilə əlaqədə və onun təsiri altında reallaşır. Xarakter insanın xasiyyətinin anlamını da verməkdədir. Bəzən isə hər iki məfhumu bir-birindən ayırırlar: misal üçün, *insanın xarakteri və xasiyyəti;* yaxud *insanın xarakterik xüsusiyyətləri.* Xarakter elə bir məfhumdur ki, o demək olar ki, insanın həm daxili dünyasını, həm də zahiri xüsusiyyətlərini özündə cəm edir və insan haqqında müəyyən təsəvvür yaradır.

**XASSƏ** [alm. Elgenschaft; fr. Propriètè; ing. Property, propriety, ownership; lat. Proprietas; osm. tr. hassa; tr. Özgü; ər. خاصّة] - predmetin digər predmetlərdən fərqini və ya oxşarlığını şərtləndirən və onlarla qarşılıqlı təsirdə təzahür edən tərəfi [məs., sahə, elastiklik, rəng, elektrikkeçirmə və s.]. Bax: ***xəvass***.

**XAOS** [alm.=fr.=ing. Chaos; yun. Khaos – uçurum, sonu görünməyən uçurum] – kainatın sistemə girməzdən əvvəlki formadan əvvəl kasıb, ahəngsiz və qarışıq vəziyyət, nizamsızlıq, anarxiya anlamlarına da gəlir. Xais hər hansı bir sistemdə mövcud ola bilər, o cümlədən sosial cəmiyyətdə. Bu zaman cəmiyyətə hakim kəsilən qüvvələr onu arxasınca başıpozuqluğa, anarxiyaya vəs.lərə yönəldir. Kainatın nizama girməzdən əvvəlki formadan məhrum, uyğunlaşmasız və qarışıq vəziyyəti. Qarışıqlıq, anarxiya

**XATİRƏ** [alm. Erinnerung, fr. Souvenir, memoire, ing. Remembrance, osm. tr. hatıra, . ər. خاترة] – Platon fəlsəfəsinin əsas mahiyyəti kimi, ruhun bədənə girməzdən əvvəlki varlığında gördüyü ideaların şüura çevrilməsi deməkdir. Platon fəlsəfəsində bu termin ruhi – mənəvi aydınlanma il eyni mənada işlənmir. Xatirələr insanın yaddaşına həkk olaraq zaman-zaman zehində canlanır və insan keçdiyi ömür yolunu varaqlayır. İnsanın yaddaşındakı xatirələr müxtəlif ola bilər; uşaqlıq xatirələri, məktəb xatirələri, tələbəlik xatirələri və s.

**XATIRLAMA** [alm. Anamnesis, fr. Reminiscence, ing. Reminiscence, yun. Anamnesis, osm. tr. nim-təhəttür] da insanın olub – keçən hal və hadisələri yenidən zehnində canlandırmasıdır və bunun vasitəsilə insan xatirələrini canlandıra bilir.

**XƏLVƏT** [ər. خلوة; ing. Hidden; tr. halvet] – tək qalmaq, insanın öz sevdiyi ilə kimsəsiz yerə çəkilmək. Lakin sufilər bu xəlvət halını öz şeyxlərinin icazəsi ilə nəzərdə tutulmuş müəyyən bir müddətə insanlardan uzaqlaşmaqla yerinə yetirirlər. Sufilərin xəlvətə çəkilməsində öz xüsusi məqsədləri olur. Sufilər insanlardan, o cümlədən cəmiyyət həyatından uzaq qalmaqla

qəlblərində yalnız Allah sevgisini saxlamaq, qəlbi pis arzu və istəklərdən təmizləmək, nəfsi zərərli düşüncələrin təsirindən, xəbis niyyətlərdən azad etməkdir. Xəlvətin daha ümumi mənası *üzlətdir*. Sufilərə xas olan çölə sözü də xəlvət sözü ilə təqribən eyni mənanı ifadə edir. Çilə sufilərin yaşadıqları bir hal və üsuldur. Bu üsulla sufi öz *xəlvətində* müəyyən olunmuş qaydada yaşayar, öz həyatını tənzimlər**.** Bu müddət sufilər üçün adətən qırx gün çəkir.

**XƏTA** [alm. Irrtum; fr. Erreur; ing. Error; lat. Error; osm. tr. Hata; خطاء] – yalnış olanı doğru olaraq qəbul etmək, yaxud da tərsi. Xəta günah sözü ilə bəzən eyni anlamlarda istifadə olunmuşdur. Dilimizdəki xətalı sözü bəzən *günahkar* deyimi mənasını da ifadə edir. Xətanın dilimizdə mənaları çoxdur: cinayət, günah, yaxşı düşünməməkdən, təcrübəsizlikdən, bacarıqsızlıqdan qaynaqlanan səhv, yanılma, qüsur. Misal üçün, xatalı adam mənasında *xətakar* sözü də işlənir.

**XƏVASS** [خواس] – xüsusi olanlar, yaxud seçilmişlər təbəqəsi, avam təbəqəsinin əksi olaraq işlədilir. Sufilərə görə, təsəvvüf məhz xəvassa aid lədünni elmdir. a) Xassə - Xass - xüsusiyyətlər Xaslar - keyfiyyət – hallar, b) Dindarlıq və doğruluğu ilə, elmilə amil olub mənəviyyat mərtəbəsində yüksəlməklə məqbul və mötəbər olan şəxslər – Zənginlər sinifi – Quranı və mənəvi sirlərə və xüsuslara bələd olan, elm, ibadət, itaət və təqva yolunda yüksələrək mümtaz olan Allahın övliyaları – Hər kəsin hörmət etdiyi böyük zəvat. Bax: *xüsusi*.

**XƏVATİR** [ing. memory; خواتر] – xatirələr. Təki [خاترة]. Qəlbə gələn düşüncələr. Ərəbcədən keçmə kəlimədir. Bax: **Xatirə**

**XİLİAZM** [yun. Chilias – min; ру. хилиазм] – Yer üzərində dünyanın sonundan əvvəl gələn minillik "Allah səltənəti" haqqında dini təlim. Xiliazm dini – fəlsəfi təlimində tanrının əzəli-əbədiliyindən bəhs olunur və Tanrının rəqibsiz iradəsindən asılı olaraq onun uzun müddətə hakimiyyəti təbliğ edilirdi.

**XOŞBƏXTLİK** [alm. Glück; fr. Bonheur; ing. Hapiness; osm. tr. Saadet; سعادة] – ümumiyyətlə insanların özlərinə ən yüksək missiya olaraq ortaya qoyduqları dəyər. Şüuru dolduran doyğunluq halı. Yaxud xoşbəxtlik hissi. Xoşbəxtlik məfhumunu insanın hissləri arasında zikr edən filosoflara görə, bu məfhum demək olar ki, bir anlıq hissləri ehtiva edirlər.

**XURAFAT** – (ər. **خرآفات**) hərfən; idraka zidd, qeyri-yənqidi, düşüncəsiz qavranılan nöqteyi-nəzər. İctimai və fərdi şüurun irrasional tərkib hissələri [dini mövhumat, yanlış fikir] Xurafat adlanır. Sovet dövründə Azərbaycanda, o cümlədən, bütün Sovet Sosialist Respublikaları İttifaqında hər növ dini ayinləri və ibadətləri, geriliyin qalıqları və xurafat adlandırır və geniş *allahsızlıq* təbliğatı aparırdılar.

**XÜRRƏMİLİK** – Abbasilər xilafətinə qarşı Azərbaycanda və qonşu ölkələrdə yaranmış təriqət. Ərəb mənbələri Xürrəmiliyin islama qədərki dövrdən mövcud olduğunu göstərərək məzdəkiliyi də ona aid edir. Azərbaycanda bu hərəkata Babək əl-Xürrəmidin başçılıq edirdi.

**XÜSUSİ** [alm. Besondere; fr. Spècial; ing. Special; osm. tr. hususi; ər. خصوصيٌّ; tr. özel] – ümumidən ayrı olan, hər hansı bir şeyə aid olan, ona xas olana deyilir. Ərəb dilindəki xassə [خصّ] şəddəli felinin [I babda] məsdəridir. Xüsusi sözü dilimizdə geniş

anlamlarda işlədilməkdədir. Bu sözün daha müasir olan və müasir türkcədən keçmə olan *özəl* sözü də hazırda istifadə olunur.

**XÜTBƏ** - orta əsrlərdə islam ölkələrində cümə, bayram və b. əlamətdar günlərdə məsciddə hökmdarın adına oxunan dua, hitq; hökmdarın tərəfindən, Quran ayələrindən, peyğəmbərin həyatından bəhs edən ibrətamiz hadisələrdən və s. ibarət olurdu.

## Y

**YADDAŞ** [alm. Gedatnis; fr. Mèmorie; ing. Memory; lat. Memoria, osm. tr. hafıza; ər. حافظة] - orqanizmin xarici aləm və öz daxili vəziyyəti haqqında informasiyanı sonradan həyat fəaliyyəti prosesində istifadə etmək üçün saxlamaq və yenidən canlandırmaq qabiliyyəti, yaxud müşahidələrin, qavranəlanların və.s.lərin saxlandığı yer. Yaddaş anlamında *hafizə* - yəni hifz edən, qoruyub saxlayan, tutub saxlayan kəlməsi də işləni. Yaddaş xatirələrin canlanmasına rəvac verən nöqtədir. Onun sayəsində kemişi xatırlayırıq, yaxud əqlin vasitəsilə öyrəndiklərimizi yada salırıq.

**YALAN** – şeylərin əsl vəziyətini təhrif edən fikir, mülahizə.

**YALNIŞ** [alm. Falsch; fr. Faux; ing. Wrong; lat. Falsus; osm. tr. hatalı] – doğru olmayan, formal düşünmə qaydalarına uyğun gəlməyən. Düşünülən şeylə uyğun gəlməyən.

**YANILMA** – gerçəkliyin illuziyalı dərk edilməsi; hər bir mövcud anda ictimai-tarixi praktikanın məhdudluğu ilə şərtlənir.

**YARADICILIQ** – insan fəaliyyətinin keyfiyyətcə yeni maddi və mənəvi sərvətlər yaradan prosesi. Yaradıcılıq sayəsində insan özünün əqli qabiliyyətlərini, mənəvi keyfiyyətlərini ortaya qoyur. Yaradıcılıq elə bir məfhumdur ki, onunla şairin, ədibin, yaxud elm adamının bütün əsərlərini, çalışmalarını ehtiva etmək olur.

**YAZGAN** – Yazan, yazıcı, taleyi, qədəri təyin edən. Əski zamanlarda, qədim oğuzlarda Tanrının ad ve sifətlərindən hesab olunurdu.

**YAZGI** – 1- Yazı, qədər, müqəddərat, alın yazısı 2- Tanrısal, ilahi. Daha çox *yazı* kimi dilimizdə işlənir. Misal üçün; *Tanrıdan yazısı belə imiş.*

**YAŞUK** – işıq, şua, fövqəl, aşmış.

**YAŞAM** – həyat, ömür, dirilik. Misal üçün, *yaşamını bitirmək.*

**YASUT** – [yasıt] şərəf, ləyaqət, heysiyyət. Müasir dilimizdə demək olar ki, işlənmir.

**YASA** – [Yasağ, yasak] Yasa, kanun, nizam, qaidə, yasaq

**YAMAN** – 1- Müthiş, dehşetli, etki ve beceri bakımından fövqəladə 2- pis, fəna, üzücü. Misal üçün, *o kəs yaman adam idi*, yəni üstün məziyyətlərə sahib idi. Və yaxud; *yaman işə düşdüm,* yəni çıxılmaz vəziyyətə düşdüm.

**YAKARI** – Dua, təmənni, yalvarış, dilək. Bəzən dilimizdə yalvarmaq, yaxarmaq sözü də işlənir ki, mənşəcə türk mənşəlidir, yakarmak kəlimәsindən törəmişdir.

**YAXŞI** [alm. Gut; fr. Bien; ing. Good; lat. Bonus; yun. Agathos; osm. tr. hayır; ər. خيرٌ] – geniş mənada işə yarayan, özünə uyğun, doğru görülmüş, təbiətinə uyğun, istənməyə dəyərli olan. Əxlaqın və əxlaq fəlsəfəsinin əsas termini. Din fəlsəfəsində Tanrıya aid edilən *Mütləq Yaxşı* məfhumu da mövcuddur.

**YƏQİN** [alm. Gewissheit; fr. Certitude; ing. Certainty, certitudo; osm. tr. yakin, mevsukiyet; ər. أليقين] – hər hansı bir informasiyanın, bir qənaətin şübhəyə salmadan təsdiq etməsi halı. Bu mənada düşüncənin heç bir yanılma qayğısı olmadan bir qənaətə qatılması halı. Misal üçün nə barəsində isə *yəqinlik hasil olmaq və s.*

**YƏQİN** - **elm əl-yəqin** - ağıl və nəqlin, nəzər və xəbərin ifadə etdiyi biliyə deyilir. **eyn əl-yəqin** – hissin, xarici təcrübə və müşahidənin verdiyi bilikdir. İlmel yaxın demək; Quran ayələrinin bir-birləriylə olan illiyet rabitələrini idrak edərək, ayələrlə ayrı-ayrı açıqlanan mövzuları istifadə edilən sözlər işığında (təqva, dəlalət, hidayət, nəbi, rəsul, əhd, və s.) ayələri bir araya gətirərək mövzuları anlamaq, dərk etmək və izah edə bilmək kafiliyi qazanmaq deməkdir.

*Eyn əl yəqin* göz "səviyyəsində yaxın ürək gözü ilə görərək və qəlb qulağı ilə eşidərək Allaha və verdiyi elmlərə yəqinlik hasil etmək deməkdir.

*Haqq əl-yəqin* Ülu-l əlbab, lübblerin sahibləri "Sirr Xəzinələrinin, özün özünün, hikmətin, tam nura çatmış nəfs ürəyinin sahibləri" deməkdir. *Haqq əl-yəqinlik* dərəcəsi isə ən son mərtəbədir.

**YƏD** [يدٌ] **-** əl, qol. Ərəbcə bir kəlmədir. Dini fəlsəfi ədəbiyyatda bəzən zor güc, qüvvət kimi də verilir. *Yəd-i beyza* isə dini qissələrdə Musa Peyğəmbərin möcüzə kimi göstərdiyi parlaq əlinin adıdır.

**YƏS** [يأسٌ] – ərəbcədən keçmədir. Uğursuzluq, məyusluq anlamındadır. Dilimizdə işlədilən –ölən insanın ölümü üçün qeyd edilən mərasimi ifadə edən yas kəliməsi də buradan götürülmüşdür.

**YETKİ** [əs.tr.] – üzərinə götürülən məsuliyyət, məharət, işi başa çatdıra bilmək qabiliyyəti deməkdir. Bəzən vəzifə səlahiyyətlərinin sərhəddləri, izn, icazə mənasını da verir. Misal üçün; *Sənin bu işi görməyə yetkin varmı?*

**YETİ** [əs.tr.] – qabiliyyət, bacarıq. Yetkin, kamil, olgun, bacarıqlı. Dilimizdə işlənən *yetişkin* sözünün insanın uşaqlıq çağından sonrakı qabiliyyətlərini və bacarıqlarını nümayiş etdirdiyi bir dövrə qədəm qoymağını bildirdiyi üçün adlandırılmışdır.

**YESUKEN** [əs.tr.] – [Yasuga, yasag, yasa] Yasa, yasaq, qadağan olunmuş.

**YIĞINAK** [əs.tr.] – Toplum, kütlə. Sözün kökündə işlənən anlamda indidə söz və ifadələr mövcuddur. Misal üçün, *Nə yığışıbsınız buraya?* cümləsində olduğu kimi.

**YIĞINCAQ** [əs.tr.] – ümumi, sosial qayda, toplumun mənimsəyib tətbiq etdiyi qanunla

**YESUKEN** [əs.tr.] – [Yasuga, yasag, yasa] Yasa, yasaq, qadağan olunmuş.

**YIRGA** [əs.tr.] – məsud, xoşbəxtlik dolu.

**YIRTINÇÜ** [əs.tr.] – Dünya, kainat.

**YISUN** [əs.tr.] – [yasun, yosun] Doğa, təbiət, yaşıllıq.

**YONAT** [əs.tr.] – Tam, əksiksiz, qüsursuz.

**YÖNDƏM** [əs.tr.] – [Yöntəm] Üsul, tərz, təamül, töreye, adət-ənənələrə uygun formada olan.

**YONAT** [əs.tr.] – Tam, əksiksiz, qüsursuz.

**YUVANÇ** [əs.tr.] – təsəlli, ümid

**YUMLU** [əs.tr.] – xoşbəxt, müqəddəs, mübarək, huzurlu.

**YUMUŞ** [əs.tr.] – [Yumuç] 1- Söz, öyüd, nəsihət 2- Əmir, fərman, buyruq 3- Müjdə, müjdəli xəbər 4- Yumuq, yumulmuş, yumruq.

**YÜKNÜ** [əs.tr.] – Secde, səcdədə olan, ibadət əsnasında olan.

**YÜĞNÜK** [əs.tr.] – əməli saleh, təmiz

## Z

**ZAMAN** [alm. Zeit; fr. Temps; ing. Time; lat. Tempus; yun. Khronos; ər. زمان] – fəlsəfə termini olaraq zaman olub, keçən, dəyişmə və müddətlilik forması. Ərəbcədən gəlmədir. Kök hərfləri zəmənə [زمن] dir. Zəmanə sözü də buradan qaynaqlanır. Zəmanə sözü zaman sözünün qadın cinsindəki halıdır. Qayıdışı olmayan bir istiqamətdə bir-biri ardından getmə. Zaman sürüb gedən doğru bir xətt olaraq düşünülə bilər. Obyektiv zaman ölçülə bilən, ama öz-özünə deyil, cisimlərin dəyişkənliyi ilə ölçülə bilər.

**ZƏRDÜŞTİLİK –** Azərbaycan, İran, Orta Asiya, Əfqanıstan və Ön Asiyanın bir sıra digər vilayətlərində yayılmış qədim dövr erkən orta əsrlərinin ən mühüm dinlərindən biri.

**ZƏRURİYYƏT** [ər. ضرورية]– prosesin əsasında bunun ayrı-ayrı formalarının münasibətini ifadə edən fəlsəfi kateqoriyalar.

**ZƏLALƏT** [ضلالة] – doğru yoldan yəni hidayət yolundan uzaqlaşmaq, yoldan azmaq deməkdir.

**ZİDD** [alm. Kontradiktorisch; üiderprechend; fr. Contracictoire; ing. Contradictory; lat. Contradictorius; osm. tr. mütenakız; ər. متنقاض] – Aralarında kəsişmələrin ortaya çıxması, birinin digərini inkar etməsi, misal üçün ağ – qara, işıq – qaranlıq və s. zidd kəlməsi ərəbcədən bizim dilimizə transfer etmişdir. Ərəbcədəki ضَضّ şəddəli felinin məsdəridir.

**ZİDDİYYƏT** [tr. Karşıtlık; alm. Gagensatz, fr. Contrariètè; lat. Contrarietas; osm. tr. tezat, zıddıyet; ər. ضضية ] – hər bir inkişafın, hərəkətin daxili mənbəyini ifadə edən kateqoriya.

**ZİKİR** [ذكر] – hərfi mənada xatırlamaq, yadda saxlamaq deməkdir. Kökü ərəbcədəki zəkərə [ذكر] felindən gəlir. Sufi zikir edərək daima Allahı yadda saxlayar və bunun üçün dili ilə Allahı xatırladan sözlər, ifadələr deyər. Sufi nəzdində ibadətlər də zikir sayılır. Namaz, oruc, zəkat kimi ibadətlər zikir xüsusiyyəti daşıyaraq sufiyə Allahı xatırlamağa imkan verir, yadından çıxarmağa qoymur.

## İstifadə olunan ədəbiyyat siyahısı


1. Aksan, Doğan,"Her Yönüyle Dil", Türk Dil Kurumu Yayınları 439 s. Ankara,1990
2. An etymological dictionary of pre-thirteenth – century turkish. Sir Gerard Clauson. Oxford. At the Clarendon Press. 1972. 1034 s.
3. Arapça – türkçe sözlük. S. Mutçalı. Dağarcık yayın. İstanbul. 2001. 1023 s.
4. Alkhuli A. Muhammad. "A dictionary of İslamic terms; English – arabic and arabic - english".
5. Azərbaycan ədəbi dilində işlənən ərəb və fars sözlərinin qısa lüğəti. Red. C.F. Bağırov. Azərbaycan Dövlət Universiteti nəşriyyatı. Bakı 1960. 211 s. Felsefe ve dil. Vitqenşteyn üzerine bir araştırma. Ö.Naci. İstanbul. Kabalçı yayınları. 1995. 591 s.
6. Ingiliscə - Azərbaycanca lüğət. English - Azerbaijani Dictionary.Tərtibçilər V. S. Ərəbov, Ş.B. Məmmədova, l. B. Süleymanova."KM" mətbəəsi. Adiloğlu MMC. Bakı 2012. 1360 s.
7. "Fəlsəfə ensiklopedik lüğəti", Redak.Şur. Sədr: İ.Rüstəmov, "Azərbaycan Eniklopediyası" Nəşriyyat – Poliqrafiya Birliyi, 1997, səh.s.517
8. Dilçilik ensiklopediyası. 2 cilddə. Red. F. Y. Veysəlli. Bakı. Mütəlcim nəşriyyatı .2006.525 s.514 s.
9. Dil felsefesi sözlüğü. Atakan altıntörs. Paradiqma. Istanbul. Kasım 2000. 108 s.

10. Dictionary of islamic terms. English – arabic and arabic english. Mohammad Ali Alkhuli. Oxford. 68 s.

11. Древнетюрских словарь. В.М. Наделяев, Насилов Д.М. Ленинград 1969.

12. Farsca- Azərbaycanca lüfət. Red. M. Nağısoylu. Şərq-Qərb nəş. Bakı.2007. 635 s.

13. Məntiqi Terminlərin İzahı lüğəti. M. M. Israfilov. Elmi Red. A. İ. Tağıyev. Bakı. MBM.2007. 352s.

14. Farsca-Azərbaycanca lüğət.Tərtibçi Nəyyerzaman səqəfi. Naşer nəşriyyatı 1999. 2 cilddə 1038 s. 1105s Ingiliscə - Azərbaycanca lüğət. English - Azerbaijani Dictionary.Tərtibçilər V. S. Ərəbov, Ş.B. Məmmədova, l. B. Süleymanova.”KM” mətbəəsi. Adiloğlu MMC. Bakı 2012. 1360 s.

15. Dilçilik ensiklopediyası. 2 cilddə. Red. F. Y. Veysəlli. Bakı. Mütəlcim nəşriyyatı .2006.525 s.514 s.

16. Məntiqi Terminlərin İzahı lüğəti. M. M. Israfilov. Elmi Red. A. İ. Tağıyev. Bakı. MBM.2007. 352s.

17. Словарь иностранных слов. Подь. Редакцией. И.В. Лейхина, Ф.Н. Петова. Москва. ГИИНС 854 s.

18. Farsca-Azərbaycanca lüğət. II cilddə. Tərtibçi Nəyyerzaman səqəfi..Naşer nəşriyyatı. 1999. 1035 s.

19. Felsefe terimleri sözlüğü. Türk Dil Kurumu Yayınları. B.Akarsu. Ankara Universiteti Basımevi. Ankara. 1975. 236 s.

20. Türkçe etimoloji sözlük. Həsən bəy Hadi. 2010. 9944 s. Təbriz.

21. Osmanlı Türkcesi Sözlüğü. Mehmet Kınar. İstanbul. S. 536

22. Türk dillerinde akrabalık adları. Yonq – Sonq Li. Simurq. Ankara. 1999. 108 s.

23. Kutadgu bilig. Arat R.R. Türk Dil kurumu yayınları. Ankara. 1979. 458 s. ki türk yazıtları

24. Orkun Es. H.N. TDK yayınları. 529. Ankara 1986. 546 s.

25. Ümumi dilçilik. A.Axundov. Şərq-Qərb. Bakı 2006. 280 s.

26. Tasavvuf terimleri sözlüğü. E. Cebecioğlu. Basımevi. Ankara. 1975. 236 s.

27. Həsənov Həsrət. Azərbaycan dilinin antonimlər lüğəti. Bakı, "Şərq-Qərb", 2007.

28. Həsənov Həsrət. Azərbaycan dilinin omonimlər lüğəti. Bakı, "Şərq-Qərb", 2007.

29. Manafoğlu Rafiq, Tağısoy Nizami, Rüstəm Kamal. İzahlı tərcüməşünaslıq terminləri lüğəti. - Bakı, Mütərcim, 2010.

30. Nadir Məmmədli. Çağdaş türk ədəbi dilinin izahlı omonimlər sözlüyü (1995).

31. Nadir Məmmədli. Adını mən verdim, yaşını Allah versin (türk şəxs adları lüğəti) (1995).

32. Nəriman Seyidəliyev. Azərbaycan Milli Elmlər Akademiyası İmadəddin Nəsimi adına Dilçilik İnstitutu Səməd Vurğunun bədii dilinin izahlı lüğəti. - Bakı, 2011.

33. Nəriman Seyidəliyev. Dini terminlər lüğəti. Bakı, 1996. —

34. Nəriman Seyidəliyev, Qurbanova T. Sinonimlər lüğəti. Bakı, 2003. — 328 səh.

35. Nəriman Seyidəliyev. Frazeologiya lüğəti. Bakı, "Çıraq", 2004. — 272 səh.

36. Nəriman Seyidəliyev, Məşədiyev Q. İzahlı onomastik terminlər lüğəti. Bakı, 2005. — 120 səh.

37. Nəriman Seyidəliyev, Abdullayev S., Əhmədov B. İxtisarlar lüğəti. Bakı, 2005. — 204 s.

38. Nəriman Seyidəliyev. Azərbaycan dilinin sinonimlər lüğəti. Bakı, "Şərq-qərb", 2007. —477 səh.

39. Orucov Ə., Axundov A., Bəhruz Abdullayev, Nərgiz Rəhimzadə. Azərbaycan dilinin izahlı lüğəti: online, endirmə: I cild, II cild, III cild, IV cild. - Bakı: Şərq-Qərb, 2006.

40. Paşayev A., Bəşirova A.Azərbaycan şəxs adlarının izahlı lüğəti. Bakı: "Mütərcim", 2011.

41. Philosophical terminology in arabic and persian. Sohell M. Afnan. Leiden E.J.Brill. 1964. 124 s.

42. Türk dili etimoloji sözlüğü. Hasan Eren. Ankara, 1999, 512 s.

43. Türk Dil Kurumu. Büyük Türkce Sözlük (online).

44. Türk Dil Kurumu. Kaşgarlı Mahmut - Dîvânu Lugâti't-Türk Veri Tabanı (online).

45. Türk Dil Kurumu. XIII yüzyıldan beri Türkiye Türkçesiyle yazılmış kitaplardan toplanan tanıklarıyla tarama Sözlüğü (online).

46. Türk Dil Kurumu. Güncel Türkce Sözlük (online).

47. Türk Dil Kurumu. Sesli Türkce Sözlük (online).

48. Türk Dil Kurumu. Kişi Adları Sözlüğü (online).

49. Türk Dil Kurumu. Türk Dilleri Sözlüğü (online).

50. Türk Dil Kurumu. Türkçede Batı Kökenli Kelimeler Sözlüğü (online).

51. Türk Dil Kurumu. Türkiye Türkçesi Ağızları Sözlüğü'nde Söz Arama (online).

52. Türk Dil Kurumu. Atasözleri ve Deyimler Sözlüğü (online).

53. Türk Dil Kurumu. Zıt Anlamlı Kelimeler Sözlüğü (online).

54. Türk Dil Kurumu. Türk İşaret Dili Sözlüğü (online).

55. Türk Dil Kurumu. Büyük Türkce Sözlük (online).

56. Veysəlli F.. Dilçilik ensiklopediyası: I cild. Bakı: Mütərcim, 2006: I cild, II cild.

